FAİQ HƏSƏNOV

# QARAQOYUNLU, GÖYÇƏ, BORÇALI VƏ MƏN

Bakı - 2004

# MÜƏLLİFDƏN

***Böyük Türk dünyasının bir hissəsi olan Qərbi Azərbaycan elləri bədnam qonşumuz rusların fitvası və bilavasitə köməyi ilə tarixi düşmənimiz olan ermənilər tərəfindən daim sıxışdırılmış, öz ata-baba yurdlarından didərgin salınmış, 1988-ci ildə isə tamamilə qovularaq qaçıqına, köçgünə çevrilmişlər.***

***İstər 1988-ci il hadisələrindən əvvəlki, istərsə də sonrakı dövrlərdə Qərbi Azərbaycanın bəzi bölgələri haqda müxtəlif tarixi və bədii əsərlər yazılmış, bədii və sənədli filmlər çəkilmiş, radio vəteleviziya tamaşaları hazırlanmış və bu yolla təkzibolunmaz tarixi həqiqətlər oxuculara, dinləyicilərə və tamaşaçılara çatdırılmışdır.***

***Qaraqoyunlu haqda yazılan bəzi məhdud saylı kitabların müəlliflərinə minnətdarlığımı bildirmklə yanaşı, təəssüflə qeyd etməliyəm ki, kifayət sayda böyük potensial imkanlı ziyalıları, adlı-sanlı alimləri, vəzifə və vardövlət sahibləri olmasına baxmayaraq, bu bölgə haqda olduqca az yazılmış, az deyilmiş, demək olar ki, təbliğ olunmamşdır.***

***Arxivlər düşmən əlində olduğuna, bölgəni yaxşı bilənlərin sıraları kəskin şəkildə seyrəldiyinə, yaddaşların korşaldığına və bu baxımdan zamanın ziyanımıza işlədiyinə görə hazırkı dövrdə Qaraqoyunlu haqda yazmaq daha da çətinləşmişdir.***

***Deyilən və deyilməyən bütün obyektiv və subyektiv çətinliklərə baxmayaraq, Qaraqoyunlu həqiqətlərini gənc nəslin yaddaşına köçürmək, qan və gen yaddaşını oyatmaq, onlarda Qaraqoyunlu sevgisi aşılamaq hamımızın müqəddəs borcumuzdur.***

***Sizə təqdim edilən bu kitab həmin məqsəd naminə yazılmışdır***

***İki hissədən ibarət olan kitabın birinci hissəsində Qaraqoyunlu, Göyçə və Borçalı ilə bir masa arxasında əyləşən müəllif həmin bölgələrlə bilavasitə və ya bilvasitə ilə bağlı olan tarixi hadisələr haqda bildiklərini danışır,***

***həmin hadisələrə öz fərdi münasibətini bildirir.***

***Belə çoxsaylı hadisələr arasında 1941-1945-ci illər müharibəsi, 1988-ci il hadisələri və onlarına acı nəticələri də vardır. Kitablarda bu müharíblərdə həlak olan və itkin düşən Qaraqoyunluların ayrı-ayrı kəndlər üzrə siyahıları verilmişdir. Müxtəlif mənbələrdən alınıb müqayisə edilərək, ən düzgün variant kimi qəbul edildiklərinə baxmayaraq bu siyahıların da tam dəqiq olmaları şübhə doğurur. Ona görə də hörmətli oxuculardan xahiş edirəm ki, adları siyahıya düşməyən müharibə qurbanlrı haqda və yaxud adları səhvən siyahıya düşənlər barəsində bildikləri məlumatları kitabın arxasındakı qeyd yerində yazıb, müəllifə çatdırsınlar.***

***Kitabın ikinci hissəsinə müəllifin müxtəlif mətbuat orqanlarında nəşr etdirdiyi məqalələr onun yazdığı və ya ona həsr olunmuş şerlərindən bəziləri daxil edilmişdir.***

***Qarşınızda olan bu kitabın davamı hazırlanır. Yaxın gələcəkdə dərc olunacaq həmin kitabda müəlifin deyil, Qaraqoyunlu Dərəsinin danışdqları qələmə alınır, Qaraqoyunlu sinəsi üstə gəzdirdiyi, torpağı, suyu, havası ilə böyüdüb boya-başa çatdırdığı övladlarına münasibətini bildirir, dəyərləri və dəyərsizləri, çoxsifətliləri, yaltaqları, peşəkar məddahları və mərd insanları göz önünə gətirir, diplomsuz savadlılar və diplomlu savadlılar, el-obasınabaş ucalığı gətirən və əksinə, el-obanın başını aşağı eləyən vəzifə sahibləri haqda səmimi, açıq, qərəzsizsöhbət eləyib, həqiqəti açıb, ortaya qoyur.***

***Kitabın nəşr edilərək işıq üzü görməsində əməyi olanların hamısına, o cümlədən Ağsu rayonunda həkim işləyən, Əsgər Həşim oğlu Mirzəyevə və dəyərli eloğlu, fizika-riyaziyyat eləmləri namizədi Baxşəli Səlim oğlu Süleymanova minnətdarlığımı bildirirəm.***

# I hissə

## 1. Kitabın yazılma səbəbi

Günlərin bir günü çoxlu dostların iştirak etdiyi gözəl bir məclisdə "Ümumidünya sülhsevərlər birliyi" nin prezidenti və "Dünyanın səsi" qəzetinin baş redaktoru, istəkli dostum, professor Vəli Aslan oğlu İsmaylov Borçalı haqda bəzi ürək sözlərimi qəzet vasitəsilə oxuculara çatdırmağımı tövsiyə etdi. Təşəkkür etdim.

Borçalı haqda hansı məlumatlara malik olduğum, bunlardan nəyi və necə deyə biləcəyim haqda fikirləşdim. Ulu borçalının adı gələndə gözüm önünə onunla ekiz qardaş kimi yanaşı duran, oxşar taleli digər qərbi Azərbaycan elləri Kəvər (Kamo), Zəngibasar (Masis), Qarakilsə (Sisyan),Vedi (Ararat), Ağbaba (Amasya), Şinix (Noyenberyan), Calaloğlu (Stepanavan), Taşir (Kalinino), Qafan rayonları, o cümlədən, qucağında dünyaya göz açdığım, suyundan içib, havasından udaraq, boya-başa çatdığım Qaraqoyunlu dərəsi və Göyçə mahalı gəldi. Ona görə də düşündüklərimi Göyçənin, Qaraqoyunlunun və Borçalının vasitəsilə bütün qərbi Azərbaycan ellərinə ünvanlamaq istədim. Bu üç bölgəni biri-birindən ayırmağın günah ola biləcəyini düşünərək, ürəyimdəkiləri bir həmsöhbət kimi birbaşa Borçalının, Qraqoyunlu dərəsinin və bilavasitə Göyçənin özünə söyləmək istədim.

Ulu Qaraqoyunlu. ulu Göyçə, ulu Borçalı sizin haqqınızda sizə layiq ola biləcək söz söyləmək istəyim nə qədər güclü olsa da, dərk edirəm ki, mənim kiçikliyim, sizin isə böyüklüyünüz, ucalığınız arasında əlçatmaz, ünyetməz və nəhayətsiz böyük məsafə vardır. Lakin, evladlıq borcumu yerinə yetirmək istəyim üstün gəldiyinə görə bütün Qərbi Azərbaycanla bağlı olan və onların biləvasitə iştirakı ilə baş verən bəzi tarixi hadisələri mənimlə həmkar olub, bir masa arxasında əyləşən Qaraqoyunlunun, Göyçənin və Borçalının və onların vasitəsilə digər Qərbi Azərbaycan ellərinin nəzərinə çatdıraraq, qərəzsiz, saf münasibət bildirmək, qəlbimdən keçənləri ortaya qoymaq və hamınınkı etmək istədim.




Xəritələr Qafqaz Hərbi Dairəsinin 1903-cü ildə Tiflisdə çəkdiyi xəritədən götürülmüşdür.

Mənə elə gəldi ki, dəyirmi masa arxasında gördümüz-həmin üç bölgə və mən əyləşmişik, olub keçənlər və gələcəkdə ola biləcəklər haqda gedən bu maraqlı məclisdə danışmaq üçün söz mənə verilmişdir.

Həmkarlarıma minnətdarlığımı bildirirəm. Mənimlə həmkar olub, söhbətimizin baş tutmasına razı oldular, ilk sözü mənə verərək, səbrlə, təmkinlə və valideyin nəvazişi ilə dinləməyə hazır olduqlarını bildirdilər.

Yanar ocaq varlığını alov və tüstü şəklində biruzə verdiyi kimi, insanların ürək yanğısı varlığını sözə çevirərək biruzə verir.

Mən də arzularımı sözə çevirib, sizə və qədirbilən oxuculara çatdırmaq İstəyirəm, doğma Qərbi Azərbaycan elləri.

Necə başlayım, nə deyim sizə? Sizi çox istədiyimi, sizdən ötrü can verməyə hazır olduğumu deməklə özümü şirin salmaq fikrim yoxdur. Sizi sox istədiyini dəfələrlə və tez-tez təkrarlayanların sevgisinə, istəyinə böyük şübhə İlə yanaşıram. Bu, yaltaqların, məddahların, çoxüzlülərin, var-dövlət və vəzifə düşkünlərinin, özündən bir pillə yuxarıda dayananların qarşısında cücə, aşağıdakıların qarşısında isə xoruz olub, xoruzlananların peşəsidir. Oğul ana-sını və anasının anası olan vətənini sevməyə bilməz. Əgər oğul ananın, ana torpağın saf sevgisindən halallıqla yoğrulub, dünyaya gəlmişsə, onun halal övladıdırsa, şəksiz ki, ona böyük məhəbbəti, sevgisi olacaqdır. Öz müqəddəs torpağından, suyundan, havasından və işığından yoğurub-yapdığın və dünyaya gətirdiyin balan kimi, mən də sənə borcluyam.Eni-uzunu, etibari etiqadı olmayan bu dünya nə qədər məzmunlu, mənalı, nəhayətsiz, böyük görünsə də, o qədər də kiçik, cılız, etibarsız və çox üzlüdür. Belə olmasaydı, Tanrı tərəfindən yaradılaraq dünyanın əşrəfi səviyyəsinə yüksəldilən insan oğlu nəinki dünyanın özünəməxsus qanunlarından, heç olmasa o böyük allahın buyurduqlarından uzaqlaşmaz, dünyaya meydan oxumazdı .

Qurani-kərimdə göstərildiyi kimi Allah insanları yaradandan sonra buyurmuşdur:

Mən sizi yaratdım, siz isə biri-birinizi, sonra özünüzü və

məni tanıyın.

İnsanlardan bu ilahi buyruğuna riayət edən də oldu, etməyən də, onu həyatda yerinə yetirən də, yetirməyən də. Bütün bunlarla birlikdə insan övladı müxtəlif dilli, müxtəlif dinli, müxtəlif dünyagörüşlü və müxtəlif əqidəli millətlərə, xalqlara çevrilərək, müəyyən sərhədlərə, qanunlara malik dövlətlər yaratdı. Dünyanı öz istədiyi kimi idarə etmək fikrinə düşdü. Bu istək bəzən haqlı, bəzən haqsız oldu. Bu məqsədə çatmaq üçün hərə öz yolunu tutdu.

Yaranmış və müəyyən formalaşma dövrünü keçmiş xalqlar öz aralarında dünyanı özününkü etməyə, öz şəxsi əmlakına çevirməyə çalışdı və onu parçaladı, böldü. Hər xalq öz bacarığına, imkanına, obyektivliyinə , insafına və öz tanrı payına müvafiq olaraq dünyada özünəməxsus yerini aldı. Dünyada xalqlar, millətlər sayca sox olsa da, onların barmaqla sayıla bilən cüzi bir hissəsi yer kürəsində inkaredilməz böyüklüyə malik olmuşlar. Sayca az olan bəzi xalqlara çox kiçik, çoxsaylı olmalarına baxmayaraq, digərlərinə isə nəhayətsiz böyük görünən bu dünya, həmin xalqlar, dövlətlər və onların başçıları tərəfindən müxtəlif yollarla bölündü, mənimsənildi.

Əziz borçalı, doğma Qaraqoyunlu və Göyçə torpağı, sən də bu dünya bölgüsündə sinən üstündə gəzdirdiyin halal, mərd, çoxsaylı bir xalqın, böyük Türk xalqının, Türk oğlunun payına düşmüsən. Bununla fəxr etməyə haqqın, əsasın var. Bir danılmaz həqiqətdir ki, müxtəlif xalqlar arasında özünəməxsus yeri olan böyük Türk xalqının dünyanın gedişini dəyişdirə biləcək, onu allahın buyurduğu doğru yola - haqq, ədalət, insaf yoluna yönəldə biləcək istəyi, qüvvəsi və bacarığı olmuşdur, var və inşallah,olacaqdır.

Türk oğluna Allahın verdiyi güc, böyüklük bütün dünyaya məlumdur.

**2.Hun imperiyası dövrü. Atilla.**

Müxtəlif dövrlərdə məkrli siyasətləri, paxıllıqları üzə çıxan bəzi xalqlar, dövlətlər, hətta imperiyalar və onların başçıları Türkün qüvvəsi, fiziki böyüklüyü, zəhmi qarşısında

acizləşmiş, öz qınına çəkilməyə məcbur olmuşlar.

Ulu Borçalı, ulu Qaraqoyunlu, ulu Göyçə, sənə də ucalıq, böyüklük və fərəh gətirən belə şərəfli tarix dəfələrlə təkrar olunmuşdur. Belə dövrlərdən biri də, min beş yüz il bundan əvvəl yaradılmış Hun imperiyasının - böyük Türk imperiyasının dövrüdür. Özünüzün də yadınızdadır ki, həmin dövrdə dünyada ikinci bir imperiya-Roma imperiyası da mövcud idi. Roma imperiyası Türk imperiyasına illik vergi, xərac ödəyirdi. Dünyanın böyük bir hissəsi olan öz torpaqlarını: Çinin, Hindistanın quzeyini, Şərqi Rusiyanı, Orta Asiyanı, Qafqazı, Anadolunu əhatə edən Türk dövləti, eyni zamanda, Bolqarıstan, Macarıstan, Ruminiya, Çexiya,Orta Almaniya və Serbiya daxil olmaqla bütün Şərqi Avropanı öz nəzarəti altında saxlayırdı. Böyük Türk imperiyasının başında Türk oğullarından biri, Xaqanlar Xaqanı,sənin, mənim ilu babalarımız Oğuz xanın, Metenin sələflərindən olan Atilla dururdu.

Hün türklərinin ən tanınmış hökmdarı Atilla dünyanın yetişdirdiyi ən böyük sərkərdələrdən və dahi hökmdarlardan biridir. Doğum və ölüm tarixi təxmini olaraq 400-453-cü illər arasında olub.

Qot tarixçisi Enordana görə boyu qısa, köksü geniş, başı və gözləri kiçik, saqqalı seyrək, burnu yastı, rəngi qaraymış.

Hamını cəlb eləyən təbiəti, tərifə sığışmayan qüvvəsi varmış.

Bu ulu babamızın adı hər kəsi qorxuya salardı, ən kiçik yamanlığı belə qəbul etməyərək, dəhşətli dərəcədə hirslənərdi.

İstədiyi bir sox şeyləri savaşsız da əldə etməyi bacarırdı, Atilla. Diktator olmaqla yanaşı, olduqca sadə bir insan idi.

Mədəniyyəti sevirdi, istila etdiyi şəhərlərin mədəniyyət əsərlərinə toxunmurdu.

Qonaqlarına qızıl, gümüş qablarda yemək verdiyi halda, özü taxta qablarda yeyərdi, Atilla.

Başlıca əyləncəsi ov idi.

Qərb qaynaqlarında Atilla babamıza “Tanrının qılıncı” deyirdilər. Onların inamına görə xristianların itirdiyi “qələbə qılıcını” Atilla tapmışdır və yaxud həmin qılınc tanrı tərəfin-

dən ona verilmişdir. Buna səbəb xristianların çoxlu günah etmələri olmuşdur. Ona görə də Allah Atillanı xristianları cəzalandırmaq üçün göndərmişdir.

“Qələbə qılıncının “ onda olduğuna görə o məğlubiyyətin nə olduğunu bilmir və bilməyəcək, daim qələbə çalacaqdır.


Atilla

Türk imperiyasına vergi verməyi öz şəninə və imperiyasının adına sığışdırmayan, Romanın nüfuzuna xələl gətirdiyini dərk edən imperator vergi müqaviləsini pozmaq üçün müxtəlif hiylələrə əl atır, bəzi Avropa dövlətləri ilə Hun İmperiyası arasında süni narazılıqlar yaratmağa çalışırdı.

Demək olar ki, o məqsədinə nail oldu. Nəticədə Roma imperiyası ilə birlikdə, bəzi Avropa ölkələri də vergi ödəməkdən boyun qaçırdılar və Hun imperiyasına tabe olmaq istəmədilər.

Bu səbəbdən, Roma imperiyasına və onun imperatoruna qulaq burması vermək və ona öz layiq olduğu yeri göstərmək məqsədilə ulu babamız Atilla öz ad sanına, Türk xalqının döyüş ənənəsinə layiq böyük və qüvvətli bir ordu ilə Avropaya tarixin yaddaşına əbədi həkk olan möhtəşəm yürüş etdi.

451-ci ilin 20 iyununda 200 minlik Atilla ordusu Paris yaxınlığındakı Katalaun bölgəsində Roma ordusu ilə üz-üzə gəldi. O günə qədər tayı-bərabəri görünməmiş bu döyüş düz 24 saat sürdü. Roma ordusu dağıdıldı. Atilla geri çəkilən Roma ordusunun qalıqlarını təqib etmədi. Çünki o, artıq arzusuna çatmışdı. Roma imperiyasına dayaq nöqtəsi olan Qallianı, yəni Fransanın güney doğusunu ələ keçirmişdi. Bundan sonra Romanı tamam sökdürmək asan idi, ancaq buna müəyyən bir hazırlıq görmək və orduya dincəlmək imkanı vermək lazım idi.

Bu hadisədən bir il belə keçməmiş, 452-ci ilin baharın-

da Atilla Romanın o zamankı paytaxtı Ravennaya doğru hərəkətə keçdi və az bir vaxtdan sonra dünyanın ən böyük, ən qədim, ən gözəl şəhərlərindən biri, saysız-hesabsız heykəllər, müxtəlif yönlü incəsənət nümunələri ilə zəngin olan Romanın qapıları önündə dayandı.

Bu dəfə də Atilla öz xarakterinə sadiq qalaraq, şəhəri dağıtmaq istəmədi.

Məğlubiyyətin qaçılmaz olduğunu görən Romalılar Papa da daxil olmaqla xüsusi bir elçi qrupunu Atillanın hüzuruna göndərdilər. Atilla həmin heyəti öz qərargahında qəbul etdi.

Roma papası Leo Türk imperiyasının başçısı Atillanın yanına Roma imperatorunun, xüsusən də bütün xristian dünyasının adından gəldiyini bildirərək, müvafiq sənədlər təqdim etdi. Papa Atilladan Romanın əffini xahiş etdi, bunun müqabilində ilbəil xəracın artırılacağını, Atillanın tələblərinə şəksiz əməl olunacağını bildirdi.

Atilla papanın yalvarışlarını qəbul etdi, Romanı işğal etmədi, onu dağıtmaq istəmədi. Bu, Atillanın incəsənətə, elmə, quruculuğa, gözəlliyə, insan əli-nin insan üçün yaratdığı hər şeyə böyük məhəbbətini, saf duyğusunu və bir insan kimi böyüklüyünü göstərir, istəkli oxucular.

Nəzərinizə çatdırmaq yerinə düşər ki, Roma imperatoru Yuli Sezar vaxtıilə Misiri zəbt etdiyi zaman dünyanın ən zəngin və ən böyük kitabxanası olan İskəndəriyyə kitabxanasını yandırıb, külə döndərmişdi.

Özünüz bu iki böyük cahangiri - Türk oğlu Atillanı və dünyanın, guya ən inkişaf etmiş, ən mədəni xalqı kimi tanıdılan italyan xalqının oğlu Sezarı qarşılaşdırıb, hökmdar, fateh olmaları ilə yanaşı bir insan, adi bir Allah bəndəsi kimi müqayisə edin və müvafiq nəticə çıxarın, istəkli oxucular. Belə yanaşsanız Türkün qat-qat üstün olduğunu açıq-aydın görəcəksiniz.

Bəli, doğma Göyçə, Atilla indi həm qərbin, həm də şərqin hakimi olmuşdu, Avropa onu hafizəsindən silə bilməyəcəkdi. Atillanın həyatının hamısı, olumu, ölümü, istənilən dövrü qeyri-adi, nağıl kimi maraqlı olmuşdur.

İtaliyaya səfər edib, Roma imperiyasını diz çökdürdük-

dən sonra indiki Macarıstanın ərazisində öz sarayında özü üçün toy məclisi quran Atilla, İldiko adlı olduqca gözəl və c-azibədar bir şahzadə ilə evlənirdi. Hamı sevinc içərisində idi, üzlərdə gülüş, münasibətlərdə mehribançılıq bütün məclisə hakim idi. Avropanın fəthi və şanlı qələbənin sevinci toy mərasiminin, Türkün şadyanalığına qarışmışdı. Nəhayət, toy mərasimi sona yetdi. Hamı sarayı tərk etdi. Atilla ilə şahzadənin izdivac gecəsi başladı. Onlar yataq otağına çəkildilər. Bundan sonrakı hadisələr gözlənilməz oldu. Elə həmin izdivac gecəsi, elə həmin xoşbəxt dəqiqələrdə, ulu və müqəddəs sevgi anında, iki könüllərin canha-canında Atilla dünyasını dəyişdi, gözlərini əbədi yumaraq,Tanrının dərgahına qovuşdu. O, səhərə qədər yaşaya və əyanlarının təbriklərini qəbul eləyə bilmədi.

Bu xəbər bütün dünyaya yayıldı. Hunlar matəmə qərq olmuşdu. Müxtəlif söz-söhbətlər, ağılagəlməz şaiyələr gəzirdi. Sui-qəsdin olmasından, onu evləndiyi qızın öldürməsindən şübhələnirdilər. Loğmanlar, adlı-sanlı şamanlar toplandılar, sui-qəsdin olmadığını, xaqanın öz əcəli ilə dünyasını dəyişdiyini müəyyən etdilər.

Atillanın ağzından, burnundan qan açılmış və o qanaxma nəticəsində əbədiyyətə qovuşmuşdu. Ona yaxın olanlar və uşaqlıqdan tanıyanlar Atillanın böyük qardaşı Budanın da, eyni xəstəlikdən öldüyünü bildirdilər.

Nələr olmur bu dünyada, ya Rəbb?

Atillanın ölümü kimi tabutu da qeyri-adi idi, istəkli oxucular. Atillanı iç-içə yerləşdirilmiş üç tabuta qoydular.

Birinci tabut günəş kimi parlayan qızıldan düzəldilmişdi. Bu, Atillanın Hunların günəşi olduğunu bildirirdi.

İkinci tabut quyruqlu ulduza oxşayırdı. O, gümüşdən düzəldilmişdi. Bu, Atillanın çox nadir görünən ulduz olduğunu göstərirdi. Üçüncü tabut su verilmiş poladdan düzəldilmişdi. Çünki, ulu babamız polad kimi möhkəm hökmdar, əyilmək bilməyən xaqan idi.

Qızıl, gümüş və poladdan düzəldilmiş tabutlar bir-birinin içinə yerləşdirilərək, üçqat tabutdan ibarət olan bir tabuta çevrilmişdi.

Atillanın həyatı, ölümü və tabutu kimi dəfni də qeyri-adi olmuşdur. Tısca çayının adalarının birində qəbir qazıldı. Qəbir elə dərin qazıldı ki, ora su daxil olmasın və qəbir nəmlənməsin. Atillanın tabutu ona aid olan silahlar və dəyərli əşyalarla birlikdə həmin qəbirə endirildi və torpaqla dolduruldu. Sonda çayın yatağı dəyişdirildi və birbaşa qəbrin üstündən axıdıldı.

Artıq arxayın olmaq olardı. Heç kim Atillanın qəbrini tapıb açaraq, talan eləyə və bu böyük insanın,dahi Türkün, məğlubedilməz hökmdarın, ulu babamızın ruhunu narahat eləyə bilməyəcəkdi. Elə də oldu, doğma Qaraqoyunlu.Texnikanın yüksək dərəcədə inkişaf etmiş olduğu indiki dövrdə də qəbrin yerini tapmaq mümkün deyil.

Kaş ki, tapılaydı. Oranı səcdəqaha çevirib, önündə baş əyər, diz çökər, ehtiramımızı bildirər, evladlıq borcumuzu yerinə yetirməyə çalışardıq.

Amma nə etməli ? Görünür bu da ulu babamızın alın yazısı , tanrı qisməti imiş. Tanrı ona qeyri-adi, digərlərinə bənzəməyən ömür yolu, məğlub edilməz qələbə qılıncı, gözlənilməz toy gecəsi, ağılagəlməz formalı tabut və qəbir qismət eləyibmiş. Tanrının yazdığı yaxşıdı, eşq olsun onun qüdrətinə!

Görünür ən müqəddəslər, ən qeyri-adilər qeyri-adi ömür yolu keçməli, silinməz iz qoymalı və qeybə çəkilməlidirlər. Belələrindən biri də Atilladır.

Allah rəhmət eləsin !

Avropanın formalaşmasında və inkişafında Hunların çox böyük rolu oldu, hörmətli oxucular. Məsələn, qərbi Hunların bir bölümündən macarlar, digər bölümündən isə bulqarlar ayrı-ayrı dövlətlər halında ortaya çıxdılar, sərbəst yaşamağa başladılar və hazırda da yaşayırlar.

Hun imperatorluğu Avropanın sosial həyatına və mədəniyyətinə ciddi təsir göstərmişdir.

Romalılar beşinci yüzillikdən etibarən Türk ordusundakı təşkilat quruluşunu və ordudakı onluq sistemi mənimsəməyə başladılar. Kətan köynək paltarı, jaket və şalvar geyməyi, masada yemək yeməyi də türklərdən öyrəndilər.

Türklər dillərini, adətlərini heç bir pozuntuya yol verməmədən qorudular, siyasi hakimiyyət sona çatanadək ancaq türkcə danışdılar.

Hörmətli oxucular, gördüyünüz kimi Atillaya bu yazıda nisbətən geniş yer verilmişdir. Məncə, bu təbidir. Çünki, o ən dəyərli, ən böyük babalarımızdandır. Ona görə də, türklərin hamısı, o cümlədən biz Azərbaycan türkləri də onu layiqincə tanımalı və tanıtdırmalıyıq. Bu, bizim evladlıq borcumuzdur.

Yaxşı mənimsəməli və yadda saxlamalıyıq ki, keçmişini bilməyənlərin gələcəyi ola bilməz.

Sizə gün kimi aydın olan, şahidi olduğunuz bu tarixi həqiqəti söyləməkdə məqsədim sinəniz üstə gəzdirdiyiniz və üzürlü səbəbə görə gəzdirə bilmədiyiniz övladlarınızın qan yaddaşını təzələməkdən ibarətdir. İstəyim həmin tarixi yürüşdə bilavasitə iştirakınızı qeyd edərək, yerinizi göstərmək və bunu müasirlərimizin qəlbinə köçürməkdən ibarətdir. Digər, bəlkə də daha əsas və vacib məqsədim isə ta qədim dövrlərdən türk torpağı olduğunuzu geniş oxucu kütləsinin diqqətinə çatdırmaqdır. Ulu borçalı, mənimlə razılaşarsan ki, buna çox böyük ehtiyac duyulmaqdadır. Səninlə bağlı tarixi qaynaqlardan birində göstərilir ki, yeddi yüz altmış beşinci ildə bir türk kimi sən gürcü xalqına kömək etmiş, ərəblərə qarşı qanlı savaşlarda mətanətlə vuruşmusan.

Uzaq Şərqdən Avropanın ortalarına qədər uzanan bu məsafəni qət etmək üçün Atilla, öz ordusu ilə birlikdə dəfələrlə yol boyu müxtəlif bölgələrdə məskən salaraq dayanmış, dincəlmiş, qüvvə toplayaraq yenidən yoluna davam etməli olmuşdur. Məlumdur ki, belə dayanacaqlarda Atillanın qoşununa yerli əhalidən ibarət dəstələr qoşularaq ümumi düşmənə qarşı vuruşmada iştirak etmişlər.

Bir məlumatda qeyd edilir ki, dayanacaqların birində hökmdarın alaçığına əllərində qopuz axın-axın yerli ozanlar daxil olurdu. Qopuzun sədaları altında gah şən nəğmələr oxunur, rəqs edilir, gah da kədərləndirici və düşündürücü mahnılar eşidilirdi. Bu hadisə çox mətləblərdən xəbər verir. Qopuzun müasir saza çevrildiyini, Atilla ordusunun dayandığı həmin bölgənin sazla bilavasitə bağlı olduğunu, müasir

türk dünyasında saz sənətinin ən inkişaf etdiyi Göyçə-Qaraqoyunlu - Qazax - Borçalı bölgəsi olduğunu nəzərə aldıqda, deyə bilərik ki, bəlkə də ulu babamızın və qəhrəman ordusunun növbəti dayanacaqlarından biri bu bölgə olmuşdur və ordunun tərkibində bu bölgənin oğulları da iştirak etmişdir. Deməli, böyük Türk imperiyasının tərkib hissəsində sənin də özünəməxsus bir yerin var, ulu Göyçə, ulu Borçalı, ulu Qaraqoyunlu.

O vaxtdan çox illər, əsrlər keçdi. Dünyada ağlagəlməz dəyişikliklər baş verdi. Gündoğandan günbatana, günbatandan gün-doğana, quzeydən güneyə, güneydən quzeyə çox sular axdı, çox küləklər əsdi . Bəzi dövlətlər dünya üzündən silindi, qısa və uzun ömürlü yeni dövlətlər yarandı. Elə xalq oldu ki, yurdunda həmin torpaqla heç bir əlaqəsi olmayan yad bir xalq, yabançı bir millət məskən saldı. Zamanın bu keşməkeşlərində bəxti gətirənlər də oldu, gətirməyənlər də. Amansız mübarizələrə dözənlər də oldu, dözməyənlər də, qazananlar da oldu, itirənlər də.

### 3. Atabəylər gövrü. Şəmsəddin Eldəgəz (Eldəniz)

Ümumiyyətlə, haqqında yuxarıda bəhs etdiyimiz Hun İmperiyası dövründən sonra neçə-neçə nəsillərin dəyişdiyi beşyüz-altıyüz illik çox böyük zaman kəsiyində sənin xalqın keşiyində mərd dayandı və zamanın sərt burulğanında həmişə səninlə bir yerdə oldu. Övladların sənin yolunda əlindən gələni əsirgəmədi, sənin tarixinin şərəfli səhifələrini yazdı, səni qorudu, səni ucaltdı. Heç zaman kəsilmək bilməyən bu şərəfli ömür yolunda sinən üstə gəzdirdiyin övladlarının hər birinin; xaqanın, sultanın, xanın, şahın da; çoban-çoluğun, əkinçinin də, qulun da, quldarın da, alimin də, nadanın da, bir sözlə hamının zəhməti, hərənin öz payı oldu. Bu yolda sənə baş ucalığı, şərəf, şöhrət bəxş edən çobanın, qulun, əkinçin də oldu. Öz əməlləri ilə sənin şərəfinə ləkə gətirən bəzi şahların, xanların, müxtəlif adla adlandırılan böyük vəzifəli başçıların da oldu. Belə qulların müqəddəsləşdi, əbədi olaraq sənin yaddaşına çökdü, yaşadı. Elə şahların, xanların,vəzifə sahiblərin oldu ki, sənin gözündə dünyasını dəyişməmiş öldü

və qırxı çıxmamış unuduldu. Bu yerdə tariximizə aid yadıma düşən maraqlı bir əhvalatı xatırlamaq yerinə düşərdi, ulu Borçalı, Qaraqoyunlu, Göyçə.

Yadınızdadırmı Xll əsr? Atabəylərin, Atabəylər sülaləsinin, Atabəylər Dövlətinin yaranması və təşəkkül tapdığı yaddaqalan, şərəfli bir dövr - Atabəylər dövrü! Bu nə dövrdür, nə ilə səciyyələnir ?

Bildiyiniz kimi hakimiyyət nəsildən-nəsilə, atadan oğula, oğuldan nəvəyə ötürülürdü. Bəzi hallarda dünyasını dəyişən bəzi Səlcuq sultanlarının vəliəhdlərinin yaşları çox az olduğuna baxmayaraq sultanlıq taxtına oturmağa məcbur idilər, lakin dövləti idarə etməyə qadir deyildilər. Belə hallarda böyüyüb dövləti idarə edə biləcək səviyyəyə çatanadək vəliəhdə tərbiyəçi təyin edirdilər. Onlar “atabəy”, “ata “, “xoca”, bəzən də Səfəvilər Dövlətində olduğu kimi “lələ” adlanırdılar. Atabəy böyük vəzifə sahibi idi. Ona görə də, bu dövr Atabəylər dövrü adlanır.

Atabəylər dövründə çox geniş əraziyə malik, bir neçə sülalədən ibarət böyük Atabəylər Dövləti yaranmışdı. Bu sülalələrdən biri də, bildiyimiz kimi Eldəgəzlər sülaləsi idi. Bu sülalənin yaratdığı Azərbaycan Atabəylər Dövlətinin tərkibinə Qaraqoyunlu, Borçalı və Göyçəmizin də daxil olduğu böyük bir sahə - Dərbənddən Fars körfəzinədək geniş bir ərazi daxil idi.

Azərbaycan Atabəylər Dövlətinin yaradıcısı , banisi kim idi, yadınızdadırmı? O böyük insan Şəmsəddin Eldəgəz idi. Adı, şəxsiyyəti, byüklüyü ilə haqlı olaraq fəxr etməli olduğumuz Şəmsəddin Eldəgəz. Ağlının dərinliyi, zəkasının parlaqlığı; dövlət,təsərrüfat və hərbi işlərdə heyrətamiz bacarığı ilə fərqlənən, Allahın bəxş etdiyi qeyri adi qabiliyyəti olan, öz sağlığında özünə ölməzlik qaza-



**Şəmsəddin Eldəniz**

nan, əslən qıpcaq türklərindən olan ulu babamız Şəmsəddin Eldəgəz!

Yaratdığı dövlətin işığından bir çox şairlərin, o cümlədən Nizami Gəncəvi və Əfzələddin Xaqani kimi dahilərin bəhrələndiyi Şəmsəddin Eldəgəz!

Bəs Şəmsəddin Eldəgəz babamızın özü kim idi? Onun haqqında indi söyləyəcəyimiz çoxlarına, o cümlədən, sizə də məlumdur. Sən də bilməmiş deyilsən əziz Göyçə.

Bu olduqca maraqlı və nağılabənzər tarixi həqiqəti istəkli uxucuların nəzərəinə çatdırmağın faydalı olacağını guman edirəm, doğma Qaraqoyunlu.

Bəli, günlərin bir günü Dərbəndin səsli-küylü, izdihamlı qul bazarında qul alveri gedirdi. Kimi alır, kimi satırdı. Boy-buxunundan, yaşından, gözəlliyindən, sağlamlığından və digər əlamətlərindən asılı olaraq, qullar müxtəlif qiymətə satılırdı. Alan ucuz qiymətə almaq, satan isə baha qiymətə satmaq məqsədi ilə yazılmamış bazar qanunlarına uyğun gələn canfəşanlıq edirdi.

O zamanlar qul bazarında belə bir qayda var idi. Bir dəfəyə qırx qul alana axırıncı pulsuz verilirdi. Ancaq, bu qul satan tərəfindən müəyyən edilirdi. Təbii ki, belə hallarda bağışlanan qul ən ucuz qiymətə gedən qul olurdu. Bir gün belə bir əhvalat Dərbəndin qul bazarında baş verdi. Bir nəfərə bir dəfəyə qırx qul satıldı. Bağışlanılan qırxıncı qul taqətdən düşmüş, olduqca zəif, xəstə görkəmli, zavallı bir oğlan uşağı idi. Çox zəif olduğundan, yeriməyə taqəti olmadığından başqa qullardan fərqli olaraq, onu arabaya mindirirlər. Deyilənə görə bu taqətsiz qul özünü saxlaya bilmir və arabadan yerə düşür. Onu yerdən götürüb arabaya qoyurlar. Bu zavallı ikinci dəfə arabadan yerə yıxılır. Yenə götürüb arabaya qoysalar da, üçüncü dəfə yıxılır. Bu dəfə onsuz da öləcəyini ehtimal eləyərək, ona pul xərclənmədiyini də nəzərə alaraq, onu düşdüyü yerdə qoyub, yollarına davam edirlər.

Amma, sən saydığını say, gör fələk nə sayır deyib atalar. Bir müddətdən sonra özünə gələn, sahibi tərəfindən atıldığını, tək-tənha yarı yolda qaldığını görən bu yazıq qul, Allahdan başqa heç bir köməyi olmayan bu cılız uşaq özündə quv-

və taparaq, hərəkətə başlayır və bir müddətdən sonra, heç kimin gözləmədiyi halda arabaya çatır.

Əlbəttə, bu hadisə yaradan və yaşadan Allahın nəzərinin və əl kölgəsinin onun üstündə olduğunu göstərir. Çox sirlərdən xəbərsiz olan bəndələr nə bilərdi ki, onlara zavallı, yazıq, aciz və bədbəxt görünən bu uşaq Allahın sevdiyi əziz qulu, tanrının istəkli bəndəsidir. Bu taqətsiz, ayağa qalxa bilməyən quldakı fərasət, zəif vücudda toplanan və dar ayaqda vulkan kimi püskürərək, özünü göstərən qeyri-adi qabiliyyət, çeviklik, gözlərinin dərinliklərindən süzülən həyat işığı qul sahibində onun gələcəyinə qeyri-adi bir inam, bir ümid yaradır.

Kim idi bu qul? Gələcəkdə hamımızın fəxr edəcəyimiz Şəmsəddin Eldəgəz. "Şəmsəddin" sözü "Şəms" və "din" sözündən götürülmüşdür, "dinin günəşi" deməkdir.

"Dinin günəşi" mənasını verən Şəmsəddin adını ona Azərbaycan Atabəylər Dövlətənin başçısı və banisi olduğu vaxt, bu adındakı mənanı qazandıqdan sonra verirlər. Amma, Tanrının bəxş etdiyi ucalıq, böyüklük, millət atası olmaq qisməti isə onun alnına doğulmamışdan öncə yazılıbmış. Şükürlər olsun Tanrının qüdrətinə! Odur şahı qul, qulu şah eləyən.

Kaş ki, bütün hökmdarlarımızda, xanlarımızda, xaqanlarımızda, şahlarımızda, dövlət başçılarımızın hamısında Şəmsəddin Eldəgəz qeyrəti olaydı. Belə olsaydı zaman-zaman parçalanmaz, kiçilməz, doğma torpaqlarımızdan ayrı düşərək, yetimləşməzdik, dövrümüzün müdhiş məngənələrində vaxtaşırı sıxılmaz, əzilməzdik.

### 4. Qaraqoyunlular və Ağqoyunlular. Qara Yusif və Uzun Həsən. Əmir Teymur və Yıldırım Bayazid

Ulu Borçalı, əziz Qaraqoyunlu, istəkli Göyçə, qədim dövrlərdən başlayaraq keçdiyiniz keşməkeşli həyat yollarınız haqda bəzi məqamları yada salaraq, fərdi münasibətimizi bildirməklə, gəlib XIV əsrə çatdıq. XIV əsrin ikinci yarısı və XV əsr bütövlükdə sizin üçünüzün də həyatında ən çətin və ən yadda qalan hadisələrlə dolu dövrlərdəndir. Çünki, sizin də iştirakçısı olduğunuz və burulğanlarında buruldüğunuz o dövr hadisələri nəinki sizin bölgələrə və ancaq Türk dünya-

sına, ümumiyyətlə, bütün dünyaya ciddi təsir göstərirdi.

Bunu daha dəqiq və düzgün qavramaq üçün bölgədəki dövlətləri, onları idarə eləyən və dünya miqyasında özünəməxsus yerləri olan böyük şəxsiyyətləri yada salmaq, onlar haqqında müəyyən bilgilərə malik olmaq labüddür. Bunu nəzərə alaraq Qaraqoyunlular və Qaraqoyunlu Dövləti, Ağqoyunlular və Ağqoyunlu Dövləti, Əmir Teymur, Yıldırım Bayazid, Qara Yusif və Uzun Həsən haqda bəzi məlumatları hörmətli oxucularımızın nəzərinə çatdırmağı lazım bildik. Hər şeydən əvvəl qeyd edək ki, həm Qaraqoyunlular, həm ağqoyunlular, həm də siz, ulu Borçalı, Əziz Göyçə və Qaraqoyunlu, eyni soykökdənsiniz, hamınız Oğuz türklərisiniz və eyni bölgədə məskunlaşmışsınız. Milli mənsubiyyətcə heç bir fərqiniz yoxdur. Ağqoyunlular adlananlar bölgənin təxminən batısında, Qaraqoyunlular isə doğuşunda yaşayıblar.

Həm Qaraqoyunlulara, həm də Ağqoyunlulara XIV əsrin ortalarında müxtəlif müstəqil bəyliklər daxil idi. Sonralar, XIV əsrin axırlarında ikisi də, bəzi bəylikləri birləşdirərək, möhkəmlənmiş və müstəqilliklərini elan etmişlər.

Məsələn, 1388-ci ildə Qaraqoyunluların ərazisinə doğru irəliləyən Əmir Teymurun ordusu ilə Qaraqoyunluların başçısı Qara Məhəmməd savaşa girmiş, onu dayandıra bilmiş və Təbrizi tutaraq, mərkəz elan etmişdir.

1389-cu ildə Qara Məhəmməd öldükdən sonra yerinə oğlu Qara Yusif keçmiş və birliyi daha da gücləndirmişdir. Qara Yusif də atası kimi həmişə Əmir Teymura düşmən gözü ilə baxmış və ona əks mövqedə dayanmışdır. O, Osmanlılar və Əhməd Cəlayirlə yaxın münasibətlər yaratmış, onlardan Əmir Teymura qarşı istifadə etməyə çalışmış və bunun üçün münasib məqamı gözləmişdir.

O zamanlar Ağqoyunlular, Qaraqoyunlulardan fərqli siyasət yeridir və əks mövqelərdə dayanırdılar. Ağqoyunluların başçısı Osman bəy Misir sultanı ilə müqavilə bağlayıb, 1399-cu ildə Qarabağa, sonra isə Suriyaya hücuma keçən Əmir Teymura böyük kömək göstərirdilər. Eyni zamanda, Ağqoyunlular tez-tez Qaraqoyunlularla da vuruşurdular.

Eyni ərazidə yaşayan eyni bir xalqın, eyni millətin iki

müxtəlif bölgədəki müxtəlif, bir-birinə əks mövqeli münasibəti çox qabarıq şəkildə özünü biruzə vermirmi, əziz Borçalı, doğma Qaraqoyunlu ? Bu fərqli mövqe onların birliyinin pozulmasına, qüvvələrin parçalanmasına və mövqelərin zəifləməsinə səbəb olmalı idi, ulu Göyçə, oldu da.

Əmir Teymur Qaraqoyunlunu və İraqı zəbt etdi. Qara Yusif və Əhməd Cəlayir qaçıb Osmanlıya sığındılar. Əmir Teymurdan qaçmaq isə heç kəsə müvəffəq olan iş deyildi.

Əlbəttə, bu Əmir Teymurun ürəyincə ola bilməzdi. Ona görə də düşmənlərinə qarşı müvafiq ölçü götürməliydi.

Bu və digər daha ciddi səbəblər nəticəsində 1402-ci ildə bütün Türk dünyası üçün ən dəhşətli faciə, dünyanın iki nəhəng Türk fatehi, böyük Türk hökmdarları Əmir Teymurla Yıldırım Bayazid arasında amansız müharibə, ancaq özümüzə ziyan gətirən dəhşətli vuruş baş verdi. Bir-birinə qənim kəsilən bu iki nəhəng Türk oğulları niyə, nə məqsədlə vuruşurdular, vuruşmağa haqları vardımı, başqa çıxış yolu yox idimi? Kim idi Əmir Teymur və Yıldırım Bayazid, niyə özlərindən bu qədər razı idilər, nəyə arxayın idilər, niyə biri özünü o birisindən çox üstün tuturdu? Öz qüvvələrinə, yenilməz güclərinə inam necə yaranmışdı onlarda?

Hər bir Türkün, o cümlədən bizim də onlar haqda tarixi həqiqətləri və yuxarıdakı sualların düzgün cavabını bilməyimiz çox vacibdir. Bu bizə haqqı nahaqdan ayırmağa, kimin haqlı, kimin haqsız olduğunu müəyyənləşdirməyə kömək edər. Həqiqəti üzə çıxarmaq üçün isə həm Avropalı, həm də Asiyalı tarixçilərin yazdıqlarına müraciət etmək lazımdır.

Tarixçilər isə onlar haqda belə yazırlar, ulu Qaraqoyunlu.

Teymur 1336-cı ildə Səmərqənd yaxınlığındakı Keş şəhərində doğulmuşdur. Hələ çox gənc yaşlarından at minməyi xoşlayır, məharətlə qılınc oynadır və ox atmağı gözəl bacarırdı. Atdığı ox üzükdən keçirdi. Böyük gücə malik pəhləvan idi.

Yürüşlərin birində at büdrəyib yıxılaraq Teymurun qıçını sındırdığına görə axsayırdı. Odur ki, ona Topal Teymur, Teymurləng, Avropada isə Tamerlan deyirdilər.

Böyük alimlərdən dərs alan, oxumaqla ciddi məşğul

olan, geniş dünyagörüşli idialist idi, əmir Teymur.

Müxtəlif elmləri mənimsəmişdi. Dünya, Türk və İslam tarixini yaxşı bilirdi.

Elmin, sənətin vurğunu olmaqla bərabər, onun ən böyük qorucusu idi.

Alimləri sevir, qayğılarına qalır, layiqincə qiymətləndirirdi. Onlarla görüşdükdə ayağa qalxar, papağını çıxarar və böyük hörmət göstərərək, özü onların qarşısına gəlirdi.



Əmir Teymur

Amma, Suriyadakı əhvalat çaşdırmışdı çoxlarını. Hadisə belə olmuşdu:Suriyaya hücum edib az bir müddətdə onu zəbt eləyən Əmir Teymur Şam (indiki Dəməşq) şəhərinə girmək və şəhəri dağıtmaq istəmədiyinə görə, ordunu şəhər kənarında saxlayaraq, şəhərdən məlumat gözləyirdi. Vuruşun fayda verməyəcəyini yaxşı başa düşən ölkə başçısı başını götürüb qaçmışdı. Şəhər əhalisi təlaş içində idi. Qan tökülməməsi məqsədi ilə vuruşsuz təslim olmğa üstünlük verildiyinə görə, alimlərdən, şəhərin adlı-sanlı sakinlərindən ibarət bir dəstə elçi Əmirin yanına göndərilir.

Əmir Teymur elçiləri öldürür, sonra isə şəhərə girərək, əhaliyə divan tutur. Bu gözlənilməz hadisənin səbəbini Əmir Teymurdan soruşduqda belə cavab vermişdir:

Mən şəhərə girmək, qan tökmək istəmirdim. Gözlədim. Hüzuruma alimlərdən ibarət bir dəstə ağ kəfənə bürünmüş elçilər göndərdilər. Alim olduqlarını eşitdikdə ayağa qalxdım, papağımı çıxarıb, onlara tərəf getdim. Bununla, alimlər, sənətkarlar və müxtəlif sahənin adlı-sanlı insanları olduqlarına görə onlara sayqılarımı bildirmək istədim. Əvəzində nə gördüm? Onlara olan münasibətimi anlamaq, qiymətləndirmək əvəzinə, bir sürü itaətkar köpək kimi yerə yıxılaraq, ayağımı öpməyə, yalamağa başladılar. Sonra şəhərin açarını təqdim edərək, bütün şəhər əhalisinin itaətimə veriləcəyini,

bütün qadınların isə cariyələrim olcağını vəd etdilər.

Siz özünüz nəticə çıxarın. Yaltaq, ikiüzlü, məddah alimlərə nə münasibət bildirməli idim? Onları öldürdüm.

Aliminə höməti olmayan xalqın hörməti olmaz. Belə xalqa nə etməli idim? Bir damla qan tökmədən, diri-diri torpağa basdıraraq, divan tutdum.

-Allah sənə rəhmət eləsin ulu Fateh! Bir göz qırpımında ölkənin bütün qadınlarını, o cümlədən, yəqin ki, öz qadınlarını, ana və bacılarını cariyə etməyə hazır olan bu insanabənzərlərlə başqa cür davranmaq sənin kimi dahi bir türkün, əlçatmaz qeyrət sahibinin ad-sanına yaraşmazdı.

Əhsən sənin böyüklüyünə!

Səmərqənddə bir tarixçi alimin dilini kəsdirdiyinin səbəbini soruşduqda isə böyük fateh bunları əlavə edir.

Suriyada, Şam şəhərində bir nəfər yanıma gəlib, tarixçi alim olduğunu, Türk dünyasının, Türk xalqının tarixini yazmaq istədiyini, lakin lazımı şəraitin olmadığını bildirdi. Bu sahədə ona yardımçı olmaq məqsədi ilə özümlə birlikdə Səmərqəndə gətirdim. Ona şərait yaradılmasını tapşırdım .

Səmərqəndin məşhur alimləri, şairiləri, yazıçıları, sənətkarları ilə tanış oldu, kitabxanalardan istifadə etmək imkanı qazandı.

Bəs o nə etdi ?

Yaradılan şəraitdən istifadə etmək, verdiyi sözə əməl etmək və faydalı bir iş görmək əvəzinə, mənim isti münasibətlərimdən sui istifadə etdi. Yanıma gələrək, yerinə yetirdiyi işi təqdim etmək əvəzinə, dilini işə saldı və az bir müddətdə varlanmaq, böyük imtiyazlara sahib olmaq arzusunda olduğunu bildirdi.

Nə etməliydim ? Görk olsun deyə dilini kəsdim, Ona görə ki, mənim heç bir əskərim döyüşdən əvvəl məndən mükafat istəməyib və istəməz də.

Belə bir alimin dilinin kəsilməsinə sən necə baxırsan və nə qiymət verirsən, əziz oxucu ?

Böyük ad-sana sahib olub, hər yerə soxulmaq imkanı əldə eləyən, bir dəfə də olsun sənin adını dilinə gətirməyən, dadına yetib, ününə çatmayan, pul kisəsindən və parıltılı vil-

lalarından başqa heç kimi və heç nəyi görməyən və görmək istəməyən belə alimlər haqda sən nə tədbir görərdin, ulu Borçalı, sən nə qərar verərdin doğma Qaraqoyunlu? Deyin görək Əmir Teymur haqlıdır, ya haqsız?

Bəli, aman diləyənin dostu, yardımçısı, müttəfiqi, millətinin təəssübkeşi, müdafiəçiəsi, düşməninin başının bəlası idi Topal Teymur .

Şair kimi dəyərli şair omasına baxmayaraq, fars şairi Firdovsi daxili hisslərə qapılaraq, millətlə bağlı olan bütün əsərlərində qeyri-səmimi, yanlış mövqe tutmuş, farsı qalib kimi qələmə alaraq tərifləmiş, türkü isə pisləmişdir.

Haqlı olaraq bunu qəbul edə bilməyən Fateh İrani zəbt etdikdən dərhal sonra Firdovsinin məzari üstə gedərək: Qalx. qalx da, hər sətirində pislədiyin o məğlub türkü indi gör! demişdi Əmir Teymur.

Savaş, döyüş üçün doğulmuşdu. Müharibə üçün yaranmışdı,onun strategiyası və taktikasını yaxşı mənimsəmişdi Əmir Teymur.

On iki yaşında savaşa qatılaraq, cəmisi üç yüz döyüşçüdən ibarət bir dəstəylə, on minlik ordunu yenmiş və böyük strateq olduğunu təsdiqləmişdi bu qeyri adi insan.

İyirmi yeddi səfərə çıxmış, iyirmi yeddi ölkəyə hücum edərək, hamısını məğlub etmiş, iyirmi yeddi xaqana baş əydirmiş, diz çökdürmüş və hamısının başçısı, hökmdarı olmuşdu Əmir Teymur.

Bu ölkələr və bölgələr siyahısına Turan, iran, Rum (Anadolu), Suriya, Misir, İraq, Azərbaycan, Tatarıstan, Ermənistan, Gürcüstan və Hindistan kimi böyüklü, kiçikli müxtəlif ölkələr daxildir, əziz oxucu.

Xəritəyə bax və əmir Teymurun böyüklüyünü dərk et.

Onun haqda dünyada bir-birinin əksi olan müxtəlif fikirlər mövcud olmuşdur. Günahlarının savabından çox, zülmünün ədalətindən böyük olduğunu deyənlər də var, əksinə fikir söyləyənlər də az deyil. Bütöv şəhərləri yandırıb, yaxdığına görə qınayanlar da var,haqq qazandıranlar da. Bəzi müharibələrə, o cümlədən sultan Bayazidlə müharibəyə görə onu günahlandıranlar da var, eyni zamanda, elə həmin mü-

haribənin başlanmasında təqsirsiz olduğunu sübuta yetirənlər də çoxdur. Əlbəttə, Teymur kimi böyük fateh haqda qısa və birmənalı fikir yürütməyin mümkünsüzlüyü təbiidir.

Məsələn, bəzi Türk dövlətlərini, o cümlədən Cağatay xanlığını hərc-mərclik, intiriqalar bürüdüyü, ölkənin sarsıldığı və fəlakətə uğradığı məqamda da Əmir Teymur yenilməz bir güc, ilahi bir qüvvə kimi meydana girmiş və intriqaları yaradıb, ölkəni fəlakətə sürükləyənlərin yahudi tüccarları və xristian missionerləri olduğunu, onların bir çoxlarının Avropa krallarına cəsusluq etdiklərini öyrənmişdir.

Buna görə də o xristian missiyonerlərini Hindistandan qovaraq, onların fəaliyyətinə son qoymuş, müsəlmançılığın yayılmasına şərait yaratmış və ölkəni məhv olmaq təhlükəsindən xilas etmişdir.

Əlbəttə ki, buna bənzər fəaliyyətinə görə, Əmir Teymuru xristianlar sevməmişlər. Bütün müsəlman dünyasını sevən və ağıla-gəlməz güc sahibi olan bu böyükt Türkü necə sevsin xristian?

Onu da əlavə eləmək yerinə düşər ki, böyük Teymur qayğıkeş ata, dəyərli baba olmuşdur. Övladlarının və nəvələrinin təlim-tərbiyəsinə ciddi fikir vermişdir. Təsadüfi deyil ki, Əmir Teymur dünyanın ən böyük alimlərindən biri olan, ayın ən geniş kraterlərindən birinə adı verilmiş və ay atlasında soyadı əbədi həkk olunmuş dahi Türk astronomu Uluq Bəyin babası, alim hökmdar Şahruhun isə atasıdır.

İndi də Yıldırım Bayazid haqqında bəzi açıqlamalara diqqət yetirin, hörmətli oxucular .



Yıldırım Bayazid

Yıldırım Bayazid Sultan II Muradın oğludur. Onun atası Avropaya hücum edərək, əvvəlcə Bolqarıstanı, sonra isə 20 iyun 1489-cu ildə Serbstanı tutmuş və Balkanı ələ keçirməklə Anadolunu imperatorluq halına gətirmişdir. Həmin vuruşlarda Yıldırım Bayazid də iştirak etmişdir. Çox təəssüflər olsun ki, Sultan Murad qələbəni bayram elədiyi

cün qətlə yetirmişdir. Bu faciə tarixi qaynaqlarda belə təsvir edilir.

Sultan Murad öz ordusu ilə birlikdə qələbə gününü bayram etmək üçün tədbirlərə hazırlaşırdı. Bu zaman bir nəfər qaça-qaça sultanın olduğu yerə getmək və onunla görüşmək istədi. Kim olduğu məlum olmayan bu adamın qarşısını kəsib, sultanın yanına getməyə icazə vermədilər. O isə müsəlmanlığı qəbul etdiyini, Sultanla görüşmək və ayaqlarını öpmək arzusunda olduğunu söyləyərək, hönkürtü ilə ağladı. Bu hönkürtünü eşidən Sultan ona icazə verilməsini əmr etdi. Buraxdılar.

Həmin adam yaxınlaşıb guya Sultan Muradın ayağını öpmək istədiyinə görə yerə əyilir və qoltuğunda gizlətdiyi xəncəri çıxardaraq Sultanın ürəyinə sancır. Sonra məlum olur ki, bu adam döyüşdə öldürülmüş Serb kralının kürəkənidir. Onu tikə-tikə doğradılar. Amma artıq gec idi, Sultanın vəziyyəti get-gedə ağırlaşırdı. Öləcəyini hiss eləyən Sultan Murad oğlanlarını, nəvələrini və əyanlarını yanına çağıraraq, son sözünü dedi, qısa və aydın bir vəsiyyət etdi.

O, vəsiyyətində gözü görə-görə Balkanları ələ keçirdiyinə xoşbəxt olduğunu, şəhid olub Allahın dərgahına qovuşacağına görə məmnun qaldığını, milləti qarşısında üzü ağ, alnı açıq olduğunu bildirdi və əbədiyyətə qovuşdu.

Yıldırım Bayazid belə bir hökmdarın oğlu idi, ulu Borçalı, ulu Göyçə, ulu Qaraqoyunlu.

Onun yerinə Yıldırım Bayazid keçdi. Onda Bayazidin 29 yaşı var idi.

Yıldırım adı ona atasının sağlığında verilmişdi. Çünki ildırım sürəti onun xarakteri idi, Doğrudan da ildırım sürətli yaşadı, ildırım sürəti ilə zəfərlər qazandı, ildırım sürətilə sevdi, ildırım kimi çaxdı, gurladı və ildırım kimi də düşdü.

Sultanlıq taxtına qalxandan sonra Yıldırım Bayazid Serb Kralının yerinə kralın oğlunu təyin elədi, qızını isə aldı. Olivera adlı bu qızı o, çox sevirdi və özü ilə hər yerə aparırdı.

Yıldırım az bir müddətdə Ruminiyanı, Bosniyanı, Macarıstanı  məğlub etdi. Anadolu bəyliklərini Osmanlıya birləşdirdi, Çanaqqalanı tutdu və istanbula yol açdı Məqsədi İstan-

bulu ələ keçirmək, onu türkün etmək idi.

O dövrdə İstanbulda türklər yaşamırdı. Ona görə də orada türklərin məskunlaşmasını təmin etmək və tədricən sayını artırmaq məqsədi ilə Yıldırım Bayazid Bizans imperatoruna müraciət etdi. Müraciətdə yazılmışdı:

Konstantiniyyədə (İstanbulda) bir Türk məhəlləsi istəyirəm, amma, elə bir türk məhəlləsi istəyirəm ki, özünün sərbəst hərəkət etmək imkanı, məscidi və müstəqil məhkəməsi olsun.

Sultanın məqsədini yaxşı başa düşən imperator razı olmadı. Ancaq Yıldırım Bayazid güc tədbiq eləyərək, dörd dəfə İstanbulu uzun müddət mühasirəyə almaqla, imperatorun əzmini qırdı və razı olmağa məcbur etdi.

Yıldırım Bayazid belə hökmdar, belə türk idi.

Yıldırım Bayaziddən qorxuya düşən bir çox Avropa ölkələrinin başçıları öz aralarında gizli danışıqlar apararaq birləşib,Osmanlıya hücum etmək, onu əzmək və bir yolluq məhv etmək planı hazırlamağa başladılar. Avropa dövlətlərinin birgə hazırladığı bu planı öyrənən Sultan onlara xitabət bir müraciət etdi: Gedin, daha çox müttəfiq və daha böyük ordularla qarşıma çıxın ki, qazanacağım şan və zəfər daha böyük olsun.

Elə də oldu, ulu Borçalı. doğma Qaraqoyunlu. Macar, Alman, Fransa, Belçika, İsveçrə, İngiltərə və İspaniyanın 130 minlik ordusu 1396-cı ildə Osmanlıya hücuma keçdi. Xaç ordusunun yüz mini öldü, on mini əsir düşdü, iyirmi mini isə qaçdı.

Yıldırım Bayazid bütün türk dünyasının varlığı naminə, tayı-bərabəri görünməmiş tarixi bir qələbə çaldı. Avropa ölkələrinin birləşmiş ordusunun Fransalı komandanı da əsir düşdü. Əvəzində xeyli qızıl alaraq, həmin komandanı və 300 fransız əsirini azad edərkən Yıldırım onların üzünə baxaraq bu sözləri dilinə gətirdi:

- Mən savaş və zəfərlər üçün doğulmuşam. Məndən irəlidə olmağı arzulayanlar daim məndən geridə qalacaqlar.

Belə hökmdar idi Yıldırım Bayazid.

Yıldırımın növbəti arzusu 1399-cu ildə İstanbulu ələ ke-

çirmək idi. Amma, Teymurun Qərbə tərəf irəliləməsi mane oldu və nəinki Türk dünyasının, ümumiyyətlə, bütün dünyanın iki ən böyük fatehləri arasında toqquşma, narazılıq yarandı. Narazılıq böyüyərək tarixdə “Ankara savaşı” adlanan müthiş müharibə ilə nəticələndi. Bir çox tarixçilər və tarixi faktlar Əmir Teymurla Yıldırım Bayazid arasındakı “Ankara savaşı” na Qaraqoyunluların səbəb olduğunu göstərirlər. Söhbətimizin davamı bu haqda olacaq, ulu Borçalı, əziz oxucular.

Yıldırım Bayazidin Anadoluda ələ keçirdiyi Türk dövlətlərinin bəylərinin bəziləri Teymura, Teymurun işğal etdiyi Türk dövlətlərinin bəzi bəyləri isə Bayazidə sığınmışdı. Onlardan hər biri digərinə qarşı yardım istəyirdi. Bu kiçik Türk dövlətlərinin bəyləri dünyanın ən güclü iki Türk dövlətinin qüdrətli iki Türk xaqanını bir-birinə qarşı qaldırmaq üçün əllərindən gələni edirdilər.

Yıldırım Bayazid xaçlı ordusunu məğbul etmiş, min ildən artıq bir zamandan bəri hökm sürən Bizans imperatorluqlarını vergi ödəməyə məcbur etmiş, Anadolunun hakimi olmuşdur.

Bütün türklərin xaqanı olduğunu söyləyən Teymur isə Hindistan Türk imperatorluğunu ələ keçirmiş, daha neçə dövlətləri itaət altına alaraq, yenilməzliyini göstərmişdi.

Hər iki Türk xaqanı öz əməllərinə inanır, qüvvəsinə güvənirdi.

Yıldırım Bayazid Anadolu bəyliklərindən əsgər toplayırdı. Bəzi bəylər Yıldırımın ordusuna qatılmaq istəməyib, Səmərqəndə,Teymurun yanına gedərək Yıldırıma qarşı təxribat aparmaqla məşğul oldular. Teymuru ona qarşı qaldırmağa çalışdılar. Lakin, həmin bəylər Yıldırım barəsində nə qədər xoşagəlməz fikirlər söyləsələr də, onun böyüklüyü qarşısında aciz qalaraq, igidliklərini də etiraf etməyə məcbur olurdular.

Teymur onları bir neçə dəfə dinlədikdən sonra bir dəfə fikirlərini belə açıqladı:

Deyirsiniz ki, Yıldırım igid bir qazidir, sonra isə özünüzün günahsız olduğunuzu söyləyirsiniz. Xanlar günahsız kimsəni incitməzlər. Sizi incitmişsə, bunun siz dediyinizdən kənarda gerçək bir səbəbi vardır. O sizdən əsgər istədi, siz də

razı olmadınız, tədbirə hörmət göstərmədiniz, düşünürəm ki, yalan söyləyirsiniz. Fatehin onları günahlandırmasına, onların səmimiyyətlərinə etibar etməməməsinə baxmayaraq, Türkmən bəylərindən heç biri geri dönməyib, Teymurun yanında qaldılar və Yıldırımı pisləməkdə davam etdilər. Onlar əsgər vermədiklərini gizlədilər, Ancaq Sultanın sarayda Serb qızı ilə zövq aləmlərinə daldığını, içkiyə aludə olaraq çox içdiyini, ölkədə əxlaqsızlığın və rüşvətin geniş yayıldığını söylədilər. Söylədiklərindən doğru olanları da var idi.

Doğrudan da Bursa sarayında Yıldırım Bayazid bu Serb kraliçası ilə zövq və səfaya dalmaqda idi. Onun hər dediyinə əməl edirdi. Yıldırıma şərabın dadını və sərxoşluğun alçaldıcı zövqünü öyrədən o idi. Bütün bunlar əyanların ondan soyumasına və üz döndərməsinə səbəb olurdu.

Teymura sığınan Türkmən bəyləri deyilənləri daha da şişirdərək, ona təsir etməyə və Bayazidə qarşı qaldırmağa çalışırdılar. Onlar aranı qarışdırdılar. Anadolunun fəlakətini hazırlayan da onlar idi, ulu Borçalı, doğma Qaraqoyunlu, ulu Göyçə.

Fəqət, Yıldırımla Teymurun savaşmalarına əsl səbəb olanlar isə Əhməd Cəlayirlə Qara Yusif, daha doğrusu, onlarla bağlı Teymurla Yıldırım arasındakı yazışmalar, məktublar olmuşdur.

Əmir Teymurun Anadolunu fəth etmək və orada qalmaq məqsədi yox idi. Tarixən həmişə böyük Türk xaqanlarının demək olar ki, hamısı ərazisi, əhalisinin sayı və təbii zənginliklər baxımından ən böyük və ən maraqlı ölkə olan Çini fəth etmək istəmişlər. Teymurun istəyi də bu idi. Fəqət, Çin səfərinə çıxdığı zaman Yıldırım kimi bir hökmdarın bu fürsətdən istifadə edərək, Qafqaza, Azərbaycana və İraqa hücum etməyəcəyinə əmin deyildi. Teymurun narahatçılığına təkzibedilməz dəlillər var idi, istəkli oxucular.

Doğrudan da Bayazid Teymura qarşı Misirlə ittifaq bağlamaq yollarını axtarırdı. Bundan əlavə o, Qaraqoyunlu Qara Yusifi Anadoluya, Əhməd Cəlayiri isə İraqa göndərərək, Teymurun tabeliyində olan bölgələri geri almaq tapşırığı vermişdi.

Vəziyyətdən çıxış yolu tapmaq, Yıldırımla aranı düzəlt-

mək, Çinə səfər etmək üçün arxadan arxayın olmaq lazım idi. Bu məqsədlə Əmir Teymur Qarabağda olarkən, şahzadələri və komandanları bir yerə toplayıb, geniş bir hərb divanı qurdu və Anadoluya səfər etmək fikrini açıqladı. Teymurun oğulları, nəvələri və komandanların əksəriyyəti açıq şəkildə bu fikrə qarşı çıxdılar. Onlar Osmanlıların xristianlarla mübarizədə böyük bir Türk xanədanı olduğunu, onu əzməyin doğru olmayacağını, hər iki dövlətin Türk, müsəlman və eyni məzhəbdən olduğunu söylədilər.

Teymur onların sözlərinin doğru olduğunu dedi və özünün də elə düşündüyünü təsdiq etdi. Amma, arxayın olmaq və Yıldırıma inanmaq üçün bir məktub və elçilər göndərərək onunla düşmən olan Əhməd Cəlayiri və Qara Yusifi təslim etməyi və ya öldürməyi, yaxud da, Osmanlı torpaqlarından qovmağı tapşırdı. Tarixi əhəmiyyətini və ondan çıxan nəticəni nəzərə alaraq həmin məktubun məzmununu olduğu kimi, ulu Borçalı, əziz Qaraqoyunlu və Göyçə, sizin, eyni zamanda, həm də hörmətli oxucuların nəzərinə çatdırmağı məqsədəuyğun hesab edirəm.

Əmir Teymur məktubda belə yazırdı.

“ Ey diyari Rumda Məlik olan Bayazid .

Bilirsən ki, mən mənsur və müzəffər bir Sultani Cədidəm. Bir çox insan bizə quldur. Bunu bil ki, Qara Yusif və Sultan Əhməd qılıncımızın kəsərindən və əskərlərimizin heybətindən qaçdılar. Sənə məlumdur ki, bu adamlar kafirdilər. Öz etibarını zədələmək istəmirsənsə, onları məmləkətinə qəbul etmə. Onların gəldikləri yerə uğursuzluq və təhlükə də gəlir. Belə adamlar Türkiyə dövlətinin qanadları altında himayə görməməlidir. Onlara himayədən çəkinin, yurdunuzdan qovun, harada tapsanız öldürün. Əks təqdirdə nifrətimiz üzərinizə olacaqdır. Bizə qarşı çıxanların aqibətini eşitmişsiniz. “Savaşı göz önünə gətirməyin. Vəssalam”.

Əmir teymurun məktubu əmr dili ilə danışan, müəyyən qədər kiçildici məktub idi. Yıldırım Bayazid isə bu məktuba həddən artıq alçaldıcı, demək olar ki, lənətləndirici və ədəbsiz sayıla bilən məktubla cavab verdi. Həmin məktubun da məzmununu nəzərinizə çatdıtrırıq, istəkli oxucular.

"Ey Teymur adı ilə anılan qudurmuş köpək! Ey kafirlərdən daha kafir olan Teymur. Məlumun olsun ki, məktubunu oxudum. Ey zavallı! Məni bu sözlərləmi qorxudursan? Ordumuzun nizamını sən bilirsən. Hərb və savaş bizim sənət və adətimizdir. Əgər sən bir köpək kimi boğuşmaq istəsən qoy olsun. O zaman Allah dediyi olar. Bu məktubu göndərdikdən sonra savaş meydanına gəlməsən, arvadlarının kəbini boş olsun. Allahın nələti də sənin və sənə hörməti olanların üzərinə olsun"

Bu iki böyük hökmdarların bir-birinə yazdışqları məktubların məzmununa əsasən özlərinə qiymət verin və müvafiq nəticələr çıxarmağa çalışın. Belə etsəniz görərsiniz ki, Teymurun yazdığı məktuba nisbətən, Yıldırımın yazdığı məktub həqarət və nifrətlə, alçaldıcı və təhqiredici ifadələrlə həddən artıq dolu olan məktub idi.

Onların bir-birini, xüsusən də Bayazidin Əmir Teymuru təhqir etmyə haqqı yox idi. Əvvəla, heç olmasa ona görə ki, Teymur Yıldırımdan 24 yaş böyük idi. Bu məktub yazılan vaxt Yıldırımın 42, Teymurun isə 66 yaşı var idi.

Yəqin ki, siz də razı olarsınız ki, cavan olan Yıldırım Bayazidin qoca Əmir Teymuru "qudurmuş köpək" adlandırması adi etika normalarına sığmırdı, diplomatik danışıqlara uyğun gəlmirdi və türk xalqının mentalitetinə müvafiq deyildi. Axı ikisi də həddən artıq zəhmli hökdar olmaqdan başqa, ədəbiyyatı, incəsənəti, tarixi sevən, yeri gəldikdə isə incə və kövrək duyğularla yaşayan, gözəllikdən zövq alan insanlar idi. Yıldırım özü də atası Sultan Murad kimi şer yazırdı.

Oxucularda yarana biləcək marağı nəzərə alaraq, Sultan Bayazidin yazdığı qəzəllərdən birini nəzərinizə çatdırmaqla deyilənləri sübuta yetirmək yerinə düşər:

Yarı zindi zəmanədir sandım,
Bəhsi vəsli, təranədir sandım.
Əhli hicrana, fitneyi əğyar
Ortada bir bəhanədir sandım.
Göz ucuyla kin , kin baxışı,
Dil alıb qəsti canadır sandım.
Hişmi ilə yaralanmış könülü,

Yıldırımdan nişanədir sandım.

Hicran əhlinə əğyarın fitnəsinin ancaq boş bəhanə olduğunu, ayrılığın, həsrətin alnına yazıldığını, yaralanmış könülün Yıldırımdan nişanə olduğunu duyan, qəbul eləyən və incə şer dili ilə poetik lövhə yaradan Sultanın belə bir məktub yazmağa mənəvi ixtiyarı yox idi.

Mənim bu fikrimi hörmətli oxucular sadəlövh yanaşma kimi qəbul eləyə bilərlər. Qoy olsun. Mən belə düşünürəm

Amma nə etməli, güc ağıla, kobudluq zərifliyə, düşmənçilik hissi dostluq duyğularına, ümumiyyətlə şər xeyirə üstün gəldi və belə bir cavab məktubunun yazılmasına səbəb oldu.

Deyilənlərə görə məktubda yazılmış “qudurmuş köpək” kəlməsini oxuyan Teymur cəld ayağa qalxaraq əsəbi halda “Muradın oğlu qudurmuş” deyə haykırmış və özünə yer tapa bilməmişdir.

Hörmətli oxucular, sizin nə fikirdə olduğunuzu bilmirəm, amma məncə, çox əsəbi vəziyyətdə deyilmiş “Muradın oğlu qudurmuş” sözünün özündə belə, Yıldırımın atası mərhum Sultan Murada bir hörmət ifadəsi duyulur, onun böyüklüyünə qiymət verilir və elə böyük və qüdrətli bir sultanın oğlunun belə vəziyyətə düşməsinə təəssüf edilir.

Məktubdakı digər daha böyük təhqir Yıldırımın Teymura xitabən “səni cəzalandırmasam, hərəmimə girməyəcəyəm” deməsidir. Turklər və ümumiyyətlə, bütün müsəlmanlar üçün bundan artıq ədəbsizlik ola bilməz. Hətta bir-birinə heç bir hörməti olmayan, qatı düşmənçilik mövqeyində dayanan və insanlıq duyğularını çoxdan itirmiş olan adamlar belə, bir-birinin yataq otağından söz salmazlar.

Məktubdakı üçüncü ən böyük təhqir Teymurun adının üstündən qızıl hərflərlə Bayazidin öz adını yazdırması olmuşdur, istəkli oxucu.

Gördüyünüz kimi Qaraqoyunlu Qara Yusif və Cəlayirli Əhməd barədəki yazışmalar Əmir Teymur ilə Yıldırım Bayazid arasında savaşı qaçılmaz etdi. Bunu nəzərə alan hər iki tərəf sürətlə döyüş hazırlığına başladı.

Doğu Türk Xaqanı ilə bati Türk xaqanı, dövrün ən qüdrətli iki hökmdarı, zamanın ən möhtəşəm iki ordusu qar-

şı-qarşıya gələcəkdi.

Təəssüf ki, belə də oldu.

1402-ci ilin 28 iyununda, cümə sabahı, Ankara yamacında iki ordu doğrudan da, qarşı-qarşıya gəldi. Zaman belə bir qarışıqlıq, belə bir izdiham görməmişdi. İki cəbhədəki əsgərlərin ümumi sayı 500 minə qədər idi. Teymurun ordusunda Bayazidin ordusundan fərqli olaraq 30 döyüş fili də var idi. Boyunlarına xüsusi zınqırovlar bağlanmış bu döyüş filləri ön cərgədə dayanmışdı.

Anadolu Türk bəylərinin bir qismi Teymurun, digər qismi isə Bayazidin tərəfində idi.

Bəli, iki möhtəşəm ordu üz-üzə dayanmışdı. Bu iki ordu və başçıları biri-birindən nə ilə fərqlənirdilər və hansı oxşarlıqları var idi? Hər iki hökmdar dünyanın ən güclü hökmdarlarından idi, ikisi də türk idi, ikisi də türk döyüş taktikasının ustası idi. İkisi də zəbt etmək istədiyi qala divarları önündə vaxt itirməyi xoşlamırdı.

Hər iki tərəfin əskərləri türk idi, müsəlman idi, eyni dildə danışırdı. Hər iki tərəfin əskərləri eyni adla Məhəmməd (Mehmetçik ) adını daşıyırdı. iki tərəfin də savaş nəzəriyələri eyni idi. Kiçik fərqlər nəzərə alınmasa, hər iki tərəfin əsgərlərinin qiyafəsi də oxşar idi. Savaş başlayacağı səhəri hər iki tərəf eyni anda namaza durdu. İkisi də qalib gəlmək üçün dua etdilər. Axı kim kimə qalib gəlmək istəyirdi, nəticədə udan kim olacaqdı, uduzan kim?

Bu müharibə kimə xeyir gətirəcəkdi?

Əlbəttə, Türk dünyasından, türk xalqlarından başqa hamıya. Bütün bu oxşarlıqdan başqa vuruş meydanında həlledici rol oynayan amil də var idi. Bu, əsgərlərin döyüş istəyi, vuruşma həvəsi idi. Bu cəhətdən də hər iki tərəfin əsgərləri bir-birinə oxşayırdı. Əsgərlər yuxarıda göstərilən eynilikləri nəzərə alaraq, digər tərəfin əsgərləriylə amansızcasına vuruşmaq istəmirdilər. Buna onların mənəvi haqları var idi.

Buna görə də bati Türk əsgərləri Balkanlarda vuruşduqları kimi cəsarətlə, qəlbən, daxili tələbatdan gələn istəklə vuruşmaq istəmirdilər. Onlar haqlı idilər.

Çünki Türklər, balkanlarda yadlarla, dili-dilindən, dini-

dinindən olmayanlarla vuruşurdular, Balkanları özününkü etmək, düşmən sərhəddini Anadoludan uzaqlaşdırmaq istəyi vardı. Onlar bilirdilər ki, doğu türkləri ilə döyüş cihad döyüşü deyil və bu döyüşdə dünyasını dəyişənlər şəhid olmayacaqlar və şəhidlik zirvəsinə ucalmayacaqlar.

Çünki, özününkülərlə vuruşda, labüd olmayan ədalətsiz, haqq iş uğrunda baş verməyən döyüşlərdə həlak olanlar şəhid olmurlar.

Dünyada nələr olmur, ulu Borçalı, ulu Göyçə, ulu Qaraqoyunlu? Müharibə etməmək üçün nə qədər samballı səbəblər olsa da, bu amansız döyüş qaçılmaz edilmişdir. Ona görə də hücum əmri verildi, savaş başlandı.Sanki dünyanın bir yarısı o biri yarısının üzərinə düşdü. Tarix belə qalmaqallı, belə təzadlı savaş görməmişdi.

Yıldırım Bayazidin ordusunda döyüşən doğu Anadolu türkləri öz bəylərinin bir çoxunun Teymurun ordusunda görcək, tərəddüd etmədən vuruşun əvvəlindən onlar tərəfə keçdilər. Bu, Bayazidin ordusunu zəiflətdi.

Üstəlik, fil görməmiş atlar Teymurun ordusundakı fillərin özündən və zınqırovundan hürkərək qaçır, əskərlər isə vahiməyə düşürdülər. Bütün bunlara baxmayaraq döyüş davam edirdi.

Axşam düşdüyünə, həm də döyüşün sonuna yaxın olmasına baxmayaraq, Yıldırım qılıncını ataraq, ikiağızlı baltanı götürüb, böyük məharətlə vuruşurdu.

Əmir Teymur vuruş zamanı Yıldırımla ehtiyatlı olmağı, onu yaralamamağı, təhqir etməməyi və atdan düşürtməməyi tapşırmışdı.

Aman Allah! Savaşa səbəb olan, minlərlə insan qanının tökülməsinə bais olan, düşmən mövqeyində dayanan Yıldırımın nəinki ölməsinə, yaralanmasına, zədələnməsinə, hətta atdan düşməsinə belə qıymırdı Əmir Teymur. İnsan ölümünün adiləşdiyi, ehtirasların qızışdığı, vəhşiliyin cövlan etdiyi bu savaş meydanında, bütün bunlarla birlikdə, eyni zamanda, nə qədər ilahi duyğular və incə sentimentallıq var imiş, ilahi !

Sanki bu Əmir Teymur, dörd min adamı bir göz qırpı-

mında diri-diri torpağa göndərərək, bir dəfə də olsun "of" deməyən, əksinə haqlı olduğunu təsdiqləyərək elədiyindən qurur duyan o Əmir Teymur deyildi.

Yıldırımla birlikdə vuruşanlar ona, artıq döyüşməyin fayda verməyəcəyini, hələlik qaçıb qurtarmaq imkanı qaldığını dedilər. O, razı olmayaraq, qaçmaqdansa ölməyin daha üstün olduğunu söyləyir və vuruşmağa davam eləyir. Ancaq, vuruşma zamanı Yıldırımın atının ayağı sürüşüb yıxılır və yıldırımı da yıxır.

Bunu görən Çağatay xanı Mahmud xan üstünü kəsərək, onun Teymura yazdığı məktubundakı "o zaman Allahın dediyi olar" kəlməsini yadına salır və "Tanrı belə istədi " deyir. Bunu eşidən Yıldırım: "eləsə Tanrının dediyi olsun" kəlməsini dilə gətirərək, baltanı atır və yanındakılarla birlikdə əsir düşür. Bu savaşda Yıldırımın iki oğlu, qızı və arvadı Olivera da əsir düşür.

Beləliklə, sabahın erkən saatlarından axşama qədər davam edən bu müdhiş savaşın sonunda doğu Türk xaqanı Teymur, batı Türk xaqanı Yıldırım Bayazidə qalib gəlir. Ancaq bu, indiyədək onun çaldığı qələbələrin ən çətini, verdiyi itkilərin ən böyüyü, itirdiyi mənəvi zənginliklərin ən qiymətlisi idi.

Yıldırım məğlub oldu. Ancaq Yıldırım məğlub oldu ? Xeyr, bütün Türk dünyası, böyük Türk xalqı zəiflədi, əzildi. Dilim gəlməsə də, deməliyəm ki, bütün Türk xalqı məğlub oldu bu müharibədə. Teymur qələbə çaldımı bu müharibədə? Yox, Teymur özü öz üzərində qələbə çalmışdı. Udan da, uduzan da o idi. Uduzmağı udmağından qat-qat böyük idi Teymurun.

Mahmud xan Yıldırıma böyük hörmət və nəzakət göstərərək: "Buyurun Şahənşah,Teymurun müsavirisiniz, dedi və onu Teymurun çadırına gətirdi. Bu zaman Teymur oğlu Said Bahadırla şahmat oynayırdı. Oyun axıra yaxınlaşırdı. Yıldırımın gətirildiyini bildirmək üçün gələn adamın içəri girdiyi an ilə oyunda rəqibi olan oğlunun şahinin qalasını alması və Teymurun ucadan "Şah ruh" deyərək qışqırması bir oldu. Bu rəqibinin mat olması demək idi. ruh həmin vəziyyətdəki qa-

la daşının - filin adı idi. Bu qəribə təsadüfdən sonra Teymurun oğlu Said Bahadırın adı Şahruh olaraq anıldı və həmin adla tarixdə qaldı.

Bayazidi yuyundurub, təzə libas geyindirdikdən sonra Teymurun çadırına gətirdilər. Qərb türkoloqu A.de Lamartini bu hadisəni belə xatırlayır :

Teymur ayağa qalxaraq, Yıldırımı hörmətlə qarşıladı. Məğrur olmadı. Sultan Bayazidin də eyni dindən, eyni irqdən olduğunu, kafirlər diyarında necə şanlı qələbələr qazandığını bildiyinə görə, Teymur qazandığı zəfərdən hətta üzr diləyəcək durumuna gəldi.

Onu çadırın önündə öz yanında oturtdu. Yumşaq, mehriban bir səslə cəsarətini təriflədi, öz imperatorluğuna bərabər imperatorluğu yıxdığına görə üzüntü duyduğunu bildirdi.

Teymur Yıldırımın şərəfinə və həyatına toxunulmayacağını da qeyd etdi.

Xidmətçilər sərin ayran gətirdilər, Yıldırım içdi. Arada Teymur Yıldırımın üzünə baxaraq xəfifcə gülümsədi.

Bundan təsirlənən Yıldırım :

Ey Teymur, mənim fəlakətimə rişğənd etmə, xaqanlığı insanlara verən Allahdır, sənə verdiyi xaqanlığı sabah səndən ala bilər, dedi.

Bu sözün cavabında Teymur əlavə etdi:

Ey Bayazid, bu söz çox doğrudur. Sən rişxənd eləmirəm.Yalnız səni görəndə ağlıma bu gəldi:

Allah xaqanlara yaxşı diqqət vermir.Bu dünyanı sənin kimi bir kötürümə, mənim kimi bir topala buraxmış.

Yıldırım Bayaziddə xəstəlik vardı, bəzən dizi tutulur və çox çətinliklə yeriyirdi. Kötürüm dedikdə Teymur buna işarə etmişdir.

Yıldırımın çox üzgün olduğunu görən Teymur yenə yumşaq səslə :

Qəm yemə, adam sağ olsa, yenə dövlət tapar, dedi.

Söhbəti davam etdirərək birlikdə yemək yedilər. Söhbət əsnasında Teymur soruşdu: Ey Bayazid, mən sənin əlinə əsir düşsəydim, halım necə olardı ?

Yıldırım yalan söyləyən insan deyildi. Ona görə də necə

düşünmüşdüsə eləcə də cavab verdi:

Əgər mənim əlimə əsir düşsəydin, bir dəmir qəfəs düzəltdirib, səni içərisinə qoyacaqdım və bütün məmləkəti gəzdirərək, xalqa göstərəcəkdim.

Mən belə əhd etmişdim.

Teymur gülərək: Mən isə belə düşünmürdüm, dedi. Mən səni öldürməməyi qərara almışdım. Xeyir diləyən xeyir görər, şər diləyənsə şərə düşər. Mən yaxşılıq etməyi məqsəd qoyduğuma görə müzəffər oldum, deyə fikrini tamamladı, Əmir Teymur.

Yıldırıma nə arzu etdiyini soruşduqda o, oğlanlarını istədiyini,dedi. Yıldırımın iki oğlunu, sonra isə ən çox sevdiyi arvadı Serb qızı Oliveranı gətirdilər. Arvadının hələ müsəlmanlığı qəbul etmədiyini bilən Teymur əvvəlcə əsəbiləşdi, sonra isə onu müsəlman etdi.

Əmir Teymur Yıldırımın oğlanlarını yanına çağırıb, bəzi məsləhətlər, öyüd-nəsihət verdikdən sonra, atalarını sultan kimi qarşılamaq üçün hazırlıq görmək məqsədilə oğullardan birini Anadoluya göndərir.

Əsirlikdən azad olub, atasının yanından ayrılan oğul, deyilənlərə riayət etmək, atalarını qarşılamaq üçün hazırlıq görmək əvəzinə, digər qardaşları ilə birlikdə xam xəyallara düşərək, hakimiyyət uğrunda mübarizəyə və Əmir Teymura qarşı bir daha vuruşmaq məqsədilə ordu toplamağa başlayır.

Onların bu nankorluğu, oğulların xəyanəti, yaxşılığa qarşı etmək istədikləri yamanlıq, hər şeydən əvvəl bir ata, sonra isə mərd və sözünün ağası olan bir hökmdar kimi Yıldırım Bayazidi sarsıdır, sındırır.

Söhbətlərin birində Teymur Yıldırımdan soruşdu :

Oğulların mənim əleyhimə Anadolunu və Rumelini ayağa qaldırır. Hakimiyyətini qaytarsam, sənin hökmdar olmağına oğlanların razı olarmı ?

Əsirlikdən buraxıb, hakimiyyətimi bərpa etsəniz, onlara vəzifələrinin nə olduğunu başa salaram deyə cavab verdi, Yıldırım Bayazid. Bu cavabdan sonra Teymur söhbətini belə yekunlaşdırdı:

Cəsarət Sultanım! Səni Səmərqəndə aparıb paytaxtımı

göstərmək istəyirəm. Ondan sonra tabenə bir ordu verərək, hakimiyyətini bərpa edəcəyəm.

Əmir Teymurun Yıldırım Bayazidə “Cəsarət Sultanım”!- deyə müraciət etməsi, onun incə qəlbli böyük hökmdar olduğunu göstərmirmi? Belə müraciət etməsi hörmətə, sevgiyə layiq insanlara, o cümlədən hal-hazırkı məqamda düşmən mövqeyində dayanmış olduğuna baxmayaraq, Yıldırıma hörmət və sevgilər bəsləməsi onun müsbət keyfiyyətlərini bir daha təsdiq etmirmi, doğma Qaraqoyunlu ?

Hansı şəraitdə görüşmələrini nəzərə almasaq, yuxarıda deyilənlərdən belə nəticə çıxara bilərik ki, onlar düşmən, qalib və məğlub insanlar deyil, sanki uzun müddətli məcburi ayrılıqdan sonra Allahın həmin xoşbəxt günündə bir-birinə qovuşan, buna görə də xoşbəxt olan və məmnun qalan doğma, əziz qardaşlardırlar.

Teymur sözünün üstə duran, dediyinə əməl edən insan idi. Hər şey onun dediyi kimi olacaq idi.

Amma, oğulları arasında amansız taxt qovğasının başlandığını öyrənən Yıldırım çox üzüldü və ağır xəstəliyə düçar oldu.

Teymur müalicə üçün dövrün ən adlı-sanlı həkimlərini gətirdi. Müalicəsi İlə məşğul oldular, ancaq əlac olmadı.

Yıldırım Bayazid 600 il bundan əvvəl, 8 mart 1403-cü ildə, ömrünün 43-cü baharında dünyasını dəyişdi.

Teymur Bayazidin ölümünə ağladı, cənazə namazına durdu, oğlunun biri ilə Bursaya dəfn olunmağa göndərdi. Yıldırım orada özü tikdirmiş olduğu məsciddə dəfn edildi.

Bayazid öldükdən sonra oğlanları arasındakı taxt qovğası bəzi bəyliklərin öz müstəqilliklərni itirməsinə səbəb oldu.

Teymur isə çoxdankı arzusunu yerinə yetirmək üçün Çinə səfər etdi. Çinin sərhəddinə çatan zaman xəstələndi. Həkimlər ona öləcəyini açıq dedilər. Teymur özü də öləcəyini hiss edirdi. Ona görə də nəvələrini, əyanlarını, bütün yaxınlarını yanına çağırdı, vəsiyyətini etdi və 1405-ci ilin soyuq bir qış axşamı, 67 yaşında əbədiyyata qovuşdu.

Dünyanın ən böyük fatehlərindən, Türk dünyasının ən

zəhmli hökmdarlarından biri olan Əmir Teymur Səmərqənddə, Bayazidə göstərmək İstədiyi sevimli paytaxtında, vəsiyyəti nəzərə alınaraq, istəkli nəvəsinin yanında dəfn edildi.

Əmir Teymurun ölümündən sonra Teymurilər imperiyası da tədricən zəifləməyə və əvvəlki qüdrətini itirməyə başladı. Belədi bu çoxüzlü, etibarsız dünyanın işi. İndi bir daha aydın oldumu ki, bu möhtəşəm müharibənin başlanmasına və acı nəticəsinə səbəb qaraqoyunlular olmuşdur? Bunu nəzərə alaraq, bu hadisələrin gedişini daha ətraflı və geniş şərh etməyi lazım bildik. Məqsədimizə nə dərəcədə nail olduğumuzu isə hörmətli oxucular deyə bilərlər.

Yıldırım Bayazidin və Əmir Teymurun ölümü, Osmanlıların və Teymurilər imperiyasının zəifləməsi çoxlarının, o cümlədən Qaraqoyunlu Qara Yusifin də əl-qolunu açdı, fəaliyyət dairəsini genişləndirdi, məqsədlərini yerinə yetirmək üçün münbit şərait yaratdı.

Bundan istifadə edən Qara Yusif yenidən hakimiyyətə gəldi və itirdiyi bütün torpaqları 1406-cı ildə qaytardı. Bununla kifayətlənməyən Qara Yusif keçmiş müttəfiqi və yaxın dostu olmuş Əhməd Cəlayirə hücum edərək, özünü və oğlunu öldürdü və bütün İraqı ələ keçirdi. 1408-ci ildə Əmir Teymurun oğlu Miranşahı öldürüb, Teymuri qoşunlarını Azərbaycandan çıxartdıqdan sonra, Qara Yusif 1410-cu ildə Qaraqoyunlu Dövlətinin yarandığını elan etdi. Yenicə yaranmış Qaraqoyunlu Dövləti Kür çayının cənubunu, Gürcüstanın doğusunu, bütün İraqı və İranın quzeyini əhatə eləyən geniş əraziyə malik idi.

1412-ci ildə Qara Yusif Şirvanşahlara hücum edib, İbrahimi, ona köməyə gələn Şəki xanını və gürcü çarını məğlub etdi, çarı və 300 knyazı öldürdü, 1200 tümənlik mal aldıqdan sonra ona tabe olmaq şərti ilə İbrmhimi yenidən Şirvana başçı göndərdi.

Beləliklə Qaraqoyunlu Qara Yusif bütün Azərbaycanı və onun ətraf bölgələrini birləşdirərək, böyük və qüdrətli bir dövlət yaratdı .

Lakin o, qurduğu dövlətə uzun müddət hökmdarlıq edib, istədiyi kimi inkişaf etdirə, gücləndirə bilmədi. 1420-ci ildə

Qara Yusif Təbrizdə dünyasını dəyişərək, ömrünü sona verdi. Türk hökmdarlarının hamısı kimi, onun da çoxlu evladları var idi. Bu evladlardan beşi oğlan idi.

Təəssüf ediləcək və olduqca acınacaqlı haldır ki, bir çox Türk hökmdarlarının oğlanları bəzən onların sağlığında bilavasitə öz ataları üçün, çox zaman isə ataları öləndən sonra ölkə və millət üçün qarşısıalınmaz bəlaya, fəlakət və bədbəxtçilik mənbəyinə çevriliblər.

Bu dəfə də belə oldu. Qara Yusifin oğlanları arasında da hakimiyyət uğrunda mübarizə başlandı. Bu taxt qovğası düz on beş il, Əmir Teymurun oğlu Şahruh Təbrizi tutana qədər, yəni 1435-ci ilədək davam etdi.

Şahruh Qara Yusifin oğlanlarından ancaq Cahan şaha inandı və onu müəyyən şərtlərə tabe olmaqla, hakimiyyətə gətirdi. O şərtlərə görə Cahanşah sərbəst siyasət yeritməməli, Şahruha tabe olmalı idi.

Şahruh ölənə qədər, yəni 1447-ci ilədək belə də oldu. Şahruh öləndən sonra Cahan şah sərbəst siyasət yeridərək, ölkənin ərazisini güneydə Kirmana, quzeydə Dağıstana, doğuda Qəzvinə, batıda isə Mosula və Ərzincanadək genişləndirdi .

Cahan şah otuz bir il hökmdar oldu. Amma, hakimiyyətin son illərində oğlanlarından Həsənəli Azərbaycanda, Pirbudaq isə Bağdatda qiyam qaldıraraq, dövləti zəiflətdilər.

Yenə də evladların nankorluğu. Yenə də hakimiyyət davası. Yenə də müxtəlif dövrlərdə, müxtəlif türk ölkələrində baş vermiş tam oxşarlıq. Dağılmaqla, məhv olmaqla və yer üzündən silinməklə nəticələnən acı həqiqət !

Bu zəifləmədən istifadə edən Ağqoyunlu hökmdarı Uzun Həsən 1469-cu ildə Qaraqoyunlulara hücum etdi. Cahan şah öldürüldü və Qaraqoyunlu Dövləti dağıdıldı, məhv oldu. 59 il ömür sürən Qaraqoyunlu dövlətinin yerində cəmi 32 il yaşaya biləcək Ağqoyunlu dövləti yarandı.

Beləliklə eyni millətə, eyni məshəbə, dinə və dilə malik xalqın ərazisində ancaq başçısı və adı dəyişmiş yeni dövlət yarandı.


Yunus İmrə

Qaraqoyunlu, Göyçə, Borçalı ilə bağlı bəzi hadisələrindən söhbət açdığımız XIII - XIV əsrlər Türk dünyasına, ümumiyyətlə bütün dünyaya böyük şəxsiyyətlər, ölməz dühalar bəxş etmişdir. Belələri çoxdur. Ancaq, bunların, bu ulduzların arasında ən parlaq ulduz olan Yunus İmrəni yad etməmək mümkün deyil. Onun ruhunu şad edib, allahdan rəhmət diləmək hər zaman, hər birimizin evladlıq borcumuzdur, əziz oxucular. Təssüf ki, burada, Azərbaycanda, onun həyatı, yaradıcılığı, ədəbiyyatda yeri haqda lazımı səviyyədə təbliğat aparılmamış, əsil qiyməti sadə oxuculara çatdırılmamışdır.

Çox maraqlı, əfsanəvi ömür yolu keçmiş bu böyük türk, dahi babamız haqda bəzi məlumatları oxucuların diqqətinə çatdırmağın məqsədəuyğun olduğunu güman edirəm.

Yunus İmrənin həyatı haqda çox az şey məlumdur.Anadan olduğu,dünyasını dəyişdiyi və dəfn olunduğu il və yer haqda müxtəlif və mübahisəli fikirlər söylənilir. Anadoluda doqquz bölgədə, Azərbaycanda isə bir neçə rayonda Yunus İmrənin məzarı olduğu göstərilir. Həmin məzarların hər birinə böyük hörmətlə yanaşılır, hər birinə ehtiram edilir.

Buna səbəb nədir ?

Yunus İmrə böyük xalq şairi, əvəzsiz ozan və dahi bir dərviş kimi bütün Türk dünyasını dövrünün verdiyi imkanlar daxilində gəzib dolaşmış, o cümlədən, Azərbaycanda, deməli, doğma Qaraqoyunlu, əziz Göyçə və istəkli Borçalı, sizlərdə də olmuşdur. Siz onu sinəniz üstə gəzdirmisiniz, havanızdan uddurub, suyunuzdan içirdərək, oğul kimi bağrınıza basıb, ana nəvazişi göstərmisiniz.

Yunus İmrə harada olmuşsa, haraya onun mübarək ayağı dəymişsə, sonralar orada ən köhnə, sahibi bilinməyən məzarlardan birinin Yunus İmrəninki olduğu ehtimal edilmişdir.

Heç olmasa bircə dəfə göründüyü, çox az da olsa yaşadığı hər yerdə bu dahi insanın məzarı vardır.

Bu ounun böyüklüyüdür, müqəddəsliyidir, doğmalığıdır. Bu onun bəxtidir! Onun uyuduğu, əbədiyyata qovuşduğu yer hər-hansı bir bölgədəki kiçik, darısqal, iki metrlik bir məzar deyil, eni uzunu bilinməyən, dünyanın böyük bir hisssəsini əhatə eləyən böyük Türk dünyasıdır. Onun ruhu Türk dünyasının hər yerində, onun üstündəki müqəddəs göydə Tanrının dərgahındadır.

Ancaq, bütün deyilənlərlə, müxtəlif mübahisəli fikirlərlə yanaşı, Yunus İmrənin valideyinlərinin Anadoluya Xorasandan gəldiyi, özünün isə 1240-1241-ci ildə Nihalıççıq bölgəsində yerləşən Sarıköy kəndində doğulduğu, 1320 və yaxud 1321-ci ldə elə həmin kənddə-Sarıköydə, 80 yaşında dünyasını dəyişdiyi və həmin kənddə dəfn edildiyi göstərilir və həqiqət kimi qəbul edilir.

Bu kənd Əski şəhər Ankara magistral avtomobil yolunun üstündə yerləşir, əziz oxucular. Bu yolun çəkiliş proyekti 1948-ci ildə hazırlanmışdır. Nəticədə məlum olmuşdur ki, yol birbaşa Yunus İmrənin məzarının üstündən keçəcəkdir. Buna görə də hökumətdən məzarı köçürmək üçün icazə istəmişlər. Məzarı yoldan əlli metr kənara, digər bir yerə köçürməyə icazə almışlar. Bunun üçün xüsusi hazırlıq görülmüş, türbə hazırlanmışdır. Məzarın köçürülməsi 1949-cu ildə may ayının 6-da yerinə yetirilmişdir.

Ancaq, böyük narahatçılıqlar yaratmamaq məqsədi ilə tədbirin olduqca sakit şəraitdə, gizli şəkildə, heç bir mərasim, heç bir toplantı keçirilmədən yerinə yetirilməsi tapşırılmışdır. Məzarın açılması əməliyyatı və qalıq üzərindəki bəzi elmi-tədqiqat işləri gecə vaxtı aparılmalı, sonra Yunusun sümükləri tabuta qoyulmalı, səhər tezdən əlli metr kənarda tikilmiş türbədə dəfn edilməli idi.

Məzardan bir əli başının altda, o biri əli isə ürəyinin üstə olan bir skelet çıxır, əziz oxucular. Ən maraqlı hadisə odur ki, mütəxəssis-alimlərin təsdiq etdiyi kimi 80 yaşında 600 il əvvəl rəhmətə getmiş mərhumun skeleti pozulmamış, yəni, sümüklərdən heç biri öz vəziyyətini dəyişməmişdi. Bu da bir

möcüzə, yaradanın Yunus İmrəyə özünəməxsus xoş münasibəti deyilmi istəkli oxucular?

Xəbər verilməməsinə baxmayaraq, yaxın bölgələrdə yaşayan insanlar bu gizli tədbirdən xəbər tuturlar və ürəklərində böyük sevgi bəslədikləri bu böyük insana, bu dahi şairə sevgi və sayqılarını bildirirlər. Həmin gecə səhərə qədər on minlərlə insanlar Sarıköyə tərəf axışırlar. Mayın 6-da, səhər tezdən Sarıköydə ayaq basmağa yer yox idi. Kəndə və ətraflara dolmuş insanlar dəniz kimi dalğalanırdı. Bu tədbir iştirakçılarının yazdığına görə gələnlərdən çoxu əllərində bağlama, bağlamalarda Yunus İmrəyə ehsan halva, aş, dillərində isə ilahiyyat türküləri gətirmişdilər. Məzarın köçürülməsini və vaxtını bu qədər insan, böyük xalq kütləsi haradan, necə öyrənmişdi və bir gecənin içərisində Sarıköyə necə gəlmişdi və onları hansı qüvvə gətirmişdi? Əlbəttə ki, Yunus İmrəyəə olan sevgi, Yunus İmrə böyüklüyü, Yunus İmrə qeyri-adiliyi.

Yunus İmrənin sümüklərini böyük sevgi və hörmətə tabuta qoyurlar. Türbəyə dəfn etməyə aparırlar

Tədbir iştirakçılarının yazdığına görə tabutun məzardan türbəyə aparılmasında hər kəs bilavastə iştirak edərək, bu böyük insana ehtiramını bildirmək istəyir. Bu məqsədlə insanlar tabutu çiyninə götürmək, heç olmasa ona əllə toxunmaq istəyir. Buna görə də yerdən qaldırılmış tabutu əlli metr kənardakı türbəyə aparmaq üçün üç saat vaxt sərf edilir.

Təsəffürünüzə gətirin, istəkli oxucular. Hər bir metr yola uç dəqiqə yarım vaxt sərf edilib. Saatınıza baxıb bu şərtə əməl etməklə iki, üç metr yol gedsəniz bunun nə demək olduğunu daha aydın dərk eləyə bilərsiniz. Bu, xalqın Yunus İmrəyə öz borcunu vermək istəyindən, ona olan təbii sevgidən irəli gəlirdi, əziz oxucu.

Belə qeyri-adi həyatı olan, maraqlı ömür sürən Yunus İmrəni xalq sevməyə bilməzdi, o buna layiq idi. Çünki, hər şeydən əvvəl o misli-bərabəri olmayan böyük xalq ozanı, dahi şair idi. Yunus İmrəyə qədər təmiz Türk dilində, daha doğrusu Azərbaycan türkcəsinə çox yaxın dildə onun kimi yaradan ikinci şairimiz yəqin ki, olmamışdır. Bəlkə də, buna səbəb onun valideyinlərinin iranlı Türklərdən olmaları olmuşdur.

Biz dünyadan geder olsaq, kalanlara selam olsun
Bizim için hayır-dua edenlere selam olsun.
Derviş Yunus söyler sözün, yaş doludur iki gözun
Bilməyən nə bilir ki, bilenlere selam olsun.

və yaxud:

Gah eserem yeller kibi, gah tozaram yollar kibi.
Gah akaram seller kibi, gel gör beni aşk neyledi.
Ben yürürüm yane-yane, aşk boyadı beni kana
Ne akilem, ne divane, gel gör beni aşk neyledi.

750 il bundan əvvəl yazılmasına baxmayaraq, bu sətirlər necə də müasir Türk dili ilə, o cümlədən Azərbaycan türkcəsi ilə eyniyyət təşkil eləyir. Onu hər bir Türkə sevdirən budur, əziz oxucu.

Yunus İmrə varlıq-yoxluq, insan-tanrı kimi əbədi mövzularda insanların qəlbinə işıq səpmişdir.

Onun istedadının verdiyi təbii qüdrət dünyavi və insanidir. O ən çətin şeyləri asan, rahat bir formada xalq dili ilə anladır.

Hörmətli oxucular, mən ədəbiyyatçı, filosof, tarixçi və bu elmlər üzrə tənqidçi, tədqiqatçı deyiləm. Ancaq, ədəbiyyata, tarixə, incəsənətə meyilli minlərlə adi həvəskarlardan biri kimi öz fərdi fikirlərimi açıqlayaraq, tam əminliklə sübut eləyə bilərəm ki, Türk dilində yazılmış şerin bayraqdarı Yunus İmrə, zirvəsi isə İmrədən 250 il sonra dünyaya gəlmiş Məhəmməd Füzulidir. Əlbəttə ki, bu fikir ilk, qədim türk şeirlərinə və şairlərinə aiddir, istəkli oxucular. İlk cığırı açmaq çətindir və şərəflidir, açılmış cığırı genişləndirib yola çevirmək daha asandır.

Çox təəssüf ki, adı ilə fəxr etdiyimiz Nizami Gəncəvi kimi nəhəg şair babamızın öz ana dilində heç olmasa bircə beyti belə yoxdur. Elə buna görə də, mən bu müqəddəs, damarlarında Azərbaycan türkünün qanı axan, bütün ruhu ilə Azərbaycan türkü olan ülü babamıza, Şeyx Nizamiyə nə qədər çalışsam da tam bəraət qazandıra bilmirəm. Yenə deyirəm, bu mənim fərdi fikrimdir, mənimlə razılaşmayanlar, müxtəlif arqumentlər gətirənlər çox ola bilər və müəyyən dərəcədə onlarla da razılaşmaq olar.

Yunus İmrə oxumuşdu, yazmışdı, dövrünün biliklərini

həzm etmişdi. Cavanlığında, ömrünün çiy dövründə bişmiş, məcazi eşqdən həqiqi eşqə, ölüm qorxusundan əbədiliyə yüksəlmiş, şəriətdən həqiqətə, mücahidədən müşahidəyə çatmış, itaətkar qul psixologiyasından uzaqlaşaraq, tanrıya yetmiş tam, bütöv, dahi bir insandır Yunus İmrə.

Deyilənə görə Yunusun üç min şeri olmuşdur. Onlardan hal-hazırda mini məlumdur.

İki min şerin itməsi haqda xalq arasında yayılmış və indi də yad edilən bir əhvalatı hörmətli oxucuların nəzərinə çatdırmağı özümə borc bilirəm və bu qeyri-adi əhvalatdan nəticə çıxarmağı onların öz öhtələrinə buraxıram, doğma Qaraqoyunlu, istəkli Göyçə.

Deyilənə görə Yunus İmrənin ölümündən sonra onun şeirlərinin yazıldığı dəftər molla Qasım adlı bir xocanın əlinə keçir.

Molla kiçik bir çay kənarında qaladığı ocağın qırağında oturub, şeirləri oxuyur və şəriətə uyğun görmədiklərini yandırır. Beləliklə min dənəsini yandırdıqdan sonra oxuduğu şeirlərin ikinci minini çaya atır.

Üçüncü minə başlayıb birinci şeri oxuyanda mollanı vahimə bürüyür, öz gözünə inanmır, qeyri-adi, özündən asılı olmayan bir vəziyyətə düşür. Buna səbəb molla Qasımın adının çəkildiyi və həmin andakı vəziyyəti əks etdirən aşağıdakı beyt olmuşdur, əziz oxucular.

Dərviş Yunus bu sözü əyri-büyrü söyləmə,
Səni siqaya çəkən bir mola Qasım gəlir.

Bu beyti oxuyan molla Qasım Yunusun ermişliyini anlamış, onun ağlı başına gəlmiş, elədiyindən peşman olmuş və şeirlərin qalanlarını saxlamışdır. Nə deyəsən bu hikmətə?

Yunus İmrənin, Dərviş Yunusun bu məzmunda beyt yazması, beytdə molla Qasımın adının çəkilməsi, şairin ölümündən sonra mollanın peyda olması, şeir dəftərinin onun əlinə keçməsi, nəhayət, bu əhvalatın məntiqi nəticəsi adi bir təsadüfdü, yoxsa bütün bunlarda Yunusun ömür yolunu yönləndirən böyük yaradanın ilahi qüvvəsi vardır?

Yunus İmrə istedadlı şairlərdən, böyük ozanlardan, qeyri-adi dərvişlərdən biridir, yoxsa gələcəyi görə bilən, allah

vergisi ilə dünyaya göz açan, yaradana yaxın olan peyğənbər siqlətli tanrı quludur? Xalqın inancına görə Yunusun yandırılan min şerini göydə mələklər, suya atılan min dənəsini balıqlar, qalan min dənəsini isə insanlar oxumaqdadır.

Belə bir tale ulu babamız Yunus İmrəyə verilmişdir.

İşlətdədiyi dili sadə, aydın xalq dili olaraq yeddi əsirdən çox yaşayan və yaşamağa davam eləyən ikinci belə bir şair bəlkə də olmamışdır. Bu xoşbəxtlik ancaq Yunus İmrəyə nənsib olmuşdur, əziz oxucular.

XIV əsrin sonlarında və XV əsrin əvvəlində yaşamış ən böyük şairlərimizdən biri də, əsl adı Seyid Əli olan İmadəddin Nəsimidir. O, Yunus İmrədən 130 İl sonra, 1369-cu ildə Şamaxıda anadan olmuşdur. Seyid Əli öz müəllimi, hürufilik təriqətinin yaradıcısı Fəzlullah Nəiminin təxəllüsü ilə həmahəng səslənən Nəsimi təxəllüsünü qəbul etmişdir. Hürufilik sözü "hərflər" sözündən götürülmüşdür və şiyəlik təriqətidir. Bu təriqət ilk dəfə Naxçıvanda və Astarada yayılmışdır.

Hürufiliyə görə allahın yaratdığı dünya daim, mütəmadi olaraq dövr etməkdədir. Bu təriqətə görə allah özünü iki cür biruzə verir, daha doğrusu iki yolla təzahür edir. Birincisi, özünəbənzər yaratdığı insanlardan, ikincisi isə Allahın özünün nitqində, yəni Quranda və şeylərin adında təzahür edir.

Nəsimi də bu təriqətin tərəfdarı Nəiminin istedadlı şagirdi və davamçısı, eyni zamanda hürufiliyin yorulmaz təbliğatçısı idi.


İmadəddin Nəsimi

O, əvvəlcə Təbrizdə, sonra Anadoluda, ömrünün axır illərində isə Suriyanın Hələb şəhərində hürufilik təriqətini yaymaqla məşğul olmuş, buna görə də "kafir", "dinsiz" elan edilmişdir. Misir sultanının əmri ilə 48 yaşlı Nəsiminin diri-diri dərisi soyulmuşdur. "Nəsimi" filmində də gördüyünüz kimi Nəsimini ayağından başlayaraq soymuşlar. Bəs niyə ayağından? Görünür bu böyük,bu dahi, bu uca insanın başına cəlladların əli çatma-

mışdır, təbii ki, çata bilməzdi də. Məndə sığar iki cahan, mən bu cahana sığmazam deyən dahi Nəsimi belə bir faciəli sonluqla dünyasını dəyişmişdir, istəkli oxucular.

Nəsimi həm ana dilində, həm də fars və ərəb dillərində gözəl şeirlər yazmışdır.

Mürəkkəb yaradıcılıq yolu keçən Nəsimi, yaradıcılığa aşiqanə şeirlərlə başlamış, sonra dövrün siyasi-ictimai, əxlaqi mövzularında əsərlər yaratmışdır. Nəsimi Azərbaycan ədəbiyyatı tarixində fəlsəfə qəzəlinin banisidir.

Beləliklə, əvvəlcə dediyimiz kimi, 1468-ci ildə Qaraqoyunlu dövlətini Ağqoyunlu Dövləti əvəz etdi. Bayraq üzərində qara qoç əvəzinə ağ qoç şəkli həkk edildi. Ağqoyunlu dövlətinin ömrü uzun olmadı, cəmisi 32 il yaşaya bildi.

Uzun müddət hakimiyyətdə olan, bir qədər möhkəmlənən və müəyyən qüvvə toplayan Uzun Həsənin müvəffəqiyyətdən başı gicəllənməyə başladı və cahangir olmaq fikrinə düşdü. Bu sizin yadınızdan çıxmayıb doğma Qaraqoyunlu, əziz Göyçə, ulu Borçalı.

Doğru deyiblər ki, Allah kimi bədbəxt etmək istəyirsə, əvvəlcə onun ağlını alır. Uzun Həsən də belə bir xəstəliyə düçar oldu və xəyalından Osmanlı Dövlətini zəbt etmək, əzmək və oraya hakim olmaq keçdi. Bu məqsədlə o Türkiyə dövləti əleyhinə, öz qan qardaşlarının əksinə gizli tədbirlərə əl atdı və bu tədbirləri səylə yerinə yetirməyə çalışdı.

Uzun Həsən tarixən Türk dünyasına və Türk xalqına düşmən mövqedə dayanan bəzi Avropa və Asiya ölkələri ilə, o cümlədən Rusiya, Polşa, Macarıstan, Almaniya və İtaliya ilə Türkiyəyə qarşı gizli diplomatik əlaqələr yaratdı. Bu əlaqələrin yaranması üçün Uzun Həsənin anası Sara xatun xüsusi canfəşanlıq göstərir və əzmlə çalışırdı.


Uzun Həsən

Uzun Həsən qalib gələcəyinə, Böyük Osmanlı Dövlətinə hakim olacağına tam əmin idi. Aranı qarış-

dırmaq, qarşılıqlı münasibəti korlamaq, müharibəyə başlamaq üçün müxtəlif əyri yollara əl atmaq istəyirdi Uzun Həsən.

Bu məqsədinə nail olmaq üçün o, alçaldıcı bir məktub yazdı və elçilər vasitəsilə Sultana göndərdi. O, sultanın kim olduğunu qiymətləndirə, onun böyüklüyünü dərk edə bilməmişdi.

O zaman Osmanlı Dövlətinin başında bütün dünyada böyük fateh kimi yaxşı tanınan, hərb işlərini yüksək səviyyədə mənimsəmiş olan, eyni zamanda böyük dövlət xadimi və əvəzsiz komandan kimi qəbul edilən Sultan Məhəmməd (Mehmet) dururdu. Özündən həddindən artıq razı olan Uzun Həsən göndərdiyi məktubda Sultana, çoxdan layiq olduğu Fateh Sultan Mehmet kimi deyil, sadəcə "Mehmet bəy" deyə müraciət etdi. Bununla o, Sultanın şəxsiyyətini kiçiltmək, onu təhqir etmək, alçaltmaq və müxtəlif səbəblər tapıb narazılıq yaradaraq, savaşa qatmaq istəyirdi. Çünki, müharibə olacağı təqdirdə qalib gələcəyinə çox inanırdı.

Bəs Uzun Həsənin məğlub etmək istədiyi Sultan Mehmet kim idi və Uzun Həsənin məktubuna necə cavab verdi ?


Sultan Mehmet

Sultan Mehmet Balkanları türk yurdu eləyən, həm dostlara, həm də düşmənlərə türk hakimiyyətini qəbul etdirən Sultan II Muradın oğludur.1441-ci ildən 1451-ci ilə qədər hakimiyyətdə olan Sultan II Muradın ailəsində 1432-ci ildə dünyaya gələn Mehmet, digər sultanlardan fərqli olaraq iki dəfə sultanlıq taxtında oturmuşdur.

O, ilk dəfə 13 yaşında, atasının sağlığında, atasının öz razılığı ilə hakimiyyətə keçmiş, ancaq bir müddət sonra uzaqlaşdırılmışdır. İkinci dəfə, 1451-ci ildə, atası dünyasını dəyişəndən sonra taxta çıxan Sultan Mehmet artıq dövləti ailəsi-

nin himayəsi ilə deyil, öz ağlı və bacarığı ilə idarə etməyə başlamışdır. Bu zaman onun 19 yaşı var idi.

Ana dilindən başqa yunan, latın, italyan, fransız, ərəb və fars dillərini bilən Sultan Mehmet elmi sevmiş, elm adamlarına, şairlərə, yazıçılara arxa olmuşdur.

Uzun Həsənlə qarşılaşana qədər türk sultanlığı və ümumiyyətlə bütün türk dünyası üçün çox böyük işlər görmüşdü Sultan Mehmet. O, iki imperatorluğu, dörd krallığı, altı prinsliyi, dörd əyaləti tutaraq, 17 dövləti dünya xəritəsindən silmiş və onların torpaqlarını öz imperatorluğuna qatmışdı.

Bütün Balkan yarımadasını türk dövlətinə qatmış, Qara dənizi bir türk dənizi etmişdi Sultan Mehmet.

Dünya hərb tarixində hələ də misli-bərabəri görünməmiş fəndlər işlədərək, 1453-cü ildə dünyanın ən gözəl və iri şəhərlərindən biri olan İstanbulu fəth edərək, əbədi türk şəhəri etmişdi Sultan Mehmet. Belə zəfərlər Sultan II Mehmeti ən böyük fatehlər sırasına yüksəltmişdi və ona Uzun Həsənin dediyi kimi, adicə, "Mehmet bəy" deyil, bütün dünyanın qəbul etdiyi Fateh Sultan Mehmet olaraq müraciət etmək üçün böyük və köklü əsas vermişdir.

Böyük fatehlər arasında Fateh Sultan Mehmetin çox böyük, layiqli yeri vardır. Kiçik bir yazı ilə onun haqda nə isə demək mümkün deyil, əziz oxucular. Belə bir fatehlə vuruşmaq istəyirdi Uzun Həsən !

Uzun Həsənin məktubuna Fatehin cavabını hörmətli oxucuların nəzərinə yetirmək istəyirəm və bunu məqsədəuyğun sanıram. Uzun Həsənə Sultan belə məzmunda bir cavab məktubu yazır:

"Mən, Sultan Bayazid oğlu, Mehmet oğlu, Murad oğlu Sultan Mehmetəm. Kişi dövlətinə məğrur olub, haqqını aşarsa, uçurumun kənarına gəldiyinə əmin olmalıdır. Başın pisliklərlə doludur. O şeytanları başından qov və insanların anlaşmasına kömək eləyən ağıla qulaq as. Bizim məmləkət islamiyyətin mərkəzidir. Bizə qarşı gəlməniz, imanımızın düşməni olduğunuzu göstərər. Sonra "bilmədim" və yaxud "başa düşmədim" deməyəsən. Müzəffər əskərlərim sənin zülmünü məzlumlar üzərindən qaldıracaqdır. Sənin adını və

sanını yox edəcəyəm. Artıq sənə söyləyəcəyim sözüm yox-dur. Ancaq yaxşılıq diləyən yaxşılıq görsün!”

Uzun Həsən elə bir şərait yaratdı ki, müharibə qaçılmaz oldu. Doğuda və batıda 25 ölkə osmanlılara qarşı birləşmiş-di.1473-cü ilin avqustunda bu arzuolunmaz və mənasız müharibə təəssüf ki, baş tutdu.

O günə qədər topdan, tüfəngdən istifadə edən heç bir or-du ilə vuruşmamış və bunların necə müdhiş silahlar olduğunu görməmiş Uzun Həsən məğlub olaraq, qaçıb doğuya-Təbrizə çəkildi və 1478-ci ildə dünyasını dəyişdi. Bununla da, nəfsi ağlına üstün gəldiyinə görə bacarıqlı türk hökmdarlarından biri də vaxtından əvvəl süquta uğradı.

Fateh Təbrizə qədər irəliləməyi lazım bilmədi. Çünki, xristianların ona qarşı ittifaqda olduqlarını yaxşı bilirdi. Çal-dığı zəfər münasibəti ilə allaha şükürlər etdi və 40 min əsiri pul hesabına azad edərək bati ilə məşğul olmağa başladı.

30-il səltənət sahibi olan fateh sultan II Mehmet 300 min-lik ordu ilə növbəti səfərə çıxdığı vaxt xəstələnmiş, həkim-lərin verdiyi dərmanı içərək, 1481-ci ilin may ayının 3-də 49 yaşında rəhmətə ketmişdir.

Kimyagərlərin bildirdikləri qəti fikrə görə Fateh zəhər-lənərək öldürülmüşdür. İmperatorluğun hərbi gücü və Fateh sultan II Mehmetin hərbi duhası bütün Qərbi dizi üstə çökdürmüşdü. Ona görə də Sultanın ölüm xəbəri ildırım sürəti ilə bütün dünyaya yayılmışdır. Bundan xəbər tutaraq sevinən və rahat nəfəs alan xristian dünyasında böyük şənlik-lər təşkil edilmiş, müxtəlif dini ayinlər keçirilmişdir.

Uzun Həsənlə Sultan Mehmet arasındakı əsassız düşmənçilik münasibəti və bunun amansız nəticələri Əmir Teymurla Sultan Bayazid arasındakı münasibətə və bundan əmələ gələn ağır nəticələrə uyğun gəlmirmi, əziz oxucu?

Fikir verin: o halda da iki türk hökmdarı qarşı-qarşıya gəlmişdi, bu halda da, o halda da məktublaşma əsas rol oyna-mışdı, bu halda da; o halda da müharibəni başlamaq üçün şə-rait yaratmaq məqsədilə süni səbəblər axtarılmışdı, bu halda da, o halda da savaş baş tutmuşdu, bu halda da; o halda da bütün türk dünyasına ziyan dəymişdi, bu halda da; o halda da

düşmənlər sevinərək bayram etmişdilər, bu halda da.

Bu hadisələr ekiz qardaşlar kimi bir-birilərinə yaman oxşayırlar, ulu Göyçə.

Nə üçün Uzun Həsən və Sultan II Mehmet babalarının səhvlərindən nəticə çıxarmayıblar, ulu Qaraqoyunlu, ulu Borçalı?

Bir çox oxşar hadisələr, o cümlədən xatırladığımız axırıncı hadisə nə miras qoydu böyük türk xalqına, nə verdi türk dövlətlərinə? Oxucuların böyük əksəriyyəti bilməsə də, sizin gözünüz qarşısında, bəzən isə bilavasitə sinəniz üstə baş verən, bütün dünyanın gedişinə təsir eləyən bir çox tarixi hadisələri yaxşı bilirsiniz.

Böyük şəxsiyyətlərin, dahi fatehlərin, zəhmli hökmdarların dünyaya gəlmələrini, böyümələrini,hökmdar taxtına ucalma yollarını, bir hökmdar kimi fəaliyyət dairələrini, millət, xalq, dövlət, Türk dünyası üçün etdiklərini, nəhayət dünyalarını hansı səbəbdən vaxtlı, yaxud vaxtsız dəyişmələrni və nəhayət özlərindən sonra hansı izlər qoyduqlarını yaxşı xatırlayırsınız .

Doğma Qaraqoyunlu, istəkli Göyçə, ulu Borçalı bildiyiniz kimi, adətən bizim söhbətimiz sizin yerləşdiyiniz bölgə ilə bağlı tarixi hadisələr barəsində və yaxud, həmin bölgədə doğulan və yaxud da müəyyən müddət orada fəaliyyətdə olan böyük şəxsiyyətlər haqda gedir və biz bu qaydaya riayət etməyə, ona tabe olmağa çalışırıq. Ancaq elə şəxsiyyətlər var ki, bu bölgədə doğulmasa da, bu bölgəyə ayağı dəyməsə də, bizi, bizim bölgəni maraqlandıran məsələlərin gedişinə böyük təsirləri olmuş və layiqli yerlərini tutmuşlar. Onlardan biri də, türk xalqının böyük şairləri arasında layiqli yeri olan dahi özbək türkü Əlişir Nəvaidir. Nəvaini xatırlamaq əvvəla ona görə mütləq lazımdır ki, o Nizami Gəncəvidən sonra xəmsə yaradan onlarla şairlər arasında ən böyük şairdir. İkincisi isə odur ki, Nəvai dilimizə münasibətdə o dövrün böyük şairlərinin əksəriyyətindən yüksəkdə dayanmış, ana dilini layiqincə qiymətləndirməyi bacarmış və həmin dildə yazıb-yaratmağa üstünlük vermişdir.

Əlişir Nəvai 1441-ci ildə, Yunus İmrədən iki yüz il, Nəsimidən isə yetmiş il sonra dünyaya gəlmişdir. O, XVl əsrdə Səfəvilərə, müasir dövrdə isə Əfqanıstana daxil olub, onun batısında yerləşən Herat şəhərində anadan olmuş və Ağqoyunlular dövlətinin süquta uğradığı, Səfəvilərin hakimiyyətə gəldiyi 1501-ci ildə, altmış yaşında dünyaya göz açdığı doğma şəhərdə dünyasını dəyişmişdir.



**Əlişir Nəvai**

Hüseyn Baykara uşaqlıq dostu olan Nəvaini öz hökmdarlığı dövründə, möhürdar, divan bəyi və əmir vəzifələrinə təyin etmişdir.

Nəvai şairliyi ilə böyük zirvələrə ucalmış. dövlət işləri ilə bərabər musiqi, rəssamlıq, xəttatlıq və nəqqaşlıq sahələrində də yüksək sənət nümunələri yaratmışdır. O, Türk ədəbiyyatı dünyasının ən böyük istedadlarındandır.

Onun dövründə çox böyük abadlaşma yolu keçən Heratda məşhur şəxsiyyətlər, o cümlədən Cami, Hafiz, Azərbaycan rəssamı Pirseyid, Əhməd Təbrizi kimi yaradıcı insanlar yaşamış və yaratmışlar. Əlişir Nəvai öz ana dili olan Çağatay türkcəsi ilə yanaşı, fars və ərəb dillərini mükəmməl bilmiş, az da olsa həmin dillərdə də qiymətli əsərlər yaratmışdır. Ancaq, o dövrün dəbinə uyaraq, ərəb və farsca yazan türk şairlərinə qarşı çıxmış, türkcənin digər dillərin kölgəsində qalmasına qarşı üsyan etmişdir. Buna görə Nəvaini sevməmək və hər dəfə, yeri gəldikcə yad edərək, ona rəhmət diləməmək mümkün deyil, ulu Borçalı.  Nəvai türk dilinin məcazlar, çinaslar, qafiyələr, feillər dili olduğunu, səs və məna incəliklərinə malik qüdrətli ifadə imkanlarının ərəb və fars dilindən üstün olduğunu bilir və bunu sübut etməyə çalışırdı.

Əsərlərinin çox böyük əksəriyyətini ana dilində yazan bu dahi şair, türk və fars dillərini müqayisə edərək, belə nə-

ticəyə gəlmişdir ki, fars dilində olan bütün sözlərin türk dilində qarşılığı var, əksinə, türk dilində olan bir çox qavramları ifadə eləyən sözlərin isə, fars dilində qarşılığı yoxdur.

Bunu isbat etmək üçün Nəvai yüzlərlə misal göstərməklə türk dilinin daha zəngin olduğunu qeyd edir və onun ən gözəl şeir dili olduğunu sübuta yetirir.

Oxucuların maraqlanacaqlarını ehtimal edərək, Nəvainin qeyd etdiyi, fars dilində qarşılıqlı olmayan yüzlərlə sözlərdən ancaq birini nəzərə çatdırmaq istəyirəm .

Nəvai göstərir ki, müxtəlif cur ağlamağın fars dilində bircə qarşılığı var. Türk dilində isə müxtəlif cür ağlamaqlar müxtəlif kəlmələrlə, məsələn, ağlamaq, ağlamsınmaq, hönkürmək kimi müxtəlif sözlərlə ifadə edilir.

Fars dilində yazan türk şairləri haqda ürək ağrısı ilə söhbət açan Əlişir Nəvai yazılarının birində qeyd edir.

"Türkün savadsız və zavallı gəncləri farsca şeir söyləməyi üstün tuturlar. Yaxşı və ətraflı düşünsələr, türkcə belə genişliklər, incəliklər, dərinliklər və zənginliklər olduğuna görə, bu dildə şeir söyləməyin və sənət göstərmənin daha asan, daha gözəl və dəyərli olacağını anlarlar"

Allah sənə rəhmət eləsin Əlişir baba !

500-550 il bundan əvvəl sənin dövründə farsca danışmaq dəbdə idisə, bizim dövrümüzdə, Sovet İttifaqının tərkibində olduğumuz zamanlarda isə, rusca danışmaq dəbdə idi. Müxtəlif səviyyəli iclaslar, konfranslar, qurultaylar rus dilində aparılırdı. Küçədə, avtobusda, metroda, ümumiyyətlə hər yerdə çox böyük əksəriyyət rusca danışırdı və bununla fəxr eləyirdi. Vəzifəsinin kiçik və böyüklüyündən asılı olmayaraq hər bir vəzifəli şəxs, necə bilməsindən asılı olmayaraq, rusca danışırdı. Rusca bilməyənlərə yuxarıdan aşağı, ikinci növ adam kimi baxırdılar və onlar yağlı vəzifələr üzünə həsrət qalırdılar.

Bu yaxınlarda Tibb Universitetinin dosenti vəzifəsində çalışan, vəzifə tutmaq üçün həmişə dəridən qabıqdan çıxan, böyük canfəşanlıq eləyən, iclaslarda ancaq rusca danışan həmkarlarımdan biri ilə rastlaşdım. Söhbət elə gətirdi ki, zəif bilməsinə baxmayaraq, iclaslarda həmişə rusca danışdığını

üzünə vurmalı oldum. Həqiqəti qəbul etmək, keçmişdə buraxılan səhvləri etiraf etmək əvəzinə, düz deməyimə baxmayaraq, məndən incidiyini hiss etdim .

Bəli, Nəvai baba, sən yaşadığın yaşantını biz də yaşamışıq, sənin keçirdiyin hissləri biz də keçirmişik .

Əziz oxucu, təssüf ki, Əlişir Nəvainin yazdığı şeirlər də saf türk dilndə deyildir, tam başa düşülmür və izahata ehtiyac duyulur. Niyə?

Ona görə ki, eyni dinə qulluq eləyən türk,fars, ərəb xalqları daim, həmişə bir yerdə yaşamışlar və təbii olaraq bir-birinə çoxlu sözlər, ifadələr vermişlər və almışlar. Nəvai öz dövründə fars və ərəb dillərindən alınmış bir çox sözlərin və ifadələrin hamısını türk sözü kimi qəbul etmiş və başqa dilə mənsub olmasını nəzərə almadan öz əsərlərində istifadə etmişdir.

Deməli, çox böyük xidmətləri olmasına baxmayaraq, saf türk dilində yazmaq baxımından əlişir Nəvai də, Yunus İmrə səviyyəsinə yüksələ bilməmişdi istəkli oxucular.

## 5.Səfəvilər dövrü. Şah İsmayıl və Sultan Səlim.

Bir çox fatehlərin yaratdığı böyük dövlətlərin, ucsuz-bucaqsız imperiyaların qurulmasını və dağılma səbəblərini unutmamısınız.

O da yaxşı yadınızdadır ki, dünyanın düzümünə bilavasitə təsir göstərə bilən böyük, qüdrətli imperiyalar, qüvvətli dövlətlər yaradan böyük türk hökmdarlarının demək olar ki, hamısının, bəzisi yad millətdən olmaqla bir neçə arvadları və çoxlu evladları olmuşdur.

Mənim öyrəndiyimə görə, sizin də xatırladığınız kimi, adətən, belə qüdrətli hökmdarlar dünyalarını dəyişdikdən sonra, bəzi hallarda isə, hətta sağ ikən oğullar arasında taxt-tac uğrunda amansız mübarizələr getmiş, ölkə parçalanmış, zəifləmiş, ona görə də digər dövlətlər tərəfindən məğlub olunaraq, tarixin səhifələrindən silinmişdir.

Bu dəfə də belə oldu doğma Qaraqoyunlu. Uzun Həsənin altı oğlu var idi. Onun ölümündən sonra oğullar arasında başlanan taxt qovğası nəticəsində ölkə zəiflədi, qüdrətini itirdi.

Bu dövrdə İranda şah Şah İsmayıl Xətai idi. O, Uzun Həsənin qız nəvəsi, yəni hakimiyyət uğrunda vuruşan qardaşların bacıları oğlu idi. Bu şəraitdən istifadə eləyən Şah İsmayıl Xətai 1501-ci ildə öz dayılarına hücum edərək, Ağqoyunlu Dövlətinin varlığına son qoydu , istəkli oxucular.



**Şah İsmayıl Xətai**

Bununla da Səfəvilər dövrü adlanan uzun bir dövrün təməli quruldu və yaşamağa başladı.

Beləliklə XV əsri də başa vurub , XVI əsrə qədəm qoyduq.

Ulu Qaraqoyunlu, ulu Borçalı, ulu Göyçə ömrünüzün XVI əsrə aid olan hissəsi, o cümlədən Səfəvilər Dövləti dövrü də çox maraqlı və təzadlı dövrlərdəndir. Bu dövr Azərbaycan Türklərinin böyük Şair, qüdrətli hökmdar, bacarıqlı hərbçi kimi tanıdığı və səmimiyyətlə qəbul edərək, yad etdiyi, şah babamız Şah İsmayıl Xətainin yaşayıb yaratdığı, şahlıq etiyi dövrdür. Bunu nəzərə alaraq, heç bir hissiyyata qapılmadan, heç kimə süni üstünlük vermədən, ancaq tarixi dəlillərə söykənərək, səfəvilər və Şah İsmayıl Xətai barədə dövrün danılmaz tarixi hadisələri haqda söhbətimizi davam etdirək.

Səfəvilər İranda 234 il hökm sürən və Osmanlıların doğuda ən böyük rəqibi olan bir türk Xanədanı olmuşdur.

Səfəvi adı “ Səfəviyyə təriqatını yaratmış Şeyx Safyuddinin (1252-1335) adından götürülmüşdür. Təriqət Ərdəbil Şəhərində yaranmış və inkişaf etməyə başlamışdır. Şeyxlik atadan oğula, nəsildən nəsilə keçirdi və tədricən Anadoluya, İraqa və İrana yayılırdı.

Başlanğıcda təriqət sünnü idi. Səfəviyyə təriqətinin banisinin, yəni Şeyx Safiyüddinin davamçılarından olan Şeyx Əli Həzrət Əlinin soyundan gələn on iki imamın tərəfdarları-

nı öz tərəfəinə çəkmək məqsədi ilə, sünnü təriqətindən əl çəkərək, şiyəliyi qəbul etdi. Bundan sonra şiyəlik səfəvi şeyxləri tərəfindən tamamilə mənimsənildi və inkişaf etdirildi.

Şeyx sözü ərəbcə qoca, ağsaqqal mənasını verir. Ərəblərdə qəbilə, tayfa başçılarına şeyx deyiblər. Bir çox müsəlman ölkələrində şeyx adı təriqət başçılarına, görkəmli ilahiyyatçılara, ümumiyyətlə, hörmətli adamlara və mötəbər şəxslərə aid edilir. Məsələn, Nizami Gəncəviyə Şeyx Nizami, Sədi Siraziyə Şeyx Sədi deyə müraciət edirlər. Səfəviyyə təriqətini inkişaf etdirən məşhur Şeyxlərdən biri olan Şeyx Heydər gələcəkdə şahlıq taxtına əyləşəcək Şah İsmayıl Xətainin atasıdır.

O, 1460-cı ildən ömrünün sonuna, 1488-ci ilə qədər Ərdəbil hakimi olmuşdur. Şeyx Heydər muridlərinə sayı 12 imamın sayına bərabər olan 12 qırmızı zolaqlı çalma qoymağı məcbur etmişdir. Ona görə də onun tərəfdarlarına”Qızılbaşlar” da deyilirdi.

Ağqoyunlular dövlətinin hökmdarı Uzun Həsənin kürəkəni olan Şeyx Heydər qayınatası ilə birlikdə Qaraqoyunlulara və Teymurilərə qarşı vuruşlarda iştirak etmişdir. Şeyx Heydər qənimət ələ kçirmək məqsədi ilə bir neçə dəfə Şirvanı keçərək, Dağıstana hücum etmişdir. Növbəti hücumların birində o, Şamaxını da qarət edib, yandırmışdır.

Bundan narazı qalan Şirvanşah Fərruh Yəsar Ağqoyunlu hökmdarı Sultan Yaqubun köməkliyi ilə qızılbaşları məğlub edir və Şeyx heydər öldürülür. Son tədqiqatlara görə onun Abşeronda dəfn edildiyi bildirlir. Bu dövrlərdə səfəvilər həm məzhəb təbliğatını aparır, həm də şeyxlikdən şahlığa keçmək uğrunda mübarizə edir və dövlət halına gəlməyə çalışırdılar.

Ağqoyunluların taxt qovğasına düşməsi, səfəvilərin bu məqsədə çatması üçün şərait yaratdı. Bundan Şeyx İsmayıl məharətlə istifadə etdi.

Əvvəli Şeyx İsmayıl olan Şah İsmayıl babamız kim olmuş, nə işlər görmüş, xalqımızın tarixində hansı rol oynamışdır?

Onun haqqında cildlərlə kitablar yazılmış, dastanlar ya-

radılmış, musiqi əsərləri bəstələnmiş, heykəli ucaldılmış, adı əbədiləşdirilmişdir. Bütün bunlara, bu hamıya məlum həqiqətlərə baxmayaraq, bu günkü bu dəyirmi masa arxasında onun həyatı və fəaliyyəti haqda az da olsa nə isə deməmək ən azı günah olardı, ulu Borçalı, ulu Göyçə.

Şah İsmayıl Xətai 1487-ci ildə anadan olub. Anası Ağqoyunlu hökmdarı Uzun Həsənin qızı, atası isə Şeyx Heydərdir. Atası Şeyx Heydər öləndən sonra Ağqoyunlu Sultan Yaqub anasını, iki qardaşını və bir yaşlı İsmayılı həbs edib. Sultan Yaqub öləndən sonra isə, onlar azad olub və böyük qardaşı Sultanəlinin vərəsəsi kimi İsmayıl Ərdəbilə göndərilib. 1499-cu ildə 12 yaşlı İsmayıl özünün yaxın tərbiyəçiləri və məsləhətçiləri olan bir-neçə qızılbaş tayfa başçıları ilə birlikdə Ərdəbilə gedib. Lakin, Ərdəbil hakimi qızılbaşları oradan qovub. Qışı Astaranın Ərçivan kəndində keçirən Şah İsmayıl Şamlı, Rumlu tayfalarından, Qaradağ, Talış, Ərzincan əhalisindən 7 min tərafdar taplayaraq, Şirvanı, sonra isə 1501-ci ildə Bakını tutub. Ancaq, Ağqoyunlu Əlvənd Mirzənin hücuma keçdiyini eşidib, onunla vuruşmaq məqsədi ilə Naxçıvan istiqamətində hərəkət edərək, otuz minlik Ağqoyunlu ordusunu Şərur düzündə məğlub edib.  Sonra,1501-ci ilin payızında 14 yaşlı İsmayıl Ağqoyunlulara, yəni öz dayılarına hücum edərək , Təbrizi tutdu və özünü şah elan etdi.

Beləliklə Şeyx İsmayıl Şah İsmayıl oldu və Səfəvi dövləti quruldu. Şah İsmayıl dövlət qurmaqda ona dayaq olan şiyəliyi yaymağa başladı. Bütün İranı şiyələşdirdikdən sonra o, Anadolunu və Özbəkistanı hədəfə almışdır. Şiyəliyi yaymaq istəyi Anadolular və Özbəklərlə Şah İsmayıl arasında narazılıq yaratdı. 1511-ci ildə Özbək xanı Şeybanı xanla Şah İsmayıl arasında baş verən savaşda da Şah İsmayıl qalib gəldi.

Az bir müddətdə Şah İsmayıl yaratdığı dövləti İmperatorluq halına gətirdi. İran, İraq, Gürcüstan, Ermənistan, Quzey Azərbaycan, Dağıstan, Türkmənistan, doğu Ərəbistan və bugünkü Türkiyənin on iki rayonu Səfəvi dövlətinin sərhədləri daxilinə keçdi.

Təəsüf ki, 1514-cü ildə Yavuz Sultan Səlimlə Şah İsmayıl Xətai arasında baş verən döyüş çox işləri dəyişdirib, alt-

üst etdi, əziz oxucu.

Qeyd etdiyimiz bəzi müharibələr kimi, bu tarixi vuruşma da, sizin və digər bölgələrimizin daxil olduğu doğma torpaqlarımız üzərində getdi və siz onun bilavasitə şahidi oldunuz, ulu Qaraqoyunlu. ulu Borçalı, ulu Göyçə. Əmir Teymurla Yıdırım Bayazıdın, Ağqoyunlulara Qaraqoyunluların, Fateh Sultan Mehmetlə Uzun Həsənin vuruşmaları dərs olmadı, bu yersiz vuruşmaların acı nəticələri açmadı türk dünyasının gözünü .

Şah İsmayıl və Sultan Səlim arasındakı Çaldıran döyüşü niyə və necə baş verdi? Bu döyüş haqda bəzi məlumatları nəzərinizə çatdırmağı faydalı hesab edirik, əziz oxucular.

Osmanlıların üstünlüyünü qəbul eləyən Ağqoyunlular doğuya tərəf çəkilmişdilər. Ağqoyunlu hökmdarı Uzun Həsən oğlanlarına "Osmanlı ilə yaxşı davranın" deyə vəsiyyət etmişdi.

Evlənmə yolu ilə Ağqoyunlular və Osmanlı arasında qohumluq və yaxşı münasibət yaranmışdı. Buna görə də, bu iki türk dövləti arasında uzun müddət barış, qarşılıqlı anlaşma və sülh bərqərar olmuşdu.

Fəqət, indi Səfəvilər bu dost dövlətin, yəni Ağqoyunluların taxtını əlindən almışdı və İranda başqa bir türk xanədanı böyük nüfuz sahibi olmuşdu.

1502-ci ildə taxta çıxan Şah İsmayıl Xətai qabiliyyətli siyasətçi, bacarıqlı komandan, təmiz Azərbaycan Türkcəsi ilə şeirlər yazan böyk şair və dəyərli elm adamı idi.

Şah İsmayıl müqəddəs bir arzu, böyük bir amal uğrunda mübarizə aparırdı. O, bizim hamımızın halhazırkı dövrdə də, arzuladığımızı yerinə yetirməyə, yəni Azərbaycanı birləşdirərək, böyük, qüvvələri və qüdrətli dövlət halına gətirmək istəyirdi. Bütün bu deyilənlərlə yanaşı, Şah İsmayıl o günə qədərki bütün müsəlman Türk xanədanlarından fərqli olaraq " Şiyə idi" və bu məzhəbi bütün islam dünyasına qəbul etdirməyə çalışırdı.

Onun şiyəliyi yaymaq istəməsi digər müsəlman dövlətləri ilə yanaşı, Misiri də qıcıqlandırırdı. Bu vəziyyət Osmanlılarla Misir məmlükləri arasında dostluq münasibətinin ya-

ranmasına səbəb oldu.

İranda Türklərin bir qismi Şiyəliyi qəbul etmiş, digər qismi isə qəbul etməyərək, Anadoluya qaçmışdılar. Bu vəziyyət Türk dünyasının birliyinə əngəl ola bilərdi.

Şah İsmayıl bir yandan Anadoluya və Misirə dərvişlər göndərərək, şiyələşdirmə təbliğatı aparır, digər yandan isə, digər dövlətlərlə siyasi əlaqələr yaradaraq, onları Osmanlıya qarşı qaldırmağa çalışırdı.

Avropalılar doğuda Osmanlılara qarşı çıxa biləcək, bəlkə də onu əzərək sıradan çıxara biləcək başqa bir müsəlman Türk dövlətinin meydana çıxmasından çox razı idilər.

Bunları nəzərə alan Yıldırım Bayazidin nəvəsi, Fateh Sultan Mehmetin oğlu Sultan II Bayazid Şiyə təbliğatının qarşısını almaq məqsədilə, Anadolu türklərinin İrana, Səfəvi dərvişlərinin isə Anadoluya keçməsinə qadağa qoydu.

Şah İsmayıl bu tədbirə narazı oldu və bunu məktub vasitəsilə Sultana bildirdi.

Fəqət, Sultan qərarında israrlı idi. Buna görə də tədbirlərini daha da gücləndirdi və Anadoluda şiyəliyi qəbul etməyən bəzi bölgələri Rumeliyə köçürdü.

Şah İsmayıl isə şiyəlik yolu ilə bütün müsəlmanları öz təsiri altına almaq siyasətindən əl çəkmirdi. Bu məqsədə çatmaq üçün hətta silaha əl atmaqdan çəkinməyəcəkdi və bunun üçün əlverişli şərait və səbəb axtarırdı.

Bu məqsədinə nail olmaq, hücum üçün bəhanə tapmaq məqsədilə Şah İsmayıl Dulkadır bəyinin qızı ilə evlənmək istəyini bildirdi. Şiyə olduğu üçün bunun baş tutmayacağını əvvəldən bilirdi. Belə də oldu. Qızın atası razı olmadı. Bunu əas götürərək, İsmayıl Türkiyənin doğu əyalətlərindən keçərək, hücuma keçdi və Dulkadırı məğlub etdi.

Bu dövrdə II Bayazidin başı qarışıq idi. O, olduqca ciddi məsələlərlə məşğul idi. Ona görə də Şah İsmayılın bu hərəkətinə mane olmaq istəməmişdi. Üstəlik onu da qeyd etmək lazımdır ki, Şah İsmayıl Sultanın necə deyərlər, qılığına girmiş, onu özünə qarşı qaldırmamaq üçün könlünü almışdı. Bu məqsədlə o Sultana təriflə dolu bir neçə məktub yazmış və hər dəfə ona "Şanlı baba" deyə müraciət etmişdi.Sultan II

Bayazidin xəstələnməsindən istifadə edən oğulları arasında tarixdə dəfələrlə təkrar olunun və türk dünyası üçün səciyyəvi olan hadisə, yəni taxt-tac qovğası başladı.

O zaman II Bayazidin böyük oğlu I Səlim Trabzon valisi idi. Qardaşları Qorqud və Əhmədin taxta hazırlaşdığını eşidən kimi o, əskər toplayaraq, Rumeliyə gəldi, atasının əskərlərini də öz tərəfinə çəkdi və atasını taxtı təhvil verməyə məcbur etdi. Bu təzyiqə dözə bilməyən Sultan 1412-ci ilin aprelində taxtı oğlu Səlimə təhvil verdi və bir aydan sonra zəhərlənib dünyasını dəyişdi.

Bu zaman Yavuz Sultan Səlimin 42 yaşı var idi. O, həddindən artıq sərt, tələbkar və zəhmli adam idi. Cəzalandırdığı adamın qohum və yaxud yad, yaxın yaxud uzaq, vəzifəli və ya vəzifəsiz olmasının onun üçün heç bir əhəmiyyəti yox idi.

Səltənətinə mane ola biləcək hər kəsi və hər şeyi mərhəmətsizcəsinə yox etmişdi. Fikir verin, istəkli oxucular, Sultan Səlim əvvəlcə atasını zəhərlədərək öldürmüş, sonra öz qardaşlarını, qardaşlarının üç oğlunu və ana tərəfindən babasını aradan götürmüşdür.

Bunları nəzərə alaraq, Yavuz Sultan Səlimi öz ailəsinin, öz qohum əqrabasının qatili adlandırsaq, yəqin ki, səhv etmərik, istəkli oxucular.



Sultan Səlim

Bu həddən artıq sərt təbiətli Sultanın edam etdirdikləri ancaq səltənət iddiasında olanlar deyildi. Vəzirlər, müxtəlif vəzifəli dövlət addamları, müxtəlif çinli hərbçilər də onun qəzəbinə düçar olub, bir andaca həyatlarını itirirdilər.

Divan toplanması ilə kimin isə edama göndərilməsi arasında böyük bir zaman və elə bir çətinlik yox idi. O zamanlar xalq arasında belə bir məsəl yayılmışdır. Kim başqasına qarğış eləmək istəyirdisə, "İnşallah Sultan Səlimə vəzir olarsan"

deyirdi. Çünki, vəzirin hər hansı bir səhv buraxaraq, edam olunma etimalı böyük idi.

Bəli, 42 yaşında hakimiyyətə gəlmiş, səkkiz il səltənət sahibi olmuş, üç dəfə böyük savaşa girmiş və üçündə də qalib gəlmiş, ölkəsinin ərazisini 3 dəfə genişləndirmişdi Yavuz Sultan Səlim. O belə Sultan idi.

Şah babamız Şah İsmayıl Xətai də əvvəlki söhbətlərimizdə deyildiyi kimi, az müddət ərzində yaratdığı dövlətin ərazisini dəfələrlə artıraraq, onu imperatorluq halına gətirmişdi. Belə şah idi Şah İsmayıl.

İndi bu iki türk hökmdarı arasında münaqişə ocağı yaranmışdı və bu munaqişə çox sürətlə alovlanır, təsir dairəsi genişlənirdi, ulu Borçalı. Bu münaqişə ocağının yaranma səbəbləri sizin yaxşı yadınızdadır, doğma Qaraqoyunlu, əziz Göyçə.

Hər şeydən əvvəl Sultan Səlim İranda hökm sürən başqa bir qüvvətli türk hökmdarını özü üçün təhlükə hesab edirdi və onu aradan götürmək istəyirdi. Bunun üçün ona tutarlı səbəb lazım idi. Həmin dövrdə səbəb tapmaq işə asan idi. Bu səbəblər hansılar idi?

Əvvəla qeyd edildiyi kimi, Osmanlı dövlətinin və Sultanın narazılığını nəzərə almadan Şah İsmayıl müxtəlif yollardan istifadə edərək, şiyəliyi yaymaqla məşğul idi.

Digər tərfəfdən Sultan Səlim taxta çıxdıqda bütün dövlətlər elçilər göndərərək, təbrik etdiyi halda, Şah İsmayıl nə elçi göndərmiş, nə də təbrik etmişdir.

Çünki Şah İsmayıl onu qanuni Sultan saymırdı. Yavuzun qardaşı Əhmədin iki oğlunu öz himayəsinə almışdı və Osmanlı taxtında onların oturmasını istəyirdi.

Həm Sultan Səlim, həm də Şah İsmayıl qüvvətlərinin ən yüksək nöqtəsinə çatmışdılar. Hər ikisi savaşa başlamaq üçün hazırlıq görürdü.

Şah İsmayıl Misir Sultanına elçilər göndərərək, Osmanlılara qarşı birlikdə hərəkət etmək istəmişdi. Digər tərəfədən də Şiyəliyi yaymaq üçün daha çox çalışırdı. Bunlar Şah İsmayıl üzərinə hərəkət etməyə əsas verirdi. Ancaq, bunun üçün bəzi tədbirlər görməli idi. Bu məqsədlə o, Rumelidə və Ana-

doluda şiyəliyi qəbul edərək, Şah ismayılın tərəfdarı olanları ya edam etdirdi, ya da sürgünə göndərdi. Müharibə olduğu halda arxadan vurulmayacağına əmin olduqdan sonra əyanlarını toplayaraq, onlara Şah İsmayılın üzərinə səfər edəcəyini bildirdi və 1514-cü ilin mart ayının 19-da ordu ilə birlikdə hərəkətə keçdi. Bir aydan artıq bir müddətdə yolda olub, İzmitə çatan ordu içərisində Şah İsmayılın bir casusu yaxalandı. Həmin casus vasitəsilə Sultan Səlim Şah İsmayıla bir məktub göndərdi.

Yenə də iki böyük türk dövləti arasında savaş havası, yenə də iki türk hökmdarı arasında narazılıq, yenə də məktublaşmalar, əziz oxucu. Oxşar tarixi hadisələr neçə dəfə təkrar olar, ulu Borçalı? Neçə dəfə iki böyük türk bir-birinin məhvinə çalışar, doğma Qaraqoyunlu?

Sultan Yavuz Şah İsmayıla göndərdiyi məktubda yazır:

“Mən Osmanlıların hökmdarı, qazilərin sərdarı, qəhrəmanların əfəndisiyəm, mən iman düşmənlərini yıxan, diktatorların qorxusu, zalım hökmdarların önündə diz çökdüyü II Bayazid oğlu Müzəffər Sultan Səlim Xan!

Sən Səfəvilərin şöhrətli İsmayılısan. İnsan ilahi buyruklara bağlı olmalı və din yolundan ayrılmamalıdır. Sultanlar ədalətli olmalı, zülmdən çəkinməlidirlər”.

Fikir verin, istəkli oxucular. Atasını, qardaşlarını, qardaşı oğlanlarını, babasını öldürən, bir çox qohum-əqrabalarını məhv edən, öz ailəsinin qatili adlanan Yavuz Şah İsmayılı ədalətli olmağa çağırır.

Sultan Yavuz Şah İsmayılın pis yolda olduğunu, inamının saflığının pozulduğunu, müsəlmanlara təzyiq qapılarını açdığını söyləyir və bütün bunları aradan qaldırmaq üçün savaşacağını bildirir və məktubunu belə davam etdirir:

“İndi İstanbuldan hərəkət eləyib sənə doğru gəlməkdəyik. Səni keçdiyin yerlərdə yüksəltdiyin alovların içində boğacayıq.

Bu məktubu yazmağımın səbəbi səni həqiqi, gerçək məzhəbi qucaqlamağa çağırmaqdır. Bizə bağlı olan ölkələrdən zorla qopardığın torpaqları buraxmanı tövsiyə edirik. Rahat, əminamanlıqda yaşamaq istəyirsənsə, söylədiklərimi

dərhal yerinə yetirməlisən!

Əgər xətalarınla davam etsən, hələ qüdrətli olduğunu sanaraq, çılğıncasına igidlik iddiasında israr etsən, az zaman içində obalarının çadırlarımızla qapandığını görəcəksən. Hidayət yolunda olanlara salam olsun! “

Belə bir məktub yazmışdı Sultan Səlim. Bu bir meydan oxuma, bu bir savaş elanı idi, ulu Göyçə.

Məktubu göndərib, özü yüz minlik ordu ilə yoluna davam etdi Sultan Səlim

Digər tərəfdən, Şah İsmayıl Osmanlı ordusunun keçəcəyi yerlərdə tikintiləri yıxır, zəmiləri yandırır ki, Yavuzun ordusunun əlinə ərzaq və yaşayış yerləri keçməsin. O, Yavuzun birinci məktubuna cavab vermir. Ona görə Sultan Şah İsmayıla ikinci məktubu yazır. Məktubla bərabər xüsusi maraq doğuran, fikirləşib, götürqoy eləyib, doğru nəticə çıxarmağı tələb edən qeyri-adi bir hədiyyə də göndərir. Bu hədiyyənin mahiyyətini açmaq üçün şifahi xalq ədəbiyyatına istinad etməmiz daha düzgün olardı. Çünki, şifahi xalq ədəbiyyatında, xüsusən də nağıllarımızda buna bənzər hadisələrlə dəfələrlə rast gəlmişik, hörmətli oxucu.

Biz yaxşı bilirik ki, bəzi hallarda hər-hansı bir nağıl qəhrəmanı digərinə öz fikrini, öz arzu və niyyətini çatdırmaq üçün hamının başa düşdüyü məktub vasitəsindən və yaxud qarşılıqlı söhbətdən istifadə etmək istəməmişdir. Buna səbəb çatdırılacaq fikrin bir sirr olması və başqalarının xəbərdar olmalarının ziyan gətirə biləcəyi olmuşdu.

Bəzi hallarda isə bu yolla biri digərinin dünya görüşünü, bacarığını, qabiliyyətini, savadını və etibarını sınağa çəkmişdir.

Nağıllarda göstərildiyi kimi, bəzi hallarda məktubda yazılası və yaxud qasid vasitəsi ilə şifahi şəkildə çatırılması mümkün olmayan fikirlər, arzu və niyyətlər xüsusi mənalar kəsb eləyən hədiyyələr və eyhamlar vasitəsilə çatdırılıb. Bu məchul mənaları, bu eyhamları aydındır ki, ancaq ağıllı, dünya görmüş, aqil adamlar açıqlaya biliblər.

O dövrdə Sultan Səlim və Şah İsmayıl da xalqımızın nağıl qəhrəmanlarına çevrilmişdilər.

Nağıllaşmanı əvvəlcə Sultan başladı. O, Şah İsmayıla eyhamlarla dolu bir hədiyyə göndərdi. Bu hədiyyə sizin yaddaşınızdan silinməyib, siz və sizinlə birlikdə Azərbaycanın bütün bölgələri yaxşı xatırlayır, ulu Borçalı, ulu Qaraqoyunlu, ulu Göyçə .

Arxalıqdan, əsadan, misvakdan (Ərəbistanda bitən xüsusi ağacdan düzəldilmiş diş təmizləyən), qurşaqdan ibarət bu hədiyyələrin nə demək olduğunu aydınlaşdırmağa çalışan Şah İsmayıl müəyyən etdi ki, bunlar hamısı Şeyx geyimlərinə aid olan əşyalardır.

Bununla nə demək istəyirdi Sultan Yavuz?

Həm də incə duyğular şairi olan Şah Xətai bu eyhama düzgün cavab tapmaqda heç bir çətinlik çəkmədi.

Sultan Şah İsmayıla demək istəyirdi ki, sən şah oğlu, şah nəvəsi, şah nəticəsi deyilsən, sən adi bir Şeyx ailəsindən gəlmisən. Özünü mənimlə bərabər tutmağa haqqın yoxdur. Bununla o özünün Sultan oğlu, Sultan nəvəsi, Sultan nəticəsi olduğunu, Şah İsmayıla xatırlatmaq və üstünlüyünü biruzə vermək istəyirdi. Əlbətdə bunun hansı məna verdiyini hər şeydən əvvəl həm də böyük şair olan Xətai çox gözəl dərk eləyirdi.

İkinci məktuba da cavab almayan Sultan bu saymazyanalığa cavab olaraq ordusu ilə birgə böyük sürətlə hərəkətə keçdi və uzun yol qət edərək az bir müddət ərzində Ərzincana çatdı və üçüncü məktubu yazdı.

Əvvəlki iki məktub farsca yazılmışdı, üçüncü məktubu isə türkcə yazdı Sultan.

Əvvəlki məktublardakı bəzi fikirlərin müəyyən qədər fərqli formada təkrarlanmasından əlavə, üçüncü məktubda uzun yol qət edərək ona tərəf gəldiyinə baxmayaraq, nə özü, nə də ordusu ilə qarşılaşmamasına münasibət bildirdi və Şahı qorxaqlıqda ittiham etdi, Sultan Yavuz. Sərt bir hökmdar olmaqla yanaşı böyük şairlik səviyyəsinə yüksələ bilməsə də, həm də şeir də yazırdı, şairlik qabiliyyətinə malik idi Sultan Səlim. Sultan haqda deyilənlərə əmin olmaq üçün onun göndərdiyi üçüncü məktuba fikir verin, istəkli oxucular.

Sultan duyğularını belə biruzə verir:

“Sərvərlik sevdasında olanlar qılıncdan və savaş baltasından qorxmazlar.

Dövlət adlı gəlini, heç nədən qorxmadan qılınc dodaqları öpə bilənlər qucaqlaya bilir. Qaranlıqda rahatlıq arayanlara “Ər” deyilməsi xətadır, ölümdən qorxanlar ata minməyə və qılınc qurşamağa layiq deyil”.

Göründüyü kimi “dövlət adlı gəlin”, “onu qucmaq istəyən aşiq” və bu “istəkli gəlinin” “qılınc dodaqları” kimi deyimlər Sultanın şairlik təxayülünün məhsuludur.

Üçüncü məktub yazıldığı vaxt Sultanın Şah İsmayıl üzərinə hücuma keçməsindən dörd ay keçmişdi. Dörd ay idi ki, yüz minlik ordu yollarda idi. Yorğunluq, aclıq, ruh düşgünlüyü günü-gündən artırdı. Ordu əziyyət çəkirdi, yol boyu hər şey Şah İsmaıyl tərəfindən dağıdılmışdı, ərzaq ambarları yandırılmışdı, düşmən isə görünmürdü, üzə çıxmırdı ki, çıxmırdı. Əlbətdə ki, bütün bunlar yuxarıda qeyd edilən məzmunda məktubun yazılmasına səbəb olmuşdu, istəkli oxucular.

Nəhayət Sultan Səlimin səbirsizliklə gözlədiyi gün gəlib çatdı. 1514-cü ilin iyul ayının 18 də Şah İsmayılın elçiləri göndərilən üç məktuba cavab gətirdilər.

Şah İsmayıl Sultan Səlimin göndərdiyi məktublara və eyham dolu hədiyyələrə qarşılıq olaraq, məktub və eyhamla da cavab vermişdi. Onun göndərdiyi hədiyyə qızıl qutudan və həmin qutu içərisindəki narkotiklə dolu balaca bir qabdan ibarət idi.

Deməli, Şah babamız Şah Xətai eyhama eyhamla cavab verdi, o da nağıllarımızdan bəhrələnərək nağıllaşdı, o da hikmət dəryasına baş vurdu.

Şah İsmayıl ədibanə və qüvvətli ifadələrlə yazdığı məktubda Yavuzu savaşa sürükləyən səbəbi anlamadığını söyləyir, padişaha yaraşmayan o məktubları yəqin ki, onun özünün deyil, narkotik qəbul etmiş katiblərin yazdığını bildirir. Bunu nəzərə alaraq narkotik qutusunu xüsusi olaraq onlar üçün göndərdiyini qeyd edir.

Şah İsmayıl bu məktubu İsfahanda ov etdiyi vaxt yazdığını qeyd edir və dostcasına yazılan bu cavab Sultan tərə-

findən yaxşı qarşılanmasa, onun üzərinə ordu ilə gələcəyini bildirir.

Fikir verin, Sultan Səlim kimi zəhmli və çox qüvvətli bir hökmdar yüz minlik ordu ilə üzərinə gəlir, o isə saymazyana şəkildə bildirçin ovuna çıxır. Üstəlik onun yazdığı üç məktuba cəmisi bir məktubla cavab verir.

Şah İsmayılın ovçuluğu, ova əludəçiliyi ilə əlaqədar olan söhbətimizin bu hissəsi yaddaşımı təzələdi, məni uşaqlıq dövrümə qaytardı və kövrək hisslərimi oyadaraq, kövrəltdi. Uşaqlıq illəri, kəndimiz, aşıqlar məclisi yadıma düşdü.

İkinci dünya müharibəsindən sonraki illər idi. Camaat çox pis dolanırdı, kənddə nə radio, nə də televizor var idi. Vaxtaşırı aşıqlar gəlirdi. Onlar ya əmim gilə, ya da bizə qonaq olardılar. Kənd camaatı axşam işdən sonra yığışıb, aşıqların soylədiyi dastanlara qulaq asardılar. Dastan məclisdəkilərin təklifinə əsasən seçilərdi. Çox yayılmış dastanlardan biri də Şah İsmayıl dastanı idi.

Cilli aşıq Yunusun "Şah İsmayıl" dastanından söylədiyi öv səhnəsi hələ də yaddaşımdan silinməyib.

Şah İsmayıl gecə yatdığı zaman yuxusunda bir qız görür və ona aşiq olur. Yuxudan oyanır, gördüyünün ancaq yuxu olduğuna təəssüflənir, əhvalı pozulur.

Yuxusunda gördüyü qızın xəyalı ilə yaşayır. Dərdini dağıtmaq məqsədi ilə ova çıxmağı əmr edir. Əyanları ilə birlikdə ova çıxır.

Şah İsmayıl gözəl bir göy çəmənlikdə gözəl bir ceyran görür. Ceyran Şahın xoşuna gəlir. Şah İsmayıl belə bir şərt kəsir ki, ceyranı mühasirəyə alıb, diri tutmaq lazımdır. Onu vurmaq olmaz. Belə bir şərt də kəsir ki, ceyran kim tərəfdən mühasirədən çıxıb qaçsa, ceyranı həmin ovçu təqib etməli və mütləq tutub, gətirməlidir. Əks təqdirdə boynu vurulacaqdır.

Ceyranı mühasirəyə alırlar. Mühasirə getdikcə daralır. Ceyran bir özünə, bir də onu əhatə edən ovçulara baxır və yerdən ayağını quş kimi üzüb, yay kimi dartılıb, ox kimi süzüb, düz Şah İsmayılın yanından mühasirədən çıxaraq, qaçır. Şərtə əməl etməyə məcbur olan Şah İsmayıl ceyranı təqib eləyir. Şahın atı ceyrana çata bilmir.

Ceyran qaçaraq bir evə girir. Şah İsmayıl ceyranın arxasınca evə girmək istədikdə qarşısını kəsib, içəri girməyə icazə vermirlər və bu evə ceyran girmədiyini söyləyirlər.

Ovçu libasında olan, tanınmayan və Şah olduğu bilinməyən Şah İsmayıl: bir ceyranı qova-qova gətirdim, itirdim burada bir şikar yeri misraları ilə başlayan üç bənd şeri sazla və sözlə deyərək, yarı zor, yarı xoş içəri daxil olur. Şahın qarşısına yuxuda gördüyü, ilahi tərəfindən bəxtinə yazılmış sevgilisi çıxır. İki həsrət bir-biri ilə görüşür. Qırx gün, qırx gecə toy eləyib xoşbəxt olurlar.

Bəli, Şah İsmayıl Sultan Yavuza məktubu ov etdiyi zaman yazdığını bildirdikdə mənim uşaqlıq dövründən yaddaşıma həkk olunmuş bu ov hadisəsi düşdü, ulu Borçalı, doğma Qaraqoyunlu.

Aşıqların söylədiyi bu ov səhnəsi dastanlarımızın real həyatdan götürülüb, xalq arasında yayılaraq, dastanlaşdığını və şifahi xalq ədəbiyyatına çevrildiyini göstərir.

Şah İsmayılın yazdığı məktub Sultanı əsəbləşdirir və o, dərhal böyük bir sürətlə hərəkətə keçir. Amma, Şahla və onun ordusu ilə rastlaşmır ki, rastlaşmır. Əksinə, ordunun keçdiyi və keçəcəyi bütün yolların dağıldığının, ərzaq ambarlarının yandırıldığının şahidi olur.

Bu Sultanı daha da qəzəbləndirir. Ordunun ac qalması təhlükəsi özünü göstərməyə başlayır. Bir çoxları səfərin davam etməsinə qarşı çıxır, geri dönmək istəyirdi. Bu fikrə tədricən vəzirlər də qatıldı. Nəhayət bir gün Yavuz Səlimin uşaqlıq dostu olan Qaraman bəylərbəyi Həmdəm Paşa vəzirlərin təkidi ilə onun yanına gedib, ordunun irəliləməsinin təhlükəli ola biləcəini söylədi.

Həm vəzirlərin sözündən çıxmaq istəməmiş, həm də ən yaxın dostu kimi ərk edib, bel bağlayaraq, getmişdi Sultanın yanına Həmdəm Paşa. Amma, çox hərarətli odla oynamışdı. Axırı yaxşı olmaya bilərdi bu işin. Elə də oldu, əziz oxucu.

Çox yaxın dostu olmasına baxmayaraq,Yavuz Həmdəm Paşanı dərhal edam etdirdi və Şah İsmayıla dördüncü məktubunu yazaraq, yoluna davam etdi.

O, məktubda xüsusən bunları söylədi: "İsmayıl Bahadır!

Sən mənim ölkəmin sərhədləri üzərində görünməklə, mənə meydan oxudun. Mən də gəldim. Həftələrlə irəliləməyə baxmayaraq, nə səndən, nə də əskərlərindən bir əsər var. Ölmüsən, sağmısan, bilmirəm. Sən hiylə və intriqadan başqa bir şey bilirsənmi? Qorxursansa bir həkim çağır müalicə eləsin. Səni qorxutmamaq üçün

əskərlərdən qırx minini Qayseridə saxladım. Özünü qızlətməkdə davam etsən kişi sayılmazsan. Öyütlərimi yaxşı dinlə. Papaq yerinə qadın örpəyi, zireh yerinə çarşaf geyərək, hökm eləmək arzusundan vaz keç”

Sultan məktubunda haqqında bəhs etdiyi qadın geyimlərini də məktubla birlikdə Şah İsmayıla hədiyyə göndərdi. Əlbətdə ki, bu təhqirə heç kim, o cümlədən Şah İsmayıl da dözə bilməzdi.

Nəhayət, hərəkətə başlayandan beş ay sonra, 1514-cü ilin 23 avqustunda Sultan Səlimin bu uzun yolda gecə-gündüz əziyyətə qatlanmış, yorulub, taqətdən düşmüş, müəyyən qədər ruh düşgünlüyünə məruz qalmış ordusu Maku yaxınlığındakı Çaldıran obasında Şah İsmayılın ordusu ilə qarşı-qarşıya dayandı. Maku güney Azərbaycanda, Türkiyənin indiki sərhəddinin yaxınlığında yerləşən qədim şəhərlərdəndir.

Həmin günlərdə qeyri-adi bir təbiət hadisəsi baş verdi. Bu hadisə Yavuzun ordusunda əhval-ruhiyyənin yüksəlməsinə səbəb oldu.

Bildiyimiz kimi İranlılar həmişə günəşə səcdə etmişlər. Ona görə də Şah İsmayılın möhüründə də günəş rəsmi var idi. Şah İsmayıl üzərinə yürüş davam etdiyi, Sultan ordusunda ruh düşgünlüyü, yorğunluq yarandığı, ərzaq çatışmaması ehtimalının yüksəldiyi bir vaxt günəş tutuldu. Sultanın münəccimləri bundan məharətlə istifadə etdilər. Onlar orduda təbliğat apararaq, günəş tutulmasının Şah İsmayılın günəşinin sönməsini göstərdiyini təbliğ elədilər. Bu orduda ruh düşgünlüyünün aradan qaldırılmasına, əskərlərin döyüş qabiliyyətinin yüksəlməsinə çox kömək etdi.

Əmir Teymurla Yıldırım Bayazid, Fateh Mehmetlə Uzun Həsən arasındakı savaşlar kimi, bu savaş da iki böyük türk

hökmdarları, iki nəhəng türk ölkəsi arasında baş verirdi, nəticəsi ancaq düşmənləri sevindirəcəkdi, əziz oxucular.

Nəhayət, savaş başladı və Sultan Səlim qalib gəldi.

Şahın əsir düşməsini istəməyən bir əskər "Şah mənəm!" deyə özünü təslim etdi, digər bir əskər isə öz atını Şah İsmayıla verdi. Şah həmin ata minib, döyüş meydanından çıxaraq, Təbrizə qaçdı, oradan isə İranın içərilərinə tərəf geri çəkildi.

Şah İsmayılın ordugahı, taxtı, xəzinəsi, atlas çadırı, həddi-hesabı olmayan cəvahiratı Sultanın əlinə keçdi.

Şah İsmayılın arvadlarından biri olan Taclı Xanım və bəzi əmirlərin arvadları da əsir alındılar.

Nəticədə, bütün dünya tarixinin gedişinə böyük təsir göstərən bu müharibə ümumiyyətlə turk dünyasının ziyanına və yad millətlərin, bütün avropanın xeyrinə olaraq başa çatdı, ulu Göyçə.

Aylarla yol gələrək, Çaldıranda dünyanın ən güclü ordularından birini yenmiş, ən böyük qəniməti qazanmış Yavuz ertəsi gün vəzirlərin və komandanların təbriklərini qəbul etdi, əskərlərə ərmağanlar dağıtdı və şəhidləri dəfn etdirdi. İki gün dincəldikdən sonra Sultan Səlim böyük təntənə ilə, 1514-cü ilin 8 sentyabırında paytaxt şəhəri olan Təbrizə gəldi. O 9 gün Təbrizdə qaldıqdan sonra İstanbula qayıtdı. Yavuzun Şah İsmayıl üzərinə səfərə çıxması ilə İstanbula qayıtması 14 ay 15 gün çəkdi.

Bu müharibə nəticəsində Səfəvilər dövlətinin tərkibində olan Diyarbəkir, Mardin, Qaziantəpə, Tunceli, Adana, Urfa, Hatay, Muş, Siirt, Mingöl və Bitlis rayonları, Dulkadir bəyliyi, indi ABŞ və İngiltərəninn İrakla apardığı savaş zamanı hamımızın göz tikdiyimiz Mosul, Kərkür, Erbil bölgələri və doğma Azərbaycanımızla birlikdə doğma Qaraqoyunlu, ulu Borçalı, əziz Göyçə Siz də Osmanlı dövlətinin tərkibinə qatıldınız. Ancaq, bu uzun sürmədi. Çünki, geri çəkilərkən, Sultan səlim Təbrizdə, ümumiyyətlə Azərbaycanda hərbi qüvvələr saxlamamışdı. Bundan istifadə eləyən Şah İsmayıl bir müddət keçdikdən sonra Azərbaycanı yenidən ələ keçirdi. Yavuzun Təbrizdə, Azərbaycanda əskər saxlamamasına səbəb İstanbulda bəzi qüvvələrin üsyan qaldırması oldu.

Nə deyim, bəlkə də Sultana Təbriz və ümumiyyətlə Azərbaycan lazım deyildi. O, vaxtı ilə Türkiyəyə daxil olan rayonları geri almışdı, saysız-hesabsız qənimətlər ələ keçirmişdi. O, əməllərindən qalib kimi razı idi. Bəlkə elə buna görə Sultan Yavuz Şah İsmayılı ölkənin içərisinə doğru təqib etməkdən əl çəkmişdi.

Çaldıran savaşında uduzduqdan sonra Osmanlı imperiyasına qarşı öz mübarizəsini davam etdirmək məqsədilə Şah İsmayıl Venesiya, Macarıstan, Almaniya, Roma papalığı ilə diplomatik danışıqlar aparsa da, nəticəsi olmadı.

Sonraki illərdə Şah İsmaıyl Şəki hakimiyyətini, Şirvanşahları, Gürcü çarlığını Səfəvilərdən assılı vəziyyətə saldı.

Şah İsmayıl az, amma mənalı, bir neçə ömürə dəyən keşməkeşli bir ömür yaşadı. Körpəliyi dustaqlıqda, 13 yaşından sonrakı həyatı hakimiyyətdə, at belində vuruşlarda, bəzən də bir-birindən gözəl şerlər yaratmaqda keçdi. Qocalığını görmədi, qocalmamış dünyasını dəyişdi. Həyatının bütün dövrləri kimi, ömrünün istənilən anı kimi, ölümü də çox maraqlı oldu, qədirbilən oxucu.

Bu böyük insanın son dərəcə maraqlı bir ömrü belə başa çatdı: Şah İsmayıl ölümündən bir qədər əvvəl yorğunluq hiss etdiyindən, az da olsa dincəlmək və möhkəmlənmək ümidi ilə Şəkiyə gəlib, Şahdağda ov etmək istəyir. Şəkidə yerli əhali ona Şahdağdakı heyvanları ovlamağın sınaqlı olduğunu, bu ovlamanın adətən yaxşı nəticə vermədiyini bildirirlər, əziz oxucu.

Şah İsmayıl deyilənlərə əhəmiyyət vermir və böyük həvəslə ova çıxır. Dünyanın işinə bax, əziz oxucu.

Deyilənlər düz çıxır. Bu müdhiş hadisə kiminsə, adi bir insanın deyil, böyük Şah İsmayılın başına gəlir, onun taleinə yazılır.

Xalq arasında deyilənləri və Şah İsmayılın taleyinə yazılan nəticəni təsəvvürünüzə gətirin, istəkli oxucular.

Ov şənliyi qurtarar-qurtarmaz Şah xəstələnir və Şəkidən Ərdəbilə qayıdır. Orada da halı yaxşılaşmadığına görə, Təbrizə yola düşür. Ancaq, Təbrizə çatmamış, yarı yolda, Sərab yaxınlığında, 1524-cü ilin iyununda 37 yaşında vəfat edir və

Ərdəbilə gətirilərək Şeyx Səfi türbəsində dəfn edilir.

Böyük hökmdar olmaqla yanaşı, Şah babamız Şah Xətai eyni zamanda Azərbaycan türkcəsi, fars və ərəb dillərində bir-birindən gözəl və qiymətli şeirlər yazan böyük şairdir. Onun yaradıcılığı Azərbaycan poeziyası tarixində mühüm mərhələ təşkil edir.

Nəsimi şerindən yetərincə bəhrələnmiş Xətai əruz və heca vəznlərində həm klassik, həm də xalq şeri formalarında epik və lirik əsərlər yaratmışdır.

Xətainin "Dəhnamə" (on məktub) poeması və "nəsihətnamə" məsnəvisi Azərbaycan epik şerinin ilk nümunələrindəndir.

Şah İsmayılın lirikasında qəhrəmanlığa, mübarizəyə çağırış, həyat eşqi, gözəllik, mənəvi saflıq, eləcə də vusal sevinci və ayrılıq iztirabları böyük ustalıqla tərənnüm olunur.

O, Azərbaycan türkcəsində yazan şairlərə hamilik etmiş, sarayında şerlər məclisi yaratmışdır.

Onun hakimyyəti dövründə Azərbaycan türkcəsi dövlət dili səviyyəsinə yüksəlmiş, diplomatik yazışmalarda istifadə edilmşdir.

Bütün bunları nəzərə almaqla belə bir nəticəyə gələ bilərik ki, Şahlığını, Azərbaycanı birləşdirib, bütöv bir dövlət halına gətirmək kimi müqəddəs arzularını, haqsız olaraq nəzərə almasaq belə, bir şair kimi Şah İsmayıl xalqımızın ən böyük simalarından biridir və sevilməyə, qiymətləndirilməyə və daim anılmağa layiqdir.

Şah İsmayılın yaşadığı dövrün ən böyük simalarından biri, daha doğrusu mübaliğəsiz demək olar ki, ən birincisi gün kimi parlayıb, şeir-sənət dünyasına işıq saçan Məhəmməd Füzulidir.

Şah İsmaıylın dünyaya göz açdığı ildən 8 il sonra 1495-ci ildə, son araşdırmalara görə Kərbəlada doğulub, 62 il ömür sürən və orada da ilahi dərgahına yüksəlib, əbədiyyata qovuşan Füzuli.

Öz dövründə Şairlərin sultanı adlanan, ancaq sadəcə şairlərin sultanı deyil, həm də şeirin sultanı olan, sünilikdən, bayağılıqdan, təlqinçilikdən, təkrarçılıqdan uzaq Füzuli baba.

Yazdıqlarında öz taleyindən bəhz etməyən, ona görə də, həyatının bir çox sahələri qaranlıq qalan, divan ədəbiyyatının ən böyük ustadı Fizuli baba.

Yaradıcılığında ən böyük üstünlüyü öz dilinə, Azərbaycan türkcəsinə verən, həmin dildə ölməz əsərlər yaradan və özü də ölməzliyə qovuşan, həmişə yaşar Məhəmməd Füzuli.


Füzuli

Özündən sonra gələnlərin hamısını 100 illər boyu öz təsiri altında saxlayan, ülvi, nəhayətsiz və ilahi duyğuların cənnətini, o cənnətin gülüstan bağını bizlərə göstərən Füzuli.

Xəyalın gücünü, eşqin dərinliyini və qəlbin hüznlüyünü olduğu kimi təlqin eləyən Füzuli.

Başqa nə deyim ki, ona yaraşan olsun? Axı mən nə deyə bilərəm Məhəmməd Füzuli haqda, ulu Qaraqoyunlu, ulu Borçalı, istəkli oxucu?

Onun haqda layiq ola biləcək nə isə deməyə mənim nə gücüm var, nə də qüdrətim çatır.

Onun haqda çox deyilib-yazılıb, deyilir-yazılır və hələ çox deyiləcək, yazılacaq. Ancaq, nə qədər deyilsə də, yazılsa da, onların heç biri onun layiq olduğu ilahi səviyyəni yəqin ki, layiqincə əks etdirə bilməyəcək.

Əlbətdə ki, mən də Füzuli haqda ona layiq ola biləcək nə isə deməkdə acizlərdən biriyəm. Ancaq, mötəbər məclislərdən birində aqillərdən birinin Füzuli babamız haqda danışdığı əhvalatı nəzərinzə çatdırmaq və bununla da fikrimi tamamlamaq istəyirəm, əziz oxucular.

Həmin məclisdə iştirak eləyən dostlarımdan birinin dediyinə görə, aralarında məşhur alimlərimizdən biri, mərhum Əli Fəhminin də olduğu bir qrup alim Nardarana, çox məlumatlı Füzulişünas olan, Füzuli yaradıcılığını əzbər bilən və dəqiq təhlil eləyən bir axundun yanına gedirlər.

Qonaqların gəldiyini görən axund əlindəki kitabı və dəftəri əsəbi halda, zərblə stolun üstünə ataraq, ayağa qalxır və onları qarşılamağa gəlir. Axundun bu hərəkəti qonaqları məyus edir. Səbəbini soruşduqda axund belə cavab verir:

Stolun üstünə çırpdığım kitab Füzulinin kitabıdır. Ordakı bir beyti on beş dəfə tərcümə və şərh etmişəm, ancaq heç biri Füzulinin demək istədiyini tam əks etdirmədiyinə görə məni qane etməyib. Bu gün bu beyt üzərində on altıncı dəfə işlədim, yenə də istəyimə nail ola bilmədim. Bir daha Füzuli dühası qarşısında, onun böyüklüyü, ucalığı önündə öz gücsüzlüyümü, öz kiçikliyimi və acizliyimi bir daha anlayaraq, əsəbləşdim və özümdən asılı olmayaraq, kitabı stolun üstünə çırpdım. Mənim ilk baxışdan yersiz görünən bu hərəkətim sizin gəlişinizlə əlaqədar deyil. Gəlişinizə ürəkdən şadam, xoş gəlib, səfa gətirmisiniz. Füzuli şerini oxuculara Füzulinin öz istədiyi, özünün düşündüyü kimi çatdırmaq lazımdır. Onu təhrif etmək günahdır.

Axund Füzuli yaradıcılığı haqda söhbətini davam etdirərək, fikrini belə yekunlaşdırır: Bir yerdə ölü düşsə, ancaq onu götürmək üçün quran olmasa və molla tapılmasa Füzulinin yazdıqlarından istifadə edərək, cənazəni yerdən götürmək və mərhumu dəfn etmək olar.

Aman allah, bu nə deməkdir? Füzuli yaradıcılığındakı böyüklüyə, aliliyə, ülviliyə, ucalığa, ululuğa, dərinliyə və nəhayət ilahiliyə baxın, qədir bilən oxucular.

Bu əhvalatın baş verməsinin və deyilənlərin nə dərəcədə dəqiq və düzgün olmasından asılı olmayaraq, Füzuli dühası haqda bundan qiymətli fikir söyləmək əminəm ki, qeyri-mümkündür.

Çaldıran savaşı baş verəndə Füzulinin 19 yaşı var idi. O, iki böyük hökmdar türkün yersiz qürur və mənliyi ucbatından törənən Çaldıran savaşından aldığı təəssüratı ürək ağrısı ilə qələmə alaraq, "Bəngü Badə" poemasını yaratmış və Şah İsmayıla ithaf etmişdir. Allah ona rəhmət eləsin.

Şah İsmayıl dövrünün bizim üçün böyük və anılmalı şəxsiyyətlərindən biri də İran Azərbaycanının Diri kəndində dünyaya gəlmiş, doğulduğu və dünyasını dəyişdiyi ili dəqiq

məlum olmayan böyük Azərbaycan aşığı Qurbanidr. Əsl adı Qurban olan, Xətai ilə tanışlığa qədər "Dirili Qurban" imzası ilə yazan şair sonralar Qurbani təxəllüsünü qəbul etmişdir.

Ədəbi irsi tam halda məlum olmayan Qurbani bir müddət Şah İsmayılın sarayında fəaliyyət göstərmiş, əksəriyyəti lirik gözəlləmələrdən ibirət olan əvəzsiz şer nümunələritəcnis, müxəmməs, ustadnamə və divanilər yaratmışdır.

Şah İsmayılla yaxından tanış olan, məclislərində dəfələrlə iştirak eləyən və onun şəninə şeirlər həsr eləyən Qurbani növbəti dəfə görüşməyə getdikdə bu əzəmətli şahın, incə qəlbli şairin və nəhayət, yaxın dostunun ölüm xəbərini eşidir. Olduqca mütəəsir olan aşıq birinci bəndi aşağıda verilmiş "ola" rədifli üç bənddən ibarət şerini bu xəbərə həsr eləyir.

Fələk, sənlə vuruşmağa bir qabil meydan ola,
Tut əlimi, fürsət sənin, kaş belə ehsan ola.
Getmiş idim mürşüdümə, dərdimə dəva qıla,
Mən nə bilim, mən gəlincə xak ilə yeksan ola.

O, Azərbaycan türkcəsinin xalq dilinin zəngin bədii imkanla-rından məharətlə istifadə etmiş, orijinal təsvir vasitələrindən bacarıqla bəhrələnmişdir. Qurbaninin aşıqlarımız və müğənnilərimiz tərəfindən indi də tez-tez oxunan bir çox şeirləri dillər əzbəridir.

Kimi ağa, kimi nökər,
Nökər olan cəfa çəkər,
Bülbül ağlar, qan-yaş tökər,
Bağı dolana-dolana.

Qurbani murada yetdi,
Canan gəldi burdan ötdü,
Nobat gəldi, mana çatdı,
Saqi dolana-dolana.

Durum dolanım başına,
Aşiqindən küsən dilbər!
Gözlərini dik gözümə,
Nə mən dinim nə sən dilbər!

Qurbani özünə bəydi,
Yar həsrəti qəddim əydi,
Nə dedim xətrinə dəydi,
Bu mən dilbər, bu sən dilbər!

Sallana-sallana gedən salatın,
Gəl belə sallanma, göz dəyər sənə,
Al-yaşıl geyinib qarşımda durma,
Yayın bəd nəzərdən, söz dəyər sənə.

Başına döndüyüm, ay qəşəng pəri,
Adətdi dərərlər yaz bənövşəni.
Ağ nazik əlinlə dər, dəstə bağla,
Tər buxaq altında düz bənövşəni.

Qurbani der: könlüm bundan sayrıdı,
Nə etmişəm yarım məndən ayrıdı,
Ayrılıqmı çəkib boynu əyridi,
Heç yerdə görmədim düz bənövşəni.

Qurbani qəmlənmə, kərəm-kanı var,
Ədalət hakimin haqq divanı var,
Bu çərxi-fələyin nərdivani var,
Enən ağlayarmış, qalxan gülərmiş.

Hərəsindən bir-iki bənd götürülmüş bu seir nümunələrini kim bilmir, kimlər bu şerlərlə bağlı mahnıları radio dalğalarından, mavi ekranlardan eşitməmiş, toy məclislərində, böyük konsert salonlarında oxunmasının dəfələrlə şahidi olmamışdır?

Nizami Gəncəvinin məqbərəsi yanında Mahmud bəyin “sən kimsən və haralısan?” sualına “Qaradağlıyam ay bəy, adım da Qurbanidir” deyir. Başqa bir aşığın eyni məzmunlu sualına Qaradağdan Qarabağa gedirəm, ismim Qurbanidi, kəndim Diridi, deyə cavab verən Qurbani Azərbaycan ellərini qarış-qarış gəzmiş-dolaşmış, hər yerdə, o cümlədən Qərbi Azərbaycan ellərində də böyük hörmət sahibi olmuşdur. Qur-

baninin həyatı və şeirləri əsasında çox hissəsi Gəncə və Qarabağla bağlı olan "Qurbani" adlı gözəl bir məhəbbət dastanı yaradılmışdır.

Qurbaninin dünyaya göz açdığı Diri kəndi ilə, Şah İsmayıl və onun sarayı ilə, habelə Gəncə elləri ilə bağlı olan bu dastanın Azərbaycan şifahi xalq ədəbiyyatında özünəməxsus yeri vardır.

Hörmətli oxucular, Şah İsmayıl tərəfindən qurulan səfəvi dövləti 234 il yaşadı. Şah İsmayıl Xətai də daxil olmaqla, on bir şah şahlıq taxtına əyləşdi. Hökmdarlıq atadan oğula, oğuldan nəvəyə keçdiyinə görə, bu şahların hamısı qohum-əqraba oldu. Bu 234 ildə iki Şah İsmayıl (I və II), iki Təhmasib (I,II), üç Abbas (I,II,III) və dörd müxtəlif adlı hökmdarlar şahlıq etdi. Bunlardan iki nəfəri şahlıq taxtında ən uzun müddət əyləşən şahlardır. Onlardan biri Şah İsmayılın oğlu I Təhmasib, ikincisi isə nəticəsi I Şah Abbas olmuşdur. Bu iki hökmdarın birlikdə şahlıq davrü düz 94 il sürmüşdür, istəkli oxucular, 94 ilin 52 ili I Təhmasibin, 42 ili isə I Şah Abbasın ömür payına yazılıbmış.

On bir hökmdardan altısı birlikdə 103 il şah olmuşdur.

Ölkənin paytaxtı müxtəlif vaxtlarda müxtəlif şəhərlər olmuşdur. Bu şəhərlərə Təbriz, Qəzvin və İsfahan aiddir.

Səfəvilər dövləti yaranandan Azərbaycan dövləti kimi fəaliyyət göstərdi.Yuxarıda qeyd etdiyimiz kimi, Azərbaycan türkləri dövlətin bütün fəaliyyət sahələrində aparıcı rol oynadı, bütün vəzifələrdə və orduda Azərbaycanlılar üstünlük təşkil etdi. Azərbaycan dili geniş istifadə sahəsinə daxil oldu.

I Təhmasibin dövründə (1524-1576) Osmanlı imperiyası ilə üç dəfə toqquşma baş vermişdir.Nəticəsi olmayan bu toqquşmalardan sonra,1555-ci ildəAmasiya müqaviləsi adlı tarixi bir müqavilə bağlanaraq, sülh yaranmışdır.

465 il bundan əvvəl Şirvan, 448 il əvvəl isə Şəki Səfəvilər dövlətinə qatılmışdır.

Elə həmin dövrlərdə ulu Borçalı sən də bir neçə dəfə Səfəvilər dövlətinə tabe vəziyyətdə olmusan, öz millətinin qurduğu və hökmranlıq etdiyi ölkədə yaşamısan.

Avropalılar bütün dövrlərdə olduğu kimi Səfəvilərdən

də Osmanlı əleyhinə istifadə etməyə çalışırdılar.

I Təhmasib öləndən sonra Səfəvi əmirləri arasında çəkişmələr baş verdi və ölkə zəiflədi. O dövrdə ölkədə fəaliyyət göstərən 74 əmirin 68-i Azərbaycan türkləri idi.

Osmanlı dövləti bu fürsətdən istifadə etdi. 1590-cı ildə İstanbul müqaviləsi imzalandı. Ermənistan, Gürcüstan, Azərbaycan və İranın bəzi batı vilayətləri Osmanlı imperiasının tərkibinə keçdi. Deməli həmin dövrdə siz də həmin tərkibə daxil oldunuz, doğma Qaraqoyunlu, ulu Göyçə, əziz Borçalı.

Sonra hakimiyyətə Şah İsmayıl Xətainin nəticəsi olan I Abbas (1587-1629) gəldi.

O, paytaxtı İsfahana köçürdü. Onun apardığı siyasət nəticəsində Azərbaycan və Azərbaycan türkləri Səfəvilər dövləti daxilində aparıcı rolunu, siyasi, hərbi üstünlüyünü itirdi, Azərbaycanlıların hüquqları məhdudlaşdı, sarayda fars əyanları tədricən hakim mövqe tutdu və yavaş-yavaş Azərbaycan İranın əyalətlərindən birinə çevrildi.

Daimi ordu yaradaraq, daxili çəkişmələrə son qoyan I Şah Abbasın səyi nəticəsində ölkə inkişaf etdi. I Şah Abbas Azərbaycanı, Xorasanı Osmanlılardan geri aldı.

Ancaq, I Şah Abbasın hökmranlığı başa çatdıqdan, o dünyasını dəyişdikdən sonra II Təhmasibin dövründə hadisələr əksinə, arzu olunmayan istiqamətdə inkişaf etdi. Ölkə daxilində siyasi böhran dərinləşdi. Bundan istifadə eləyən Osmanlılar Zaqafqaziyanı və qərbi İranı, Rusiya isə Ənzəliyədək Xəzər sahili ərazini ələ keçirdi. II Təhmasib həmin ərazilərin Rusiyanın tabeliyinə keçməsi barədə müqavilə imzalamağa məcbur oldu.

Beləliklə, Səfəvilər dövlətinin vəziyyəti pisləşdi, ölkə zəiflədi. Yaranmış şəraitdən yararlanan Səfəvi sərkərdəsi Nadir xan Avşar (Nadir şah) 1736-cı ildə özünü şah elan etdi və Səfəvilər dövlətinə son qoydu.

Nəticədə hakimiyyət yenə də türklərin, bu dəfə avşarların əlinə keçdi. Avşar xanədanı cəmisi 13 il yaşadı.

## 6. Qacar, İbrahim xan və Molla Pənah Vaqif.

Avşarlardan sonra hakimiyyət Qacarlara, yenə də Azərbaycan türklərinin əlinə keçdi. Qacarların hakimiyyəti 1925-ci ilədək yaşadı.

Səfəvilərin hakimiyyətinin son dövrlərindən başlayan, Avşarlar və Qacarlar dövründə davam etdirilən siyasət nəticəsində Azərbaycan Dövləti tədricən İran dövlətinə çevrildi.

Bildiyimiz kimi kiçik bir kənddən tutmuş böyük ölkələrə qədər cəmiyyət eyni soykökə, eyni millətə, dinə, dilə, məzhəbə malik müxtəlif tayfalardan ibarət olur. O cümlədən İranda yaşayan Azərbaycan türkləri də səfəvi, avşar, zənd, qacar və s. tayfalardan ibarət idi. Bu və ya digər tayfalardan hər biri dövlətin yaşamasında, tərəqqisində və bəzən də idarə olunmasında aparıcı rol oynamışdır.

Səfəvi və avşarların hökmdarlığına son qoymuş qacarlar da qıpcaq əsilli türklər idilər və demək olar ki, İranın hər yerində, ən çox isə quzey doğuşundakı Xorasanda, İrak türkmənləri ilə qonşu olan Astrabadda, Gürcüstan sərhədlərində, Azərbaycanın quzeyində, Qarabağda, Gəncədə, İrəvan tərəflərdə yaşayırdılar.

Qacarlar da səfəvilər kimi qızılbaşlar idilər. Bu iki tayfa arasında həmişə etibarlı münasibət, yaxşı, yaxın əlaqə olmuşdur. Ona görə də, Şah İsmayıl Xətai Qacarlara yaşadıqları ərazidə sahiblik haqda rəsmi sənəd vermiş və malikanələrini sənədləşdirmişdir.

Qacarlar haqda söz düşdükdə, ilk növbədə yadımıza 1791-ci ildə özünü İranın Şahı elan edərək, Qacarlar Dövlətinin banisi olmuş, Azərbaycanda, o cümlədən Qarabağda baş verən bir çox tarixi hadisələrlə bağlı maraqlı və faciəli ömür yolu keçmiş, haqqında müxtəlif əks mövqeli fikirlər söylənilən Ağa Məhəmməd şah Qacar düşür.

Hörmətli oxucular, Ağa Məhəmməd Şahın adı gələndə isə mənim yadıma dahi şairimiz Səməd Vurğun, onun şah əsərlərindən biri Vaqif dramı, dramın əsas surətlərindən olan Qacar, Qarabağ xanı İbrahim Xəlil xan, onun vəziri, böyük Azərbaycan şairi Molla Pənah Vaqif düşür. Təsəvvürümdə sənətkarlıqlarına hörmət etdiyim dahi mərhum aktyorlar

Ələskər Ələkbərovun, Həsənağa Salayevin, Fatma Qədrinin, leyla Bədirbəylinin, Hökumə Qurbanovanın, Sidqi Ruhullanın böyük sənətkarlıqla yaratdıqları surətlər canlanır.

Bir çoxları kimi mən də cavan vaxtı Vaqif dramını demək olar ki, əzbər bilirdim və Akademik Dram Teatrın səhnəsində drama, bir qədər sonralar isə Opera və Balet Teatrının səhnəsində "Vaqif" operasına dəfələrlə baxmışdım.

Mənim nəzərimdə Vaqif, Qacar, İbrahim xan kimi tarixi şəxslər öz qiymətlərini tamaşadakı surətlərdən almışdılar.

İndi, uzun dövr keçdikdən sonra, tarixi həqiqətləri və bədii əsərdəki hadisələri müqaisə edib, düşüncəmin süzgəcindən keçirərək, öz məntiqi nəticəmi, öz fərdi münasibətimi formalaşdırıram.

Əsərdəki bəzi surətlərin gənclik illərində nəzərimdə formalaşmış yeri indi dəyişir, başqalaşır və bəzən də tamam əks mövqedə durur. Yəqin ki, bu da təbiidir, istəkli oxucular.

Çünki, zaman ən yaxşı loğmandır deyib atalar. Bunu nəzərə alaraq, Ağa Məhəmməd şah Qacar haqda bəzi tarixi hadisələri heç bir təhrifə yol vermədən, nəzərinizə çatdırmağın gərəkli olacağını düşünürəm, istəkli oxucular.

Qacarın atası və babası da tanınmış, nüfuzlu hakim şəxsiyyətlərdən olmuşlar.

Məsələn, Səfəvi hökmdarı II Şah Təhmasib dövründə Qacarın babası Fətəli Xan Astrabad hakimi olmuş, orduda baş komandan işləmiş və böyük nüfuz qazanmışdır. Bundan qısqanan təhmasib fitfaya uyaraq,1727-ci ildə onu qətlə yetirmişdir.

Bundan sonra Fətəli xanın oğlu və Qacarın atası olan Məhəmməd Həsən xan Astrabadda hakimiyyəti ələ almış, Avşar tayfasından olan İran şahı Nadir şah Avşarın nümayəndələrini ordan qovmuşdur. Bu Nadir şahın Astrabada hücum etməsinə səbəb olmuşdur. Məğlub olan Məhəmməd Həsən Xan türkmənlərin yanına qaçmış və bir müddət orada qalmağa məcbur olmuşdur. Ancaq, Nadir şah öləndən və yerinə Adil şah keçəndən sonra yenə də Astrabada qayıtmışdır. Adil şah ona Məşhəddə vəzifə vermişdir.Ancaq, müstəqilliyə öyrənmiş Məhəmməd Həsən xan Adil Şahla mübahisə etmiş,

bir daha türkmənlərin yanına qaçmışdır. Sonralar Nadir Şahın nəvəsi Şahrux Mirzə Məhəmməd Həsən xanı yenidən Astrabada hakim təyin etmişdir.

Bundan istifadə eləyən Məhəmməd Həsən xan bütün mərkəzi İranın və Azərbaycanın idarəçiliyini ələ keçirir və İranın demək olar ki, tacsız şahı sayılır. O zaman İranın şahı zənd tayfasından olan Kərim Xan Zənd idi.


Ağa Məhəmməd Şah Qacar

Məhəmməd Həsən xan zəndlərlə vuruşub, qalib gəlmək və İranın mütləq hakimi olmaq istəyirdi. Bu vuruşlarda onun arvadı Ceyran xanım və oğlu Ağa Məhəmməd də iştirak edirdi. Ancaq, növbəti vuruşlardan birində Məhəmməd Həsən xan məğlub olub, arvadı Ceyran xanım və oğlu Ağa Məhəmmədlə birlikdə əsir düşür. Atası və anası ilə birlikdə əsir düşən 20 yaşlı bu cavan oğlan gələcək İran şahı Ağa Məhəmməd şah Qacar idi.

Vaqif dramında belə bir səhnə vardır. Qacar Gürcü qızı Tamaranın həzin şərqisini eşidib, yuxudan oyanır. Qızın gözəlliyi onu məftun edir. Yaxınlaşıb, qızı bərk-bərk qucaqlayaraq, köksünə sıxır, elə həmin andaca:

Deyirlər şirindi busənin dadı,
O da kor bəxtimə qismət olmadı.

deyərək, sərt bir formada, gobud bir hərəkətlə özündən kənara itələyir. Bu qeyri-adi hərəkətdən sonra Qacar qəmli bir görkəm alıb, üzünü üfüqlərə tutaraq, qəlbindəkiləri belə biruzə verir:

Bizə həyat verən günəş də qandır,
Dünya qan üstündə bir xanimandır.

O zamanlar bu səhnəyə tamaşa edən tamaşaçılar İran ki-

mi böyük bir dövlətin başçısının öz həyatından belə narazı, busənin dadının isə ona yad olmasını təəccüblə qarşılayırdılar. Həmin anda bunun köklü səbəbini anlaya bilmirdilər Hamının gözü səhnəyə tikilirdi. Səhnə ilə zal sanki birləşir, bütövləşirdi. Hamının övqatı tarıma çəkilirdi. Belə bir vəziyyətdə vəzir səhnəyə daxil olurdu. Qacar öz şəxsi həyatı ilə bağlı düşündüklərini və dolmuş ürəyini belə boşaldırdi:

Tutaq ki, məşriqdən məğribə qədər,
Mənə xərac verdi bütün ölkələr,
Nə olsun? Bədbəxtəm, inan,
Tutaq ki, Yıldırım, Teymur, Çingiz xan
Hamısı mənəmmiş, nə olsun sonu ?
Duyuram dünyanın boş olduğunu.
Yoxdur vəliəhdim.Bir sonsuzam mən,
Nə qədər küskünəm kor taleimdən !

Qacarın bu monoloqu da tamaşaçılara böyük təsir göstərirdi. Burada tamaşaçılar bu zəhmli hökmdarın dünyada milyonlarla sonsuz insanlardan biri olduğunu güman edirdi. Bəziləri Qacarı bu acı teleinə acıyır, bir çoxları isə həddən artıq mənfi surət kimi verilmiş, ancaq və ancaq istilaçı, dağıdıcı ağına-bozuna baxmayaraq məhv edici bir hökmdar kimi təqdim edilmiş bu insanın taleyinin belə olmasına heyfsilənmir, bunu təbii qanunauyğunluq kimi qəbul edirdilər.

Tamaşa davam etdikcə bu acı taleyin səbəbi aydınlaşır və əsil mahiyyət üzə çıxırdı. Bunu də Qacar özü açıqlayırdı.

Məni uşaq ikən axtaladılar,
Üzüldüm dünyanın hər nemətindən,
Qisas almalıyam bu dunyadan mən!

Sonsuzluğun səbəbi tamaşaçıya aydın olsa da, bu bədbəxt və olduqca az təsadüf olunan hadisənin necə baş verməsi tamaşanın sonuna qədər qaranlıq qalırdı. Real həyatda bu hadisə belə baş vermişdir, istəkli oxucular.

Söylədiyimiz kimi, Qacar atası və anası ilə birlikdə zəndlərə əsir düşmüşdü.

Deyilənə görə Ağa Məhəmməd Zəki xan Zəndin qızına aşiq olur. Onların nişanlanması üçün razılıq verilir. Ancaq, Ağa Məhəmmədin etdiyi səhv ona baha başa gəlir və əbədi

bədbəxtlik gətirir. Ağa Məhəmməd aralarındakı nigah qanuniləşməmiş qızla görüşür. Bu, müsəlman aləmində böyük günah və qəbahət sayılır. Onların bu yersiz görüşündən xəbər tutan Zəki xan, Ceyran xanımın yalvarışlarına məhəl qoymayaraq, qəzəbini soyutmaq üçün, Ağa Məhəmmədi axtaladır və bundan sonra onu və anasını əsirlikdən azad eləyir.

Azad olunan Ağa Məhəmməd və anası yenə də türkmənlərin yanına qaçır. O, Zəndlərdən qisas almaq üçün qüvvə toplayıb, 1762-ci ildə bir daha zəndlərlə müharibə edir və yenə də məğlub olaraq bir daha əsir düşür. Onda Ağa Məhəmmədin 21 yaşı var idi. Adətən əsir düşənləri ya öldürürər, ya da kor, şikəst edərdilər. Qacarın atası Məhəmməd Həsən xanın da taleyinə belə bir yazı qismət olmuşdu. Şahruxun yerinə taxta çıxmış Süleyman şahın nəvəsi onun gözlərini çıxarıb, kor etmişdi. Kərim xan Zənd isə növbəti dəfə əsir düşən Ağa Məhəmmədi nə öldürür, nə də kor eləyir. Onun axtalandığını bilən Kərim xan, Ağa Məhəmmədə başqa cəza vermək istəmir, ancaq onu öz yanında girov saxlayır. Girovluq müddəti düz 16 il çəkir, istəkli, oxucular.

Kərim xan qacarlarla münasibəti yaxşılaşdırmaq istəyir, ona görə də onlarla qohumluq əlaqələri yaradır. O, Məhəmməd Həsən xanın bacısı ilə, yəni Qacarın bibisi ilə evlənir. Qacarın əmisi Hüseynqulu xanı isə Damğan əyalətinə hakim təyin eləyir.

O zaman Astrabad Kərim xanın tabeçiliyindən çıxmışdı. Kərim xan Hüseynqulu xana, yəni qaynına Astrabadın tabeçiliyini bərpa etmək tapşırığını verir. Hüseynqulu xan hücum edərək, Astrabadı tutur, amma Kərim xana xəyanət edərək, Astrabadı ona tabe etmək əvəzinə, özünü şah elan edir.

Əlbəttə, Kərim xan buna razı ola bilməzdi. O, müvafiq tədbirlər görərək, muzdlu qatillər vasitəsilə, 1755-ci ildə Hüseynqulu xanı öldütdürür. Həmin dövrdə, az bir zaman kəsiyində Ağa Məhəmmədin anası Ceyran xanım və kiçik qardaşı Abbasqulu xan da dünyasını dəyişir.

Bu hadisə baş verdiyi zaman Ağa Məhəmməd Tehranda Kərim xanın yanında girov idi, onun şəhəri tərk etməyə ixtiyarı yox idi.  Girov olmasına baxmayaraq, Kərim xanın tapşı-

rığı ilə Ağa Məhəmməd mədrəsəyə gedir, təhsilini artırmaqla və fiziki hazırlıqla məşğul olurdu, yaxınları və həmyerliləri ilə yazışırdı.

Elə həmin dövrdə Kərim xan Zənd paytaxtı Tehrandan Şiraza köçürür, Ağa Məhəmmədi də özü ilə aparır. O, burada təhsilini davam etdirir, ilahiyyatı. fəlsəfəni, riyaziyyatı, astronomiyanı, astroloqiyanı, poeziyanı öyrənərək, böyük uğurlar qazanır. Ağa Məhəmməd xan ehtiraslı ov azarkeşi idi. Şahin quşu ilə tülkü ovlamağı daha çox xoşlayırdı və tez-tez ova çıxırdı.

Gördüyünüz kimi, istəkli oxucular, Kərim xan yanında girov saxladığı Ağa Məhəmmədin elmləri mənimsəməsi və fiziki inkişafı üçün əlindən gələni etməyə çalışırdı.

Deyilənlərə görə Ağa Məhəmmədin fenomenal yaddaşı var imiş.

Bir gün Ağa Məhhəmmədə onun həyatına suiqəsd hazırlandığını xəbər verirlər. Bunun nə dərəcədə doğru olub-olmadığını dəqiqləşdirmək üçün vaxtı və imkanı olmayan və istər-istəməz ehtiyatı əldən vermək istəməyən Ağa Məhəmməd bir-neçə sadiq qulluqçuları və yaxınları ilə birlikdə ova çıxmaq adı altında Şirazdan Mazandarana qaçır.

Kərim xana böyük nifrəti olan Ağa Məhəmməd ona qarşı mübarizəyə başlayır və qardaşlarının yaxından köməkliyi ilə Mazandaranı və atasının dəfn olduğu Astrabadı özünə tabe edir.

Elə, bu vaxtlar Ağa Məhəmməd üçün münbit şərait yaranır. Kərim xan dünyasını dəyişir, ölkədə hakimiyyət uğrunda mübarizə, qarışıqlıq və hərc-mərclik hökm sürür. Bundan məharətlə dəyərlənən Ağa Məhəmməd 1785-ci ildə İsfahanı, daha sonralar isə demək olar ki. bütün mərkəzi İranı, 1790-cı ildə isə təxminən bütün İranı özünə tabe edir. Kiçik bir şəhər olan Tehranı özünə paytaxt elan edən Ağa Məhəmməd, 1791-ci ildə özünü İranın şahı elan edir.

Bunula da Qacar kimi yaxşı tanınan Ağa Məhəmməd banisi olduğu və uzun müddət qacarlar sülaləsinin hökmranlıq edəcəyi Qacarlar dövlətini yaradır və onu möhkəmləndirməyə başlayır. Bu sülalənin hökmranlığı Pəhləvilərin hakimiy-

yətə gəldiyi 1925-ci ilə qədər davam edir, istəkli oxucular.

Qacar qonşu dövlətlərlə, xanlıqlar və əyalətlərlə əlaqə saxlamaq və yaranmış əlaqəni inkişaf etdirmək və möhkəmlətmək istəyirdi. Ancaq, yaxın qonşuları olan gürcü çarı II İraklı ilə Qarabağ xanı İbrahim Xəlil xan arasındakı sövdələşmə Qacarın xoşuna gəlmədi. Çünki, II İraklı və İbrahim Xəlil xan öz aralarında gizli danışıq apararaq, Gürcüstanı və Qarabağı Rusiyanın himayəsinə vermək istəyirdilər və bunun üçün diplomatik yolla əllərindən gələni etməyə çalışırdılar. Onlar İrəvan xanlığını da öz tərəfləinə çəkərək, Rusiyanın tabeliyinə keçməyə razı salmağa çalışırdılar.

Onların bu niyyətini Qacar eşidir. O zamanlar gürcü çarı İran şahından asılı vəziyyətdə idi. Bunu nəzərə alan Qacar Gürcü çarının bu hərəkətini, onun tərəfindən İrana və Azərbaycana xəyanət və eyni zamanda Azərbaycan xanlıqlarının daxili işlərinə qarışmaq kimi qiymətləndirir. Qacar II İraklı ilə dilbir olan İbrahim Xəlil xanın satqınlığını görür, onun öz xalqına qarşı xəyanət yolu tutduğunu yaxşı başa düşür, öz doğma xalqını dini dinindən, dili dilində, məzhəbi məzhəbindən, inancı inancından, əqidəsi əqidəsindən olmayan yad, yabançı bir xalqa tabe istəyinə dözə bilmir. O zaman xanın vəziri hamımızın böyük şair kimi tanıdığımız, adına və şairliyinə hörmət etdiyimiz Molla Pənah Vaqif idi. Bəri başdan oxucuların nəzərinə çatdırıram ki, Qarabağın Rusiya tabesinə verilməsini Vaqif də istəyirdi və bu yolda çalışır, əlindən gələni əsirgəmirdi.

Qazaxda dünyaya göz açmış Vaqif necə və hansı yolla Qara-bağa gəlmiş və İbrahim Xəlil xanın vəziri olmuşdur?

Bu barədə məlum olan tarixi həqiqətləri istəkli oxucuların nəzərinə çatdırmağı özümə borc bilirəm.

Qazağın Gürcüstanla sərhəddində qarışıqlıq yaranır. Vaqifin bu narahatçılığa dözə bilməyən ailəsi Qarabağın Cavanşir Uyezdinin Tərtərbasar kəndinə, bir qədər sonra isə Şuşaya köçür. Vaqif Şuşada məktəb açır, müəllimlik edir, Müəllim və şair kimi el arasında hörmət qazanır. Bir qədər keçdikdən sonra onun müəllimliyi və şairliyi haqda deyilən xoş söhbətlər, ürək açan xəbərlər Qarabağ xanı İbrahim Xəlilə çatır.

O, Vaqifi saraya dəvət edir. Onlar tanış olurlar. Söhbət əsnasında aydın olur ki, İbrahim Xəlil xan şiyə, Vaqif isə sünnü təriqətinə inanır. Onların şərtləşməsinə uyğun olaraq, Vaqif şiyəliyi qəbul edir və xanın vəziri kimi fəaliyyətə başlayır.

1726-cı ildə anadan olub, 1760-cı ildən ömrünün axırına, yəni 1806-cı ilədək, 46 il Qarabağ xanı olan İbrahim Xəlil xan 80 illik uzun bir ömür yolu keçmişdir. İbrahim Xəlil xanın rəsmi on altı arvadı olub. Bunlardan üçü erməni, ikisi gürcü, biri avardı. Tam dəqiq olmayan məlumata görə İbrahim Xəlil xanın 24 oğlu,35 qızı olub.



**Molla Rənah Vaqif**

Cavanşir Qaradağlının yazdığına görə İbrahim Xəlil xan çox əliaçıq insan olmaqla bərabər, gözəl qadınların iştirak etdiyi məclislərdə olmağı çox sevirmiş. Bir sözlə, indiki bir qədər gobud terminlə desək, rəhmətlik həddindən artıq, ifrat dərəcədə arvadbaz imiş.

İbrahim Xəlil xan və Mola Pənah Vaqifi müqaisə edərək belə bir nəticəyə gəlmək olar ki, onlar eyni əqidəyə, eyni xassəyə malik insanlar olublar. Dediyim kimi Qacar, Vaqif və İbrahim xan haqda ilk təəssüratım “Vaqif” tamaşasına baxandan sonra yaranmışdı.

“Vaqif” daramının ilk pərdəsində Vaqif Vidadinin evinə gəlir. Hərəsinin qabağına bir stəkan çay qoyulur. Onlar şirin-şirin söhbət eləyirlər. Kənddə yaşayan və kəndli həyatı keçirən Vidadi tezcə, tələm-tələsik çayı içib qurtarır, kübar bir mühitdə yaşayan Vaqif isə axıradək stəkana əl vurmur. Bu Ələskər Ələkbərovun ifasında belə idi Onların söhbətindən bir parçanı nəzərinzə çatdırıram, əziz oxucular.

Vidadi

Yaxşı nə tapmısan o saraylardan?
Sən ki, zövq alırsan gözəldən, yardan!

Vaqif

Çoxdu Qarabğda gözəl sənəmlər,
Baxdıqca kül olur dərdlər, ələmlər,
Məndən çox uzaqdır hər bəla, hər qəm,
Yalnız gözəllərdir, Məkkəm, Mədinəm.

Vidadi

Demək gözəllərçin unutdun bizi,
Unutdun öz ana beşimiyizi?

Vaqif

Mən orda olmasam, qan çıxar dizə,
Quşlar da ağlayar ellərimizə.
Xan məndən utanır, çəkinir bir az,
Mən getsəm, qırğının hesabı olmaz.
O, bəzən hirslənib quduran zaman,
Mənəm zəncirini dartıb saxlayan.

Xahiş eləyirəm məni qınamayın əziz oxucular. Sizi bilmirəm, Vaqifin bu dediklərinə mən inanmıram, vallah. Çünki, real həyatda, xalqla, millətlə bağlı bir çox taleyüklü məsələlərə münasibətdə İbrahim xanla Vaqif arasında heç bir fikir ayrılığı olmamışdır.

Məsələn, 1783-cü ildə Gürcü çarı II İraklı Rusiya təbəəliyini qəbul eləyir. Elə həmin il İbrahim Xəlil xan da Rus çarı II Yekaterinaya məktub yazaraq, Qarabağı təbəəliyə qəbul etməsini xahiş edir. Qarabağdan çara yazılan məktubları Vaqif yazırdı . Deyilənə görə şairanə, məzmunlu və savadlı yazılmış bu məktublar II Yekaterinanın xoşuna gəlmiş və bir neçə dəfə öz çıxışlarında bunu qeyd etmişdir.

Vaqif İbrahim Xəlil xanın Rusiyanın təbəəçiliyinə keçmək istəyi ilə tam həmfikir olmuş və buna etiraz etməmişdir.

Gürcüstanın Rusiyanın təbəəçiliyini qəbul etməsindən bir il sonra Tiflisdə Gürcüstanla Rusiya arasında müqavilə imzalanması mərasimi keçirilir. Bu mərasimdə Vaqif də iştirak edir və Tiflisi, Gürcü gözəllərini, xüsusən də II İraklının oğlunu şeir dili ilə tərif yağışına qərq eləyir.

Gürcü çarı ilə Qarabağ xanı arasındakı bu sövdadan haqlı olaraq narazı qalan Qacar, 1795-ci ildə 60 minlik ordu ilə Qafqaza doğru hərəkətə keçir. Qacar İbrahim Xəlil xandan

tabe olmağı tələb edərək, Şuşanı mühasirəyə alır. Ancaq, 33 gündən sonra mühasirəni boşaldaraq, əsas qüvvəni Gürcüstan tərəfə yönəldir. Ulu Borçalı, doğma Qaraqoyunlu siz də bu tarixi hadisələrin bilavasitə iştirakçısı olmusunuz və bunlar yaxşı yadınızdadır.

Qacarın Gürcüstan üzərinə hərəkətində Gəncə xanı Cavad xan da iştirak edir və Qacara öz köməkliyini əsirgəmir. II İraklı qaçıb dağlara çəkilir. Tiflis zəbt olunaraq, darmada-ğın edilir.

Fikir verin istəkli oxucular, Qarabağ xanı II İraklının tərəfindədir, Rusiyanı özünə arxa hesab edir, Gəncə xanı isə öz millətindən, öz dinindən olan Qacarın yanındadır.

Bundan sonra bir çox Azərbaycan xanlıqları Qacara tabe olduqlarını bildirirlər. Muğanda təntənəli tac qoyma mərasimi keçirilir. Tac qoyma mərasimindən sonra az bir müddət içərisində Qacar tabeçilikdən çıxan digər vilayətləri də özünə tabe edib, ölkənin birliyini bərpa edir və gücünü artırır.

1796-cı ildə qraf. V.Zubovun başçılığı ilə Gürcüstana hücuma keçən rus qoşunları Şamaxıdan keçərək, Qarabağ sərhəddinə gəlir.

Bu dəfə də İbrahim Xəlil xanla Vaqif fürsəti əldən vermirlər. Xanın oğlunun başçılığı və Vaqifin iştirakı ilə Zubovun yanına elçi göndərilir. Həmin görüşdə II Yekaterinanın adından İbrahim Xəlil xana qiymətli hədiyyələr, Molla Pənah Vaqifə isə bahalı daş-qaşlarla bəzədilmiş əsa bağışlanır.

Bu tarixi həqiqəti böyük Səməd Vurğun belə təsvir eləyir:

İbarahim xanla Vaqif söhbət eləyirlər. İbrahim xanın gözü Vaqifin əlindəki əsaya sataşır.

İbrahim xan

Vəzir, əlindəki o əsa nədir?

Vaqif

Rusiya padşahı o zülmkardan
Yekaterinadan bir hədiyyədir.

İbrahim xan

Aha ...
De, sən hara? Rusiya hara?
Yoxsa satılmısan o kafirlara?

Vaqif

(Əsanı göstərərək)
Buna şəkil verən bir sənətkardır,
Mənim sənətkara hörmətim vardır.

İbrahim xan

Bəs onu göndərən Yekaterina?

Vaqif

Yalnız nifrətim var, inanın ona.

Bəli, istəkli oxucular, bu dahi şairimiz Səməd Vurğunun Vaqifdə görmək istədiyi təxayüldür, o Vaqifi belə görmək istərdi. Amma, belə idimi. Siz bunu tarixin real həqiqətləri ilə tutuşdurun və özünüz öz məntiqinizə söykənərək, müvafiq nəticə çıxarın.

Bu dünyanın işindən baş açmaq çətindi ulu Göyçə, doğma Qaraqoyunlu, istəkli Borçalı. Bir yandan bağlayır, bir yandan açır. Vaqifin Rus ordusunun başçısı Zubovla görüşüb hədiyyə aldığı həmin 1796-cı ildə Rus Çarı Yekaterina ölür. Yeni imperator II Pavel Qafqazdakı rus ordusunu geri çağırır.

Bundan istifadə edən Qacar Qarabağa bir daha hücum edir. İbrahim xan Azərbaycanın quzeyinə, Balakənə qaçır, Şuşa qalası doyüşsüz Qacar ordusuna təslim olur.

İbrahim xan qaçarkən Vaqifi özü ilə aparmayıb. Axı onlar bir yerdə olmalı idilər. Bunun səbəbi nədir? Bu haqda bir neçə ehtimal mövcuddur.

Birinci ehtimala görə Vaqif Tiflisə gedibmiş, geri qayıdanda şahın adamları tərəfindən tutulur. Digər ehtimala görə Vaqif şahdan qaçıb, canını qurtarmaq istəyir, ancaq Cavad Xan tərəfindən tutularaq, Qacara təhvil verilir.

Başqa bir ehtimala görə Qacarın Şuşaya hücumundan əvvəl Şuşa İbrahim Xanın düşmənləri tərəfindən tutulur, İbrahim xan qaçır, Vaqif isə həbs edilir. Buna görə də qala döyüşsüz təslim edilir, Vaqif isə şahın sərəncamına gətirilir.

Vaqifin İbrahim xanla birlikdə olmamasının dördüncü ehtimalı da mövcuddur. O ehtimala görə Vaqif qalada qalıb, Qacara hazırlanan sui-qəsdi təşkil etmiş və həyata keçməsində iştirak etmişdir. Deyilənə görə, Qacar öldürulduyü gecə Vaqif bir-neçə dəfə həbsxana rəisini yanına çağıraraq, şəhər-

də qeyri-adi hadisənin baş verib-verməməsi barədə soruşub.

Bu ehtimalların hansının doğru olub-olmamasından asılı olmayaraq, Vaqif xanla bir yerdə olmayıb, onunla birlikdə qaçmayıb. Şuşa qalası alındıqdan bir-neçə gün sonra Vaqif Qacara təhvil edilib.

Vaqif tamaşasındakı Vaqiflə Qacarın dillər əzbəri olan görüş səhnəsindən bir parçanı nəzərinizə çatdıraraq, yaddaşınızı təzələməyi zəruri hesab edirəm, istəkli oxucular.

Şuşa qalasında, Xan sarayında Qacarın kef məclisi təşkil olunur. Məclisdə əyanlar, bəylər və şahın yaxın adamları iştirak edirlər. Xanəndə Vaqifin

Gözüm yollarda qalmışdı, xəbər yox Kür qırağından.
Usanmaq bilməyir könlüm yaşılbaşlar sorağından,

misraları ilə başlanan şerini oxuyur.

Qəzəlin Vaqifin olduğunu öyrənən Qacar onu hüzuruna gətirməyi əmr edir. Vaqifi gətirirlər. Özünü məğrur və əyilməz göstərməyə çalışan şair Qacara baş əymir.

Qacar:

(Heyrətlə)
Aha... baş əyməyir hüzurumda bu!

Şeyx

Yoxdu vicdanında qanunun qorxusu.

Qacar

(Vaqifə)
Şair hökmdarın hüzurundasan!

Vaqif

Bunu sizsiz belə düşünürəm mən

Qacar

Bəs baş əymədiniz

Vaqif

Əymədim, bəli!
Əyilməz vicdanın böyük heykəli.

Qacarla vaqif arasındakı söhbət gərgin bir sonluqla qurtarır və Vaqif zindana salınır. Bu hadisələrin teatr variantıdır, istəkli oxucular.

Əslində isə Şuşanı zəbt etmiş Qacar hakimiyyət və saray məsələləri ilə məşğul idi. Görulmüş və görüləcək işləri

götür-qoy edirdi. Qacar günah işlətmiş üç nəfərin və Vaqifin səhər öldürülməsi üçün fərman vermişdi. Ancaq allahın işini bilmək olmaz. O, nağıllarımızda deyildiyi kimi mıxı-mismara döndərən allahdır. Gecə yatdığı zaman Qacar səhər öldürmək istədiyi adamlar rəfindən öldürülür və külli miqdar zinət şeyləri oğurlanır.

Deyilənə görə bu qətl hadisəsini Qacarın bacarıqlı sərkərdələrindən biri olan Sadiq xan Şəqqaqi İranda yaşayan gürcülərlə əlbir olaraq, hazırlamışdır.

Qətldə iştirak eləyən üç nəfərdən biri gürcü Mixetli Andrey (Sadiq Qorçi), digəri İsfahanlı Xodadad, üçüncüsü isə Mazandaranlı Abbas olmuşdur. Deyilənə görə oğurlanan zinət şeylərindən böyük əksəriyyəti Sadiq xan Şəqqaqiyə verilmişdir.

Səhərisi gün qatillər çarmıxa çəkilir. Şahın qoşunları İrana qayıdır. Qacar Məşhəddə dəfn olunur.

Şahın ordusu geri qayıtdıqdan sonra İbrahim Xəlil xanın yerinə qohumu Məhəmməd bəy Cavanşir keçir və heç kimin gözləmədiyi bir tərzdə Vaqifi və oğlu Əli bəyi edam etdirir.

Mənə elə gəlir ki, Qacarın qətlində Vaqifin əli olsaydı və yaxud onun ciddi bir günahı olmasaydı Məhəmməd bəy Cavanşir onu, hələ üstəlik oğlü Əli bəyi də heç bir tərəddüd etmədən edam etdirməzdi. Bu zaman, yəni 1797-ci ildə Molla Pənah Vaqif çox qocalmışdı, onun 80 yaşı var idi.

Mənbələrin yazdığına görə Vaqifi və oğlunu edama aparanlar onları aldadaraq, xanın yanına apardıqlarını söyləyirlər. Ancaq, onları yuxarı mərtəbəyə xanın olduğu yerə aparmaq əvəzinə, aşağı apardıqda oğlu Əli bəy şübhələnir və atasından soruşur:

- Xan yuxarıda oturduğu halda bizi niyə aşağıya aparırlar?

- Bizi çoxlarını göndərdiyimiz yerə aparırlar deyə cavab verir 80 yaşlı Molla Pənah Vaqif. Çox məntiqli cavabdır, əziz oxucalar. Atalar demiş nə əkərsən, onu da biçərsən. Vaqif də əkdiyini biçirdi. Vaqifi Şuşada, Cıdır düzündə dəfn eləyirlər.

Vaqifin edam edilməsi onun Qacarın sui-qəsdində iştirak etməsi ehtimalını sıfıra endirir, istəkli oxucular.

Beləliklə Qacarlar sülaləsinin ən böyük və məşhur nümayəndəsi Ağa Məhəmməd şah Qacar, Qarabağ xanı İbrahim Xəlil xan və Molla Pənah Vaqif bax beləcə dünyaya göz açıb, keşməkeşli ömür yolu keçərək, belə bir sonluqla bu etibarsız dünya ilə vidalaşır.

Qacar istilaçı idimi, Qarabağı talamağa, məhv etməyə, yoxsa azad etməyə gəlmişdi? Nə məqsədlə və kimə görə Gürcüstana hücum edərək, Tiflisi darmadağın etmişdi Qacar? Qacar haqlı idi, ya yox?

Bütün bu sualların cavabını sizin öz öhtənizə buraxıram, özünüz nəticə çıxardın, əzizlərim. Vaqif öz xalqına kömək etmək, yeri gələndə onu cəzalardan qurtarmaq üçünmü Vəzir işləyirdi? Vaqif II İraklı ilə həmfikir olmaqda doğru yolmu seçmişdi? Vaqifin Rusiya təbəəçiliyinə keçmək istəyi doğru yol idimi? Bu sualların elə ilk andan çox aydın olan cavablarını özünüz tapın və müvafiq nəticə çıxarın, əziz oxucalar.

Bu suallara cavablar İbrahim Xəlil xanın da kim olduğunu ğüzğü kimi göstərəcəkdir. Buna əmin ola bilərsiniz.

Ağa Məhəmməd şah Qacar tərəfindən yaradılan Qacarlar dövləti 1925-ci ilə qədər davam etdi və öz yerini pəhləvilər sülaləsinə verməyə məcbur oldu. Bütün bu çoxşaxəli hadisələr sizə öz təsirini göstərməyə bilməzdi, doğma Qaraqoyunlu, əziz Göyçə, istəkli Borçalı.

## 7. Pyotrun vəsiyyətləri. Gülüstan və Türkmənçay müqavilələri.

Doğma Qaraqoyunlu, Göyçə və Borçalı, indiyədək yada salıb, qəlbən sevdiklərimizlə yanaşı, ürək ağrısı ilə söz açdığımız hadisələrdən daha dəhşətlilərinə və sağalma ehtimalı müşkül olan, ürəklərə dağ çəkən, zaman-zaman özünü daha qabarıq göstərən dərdlərə son iki əsrdə daha dərindən düçar oldunuz.

Daha qədim dövrlərdə baş verən hadisələr həm türk dünyası daxilində, həm də onun hüdudlarından kənarda müxtəlif bölgələrdə baş verməsinə baxmayaraq, ümmən Türk dünyasının bütövlüyü saxlanılır, əksər hallarda isə, əksinə, ərazisi daha da genişlənir, təsir dairəsi böyüyür, ayrı-ayrı türk

dövlətləri daha sürətlə inkişaf edərək, daha da qüdrətlənir, qüvvətlənirdi.

Bütün bu deyilənlərdən fərqli olaraq XIX və XX əsrlərdəki hadisələr sizin ziyanınıza, istək və arzularınızın əksinə, mövqelərinizin zəifləməsi istiqamətinə yönəldi, əziz qərbi Azərbaycan türkləri. Nəticədə əraziləriniz daraldı, parçalandınız, zəiflədiniz, bütün Türk dünyasının tərkib hissəsi kimi, millət, xalq olaraq, hakim mövqeyinizi tədricən itirdiniz.

Bütün bu çoxsaylı bəlaların baiskarı əksər hallarda sizlərə sox yaxın qonşu olan Rusiya oldu. Ərazisinin kifayət qədər geniş olmasına baxmayaraq, qarnı və gözü doymayan bu ölkənin və bu xalqın başçıları öz yaxın qonşuları hesabına daha çox ərazi və var-dövlət əldə etməyə çalışırdılar. Əsas hədəfləri isə Azərbaycan, Türkiyə və İran idi.

Bu məkrli və qudurğan planın əsas yaradıcısı I Pyotr idi. Onun iştahı daha böyük, yırtıcı xisləti daha geniş idi. Öz məkrli planlarının gələcəkdə yerinə yetməsi üçün bu ziyankar rus çarı öz sələflərinə tarixi bir vəsiyyət etmişdir. Vəsiyyətə, onun gələcək arzularına, istəklərinə fikir verin və müəyyən nəticə çıxarın, istəkli oxucular.

Nələri vəsiyyət etmişdir, uzun müddət məddah başbilənlə-rimizin böyük qardaş kimi qəbul edib və qəbul etdirdiyi rus xalqının bu hökmdarı ?

1725-ci ildə yazılan bu bədnam vəsiyyətdə deyilir:

Rusiya o zaman güclü ola bilər ki, onun paytaxtı Avropa və Asiya ölkələri xəzinələrinin açarı rolunu oynayan İstanbul olsun.

İştahın böyüklüyünə baxın. Bu vəsiyyətin yerinə yetirilməsi üçün, bu bədnam arzunun çin olması məqsədilə görün I Pyotr hansı yola,hansıı əməllərə, hansı hiylələrə əl atmağı və nələri etməyi məsləhət görür? Diqqətlə fikir verin.

O vəsiyyət edir ki, bu planın həyata keçməsi üçün Türkiyə ilə İran arasında fitnə-fəsad törətmək, bu iki qonşu və böyük müsəlman ölkələrini bir-birinə düşmən olmaq halına gətirmək lazımdır.

Bunu həyata keçirmək və istəyə nail olmaq məqsədilə I Pyotr məsləhət görür ki, sünnü və şiyə məzhəbləri arasında

ixtilaflar yaratmaq və bundan məhvedici silah kimi istifadə etmək lazımdır. Elə etmək lazımdır ki, Türkiyə ilə İran bir-birilə dil tapa bilməsin.

Daha sonra Çar vəsiyyətinə davam edərək göstərir ki, elə etmək lazımdır ki, onlar Avropa xalqları ilə təmasda ola bilməsinlər. Bu ölkələrin müsəlmanları hüqüqlarını anlasalar Rusiyaya böyük zərbə dəyər. Fikir verin istəkli oxucular, xalq hüqüqlarını anlayarsa, rus xalqı ziyana düşər.

Bu məqsədləri yerinə yetirmək, şiyə-sünnü məsələsini qabartmaq, düşmənçilik toxumunu müvəffəqiyyətlə cücərtmək və yetişdirmək üçün bəs hansı yola əl atmağı məsləhət görür bu bədnam Çar?

O məsləhət görür ki, bu məqsədlə din xadimlərini ələ almaq , onların vasitəsilə şiyə-sünnü ixtilafını qızışdırmaq lazımdır. Başqa yolla bunu yerinə yetirmək təsirli ola bilməz, faydasız olar.

Daha sonra vəsiyyət edilir ki, həmin ölkələrdə xristian dinini, xristian mədəniyyətini təbliğ etmək,yaymaq, xalqı islam əqidəsindən mümkün qədər uzaqlaşdırmaq lazımdır.

Bəli, istəkli oxucular, I Pyotr bunları vəsiyyət edirdi. Həmin vəsiyyətin yerinə yetməsi üçün Rusiya bu gün də əlindən gələni etməkdədir.

Pyotr özü də öz dövründə istəyinə nail olmaq üçün əlindən gələni etdi.

Bütün Qafqazda hökmranlıq iddiasında olan, yatanda da bunu yuxusunda görən I Pyotr 1722-1723-cü illərdə Dağıstanı və Azərbaycanın bir hissəsini Rusiyaya birləşdirdi. Lakin, Rusiya ilə Türkiyə arasında münasibət gərginləşərək, müharibə vəziyyəti yarandığına görə, bir qədər sonra, 1732-1735-ci illərdə Rusiya bu ərazilərdən imtina etməyə məcbur oldu.

Bildiyiniz kimi 1730-cu ilə qədər Qara dəniz tamamilə Türk dənizi idi və Türkiyə dövlətinin sərhədləri daxilində dalğalanırdı. Bunu Rusiyanın gözü götürmürdü və o Qara dənizə ortaq olmağa, ora birbaşa yol açmağa çalışırdı.

Bu məqsədlə Rusiya Qara dəniz ətrafındakı Türk torpaqlarını ələ keçirməyə çalışır, müvafiq məqam axtarırdı.

Bu məqsədlə Rusiya Türkiyə ilə onsəkkizinci əsrdə üç

dəfə, ondoqquzuncu əsrdə isə dörd dəfə müharibə aparmışdı.

Nəzərinizə çatdırım ki, Türkiyənin Rusiya ilə apardığı 1735-1739-cu illər müharibəsində Azov, 1768-1774-cü illər müharibəsində Krım, 1787-1774-cü illərdəki müharibədə isə Anapa Rusların əlinə keçdi və Rusiya Qara dənizə çıxış imkanı qazandı. Rusiyanın Türkiyəyə qarşı istilaçılıq planları sonralar da davam etdi.

Bu iki ölkə arasındakı 1828 -1829-cu il müharibəsi nəticəsində Qarş, Ərdəhan, Axaltsixi, Ədirnə ruslar tərəfindən zəbt edildi. Rusların əsas məqsədi isə Krımı ələ keçirmək idi.

Rusiyaya baxaraq Avropanın da ağzı sulanmağa, iştahı artmağa başlamışdı. Avropa dövlətləri də Osmanlı dövlətini bölüşdürmək fikrinə düşmüşdülər.

Bu çirkin məqsədə nail olmaq üçün Rusiya 1878-1879-cu ildə Rumıniya, Serbiya və Çernoqoriya ilə birlikdə Türkiyə əleyhinə müharibə apardı.

Bu müharibə nəticəsində ruslar Qarşı ələ keçirdi, Balkanlar türklərin təsir dairəsindən çıxdı, Ukraynanın batısı, Bessarabiya, Krım, Qafqazın quzey-batısı, Qara dəniz sahilləri və Gürcüstanın güney-batısı, deməli çox böyük bir ərazi Rusiyaya birləşdirildi.

Buna bənzər hadisələr Qafqazın siz yerləşən bölgəsində də baş verdi, doğma Qaraqoyunlu. Məsələn, bu hadisələrdən biri barəsində, 1796-cı ildə B.A.Zubovun Komandanlığı altında rusların Qafqaza qoşun göndərməsi, bu hadisələrdə Qarabağ xanı İbrahim Xəlil xanın və onun vəziri Molla Pənah Vaqifin tutduqları mövqeləri və Qacarın onlara münasibəti haqda sizə əvvəlki söhbətlərimizdə geniş və hərtərəfli məlumatlar verilmişdir, əziz oxucular.

Rusiyanın İranla apardığı ən böyük və bizim üçün dəhşətli nəticələr verən müharibə 1804-1813-cü illərdə olmuşdur. Ruslar 1803-cü ildə Balakəni, 1804-cü ildə isə Gəncəni tuturlar. Bu müdaxiləyə İran, Türkiyə, İngiltərə, Fransa etiraz edir və müqavimət göstərir. İran Rus qoşunlarının Zaqafqaziyadan çıxmasını tələb edir. Rusiya rədd cavabı verdiyinə görə, 1804-cü ilin iyununda İrəvan yaxınlığında Abbas Mirzənin və Sisianovun orduları döyüşə başlayır. Bu döyüşdə tə-

əssüflər olsun ki, Abbas Mirzə məğlub olur. Bu rusların əl qolunu daha da açır və daha çox şirnikləşən Rusiya 1805-ci ildə Qarabağ, Şəki və Şirvan xanlıqlarını da özünə birləşdirir. 1806-cı ilin yanvarında Bakıya hücum eləyən Sisianov Bakı xanı Hüseynqulu xandan şəhəri təslim etməyi tələb edir.Onlar öz aralarında razılaşaraq , fevralın 8-də danışığa başlamaq qərarına gəlirlər. Lakin, bu danışıq baş tutmur. Çünki, İran şahının agentləri ilə sıx əlaqədə olan İbrahim bəy qardaşı Hüseynqulu xanın Sisianovla görüşməsinə mane olur. O, Sisianovu öldürür. Buna görə də rus qoşunları geri çəkilir, ancaq səkkiz aydan sonra Bakı zəbt edilir.

Rusiyanın tutduğu əraziləri İranın geri qaytarmaq cəhdləri fayda vermir və 1813-cü ilin yanvarında ruslar Lənkəranı da ələ keçirirlər. Nəticədə İran bu güclü və mənfur düşmənlə sülh müqaviləsi bağlamağa məcbur oldu.1813-cü ildə Goranboy rayonunun Gülüstan kəndində imzalanan bu müqavilə "Gülüstan müqaviləsi" adı ilə tarixə düşdü.

Bu bədnam müqavilə ananı baladan, oğulu atadan, qardaşı qardaşdan ayrı saldı, xalqı parçalayıb, iki hissəyə ayırdı və arasından əl çatmaz, ün yetməz bir sədd çəkdi.

Bu müqavilə nəticəsində doğu Gürcüstan, o cümlədən Borçalı , Dağıstan və quzey Azərbaycanın hamısı, o cümlədən doğma Qaraqoyunlu və əziz Göyçə də zorla Rusiyaya birləşdirildi.

Rusiya bununla da kifayətlənmədi . 1826-1828-ci illərdə əlavə olaraq Naxçıvanı, İrəvanı, Xoyu, Mərəndi, Urmiyanı, Ərdəbili və Təbrizi də tutdu.

Tariximizə ikinci mənfur müqavilə kimi daxil olan və Təbriz yaxınlığında imzalanan "Türkmənçay müqaviləsi" imzalandı. Bu müqavilə nəticəsində Naxçıvan və İrəvan xanlıqları da Rusiyaya birləşdirildi.

**8. Borçalı haqda bir neçə söz.**

Əziz Qaraqoyunlu və Göyçə, sizin ellərdə olduğu kimi, Bor-çalıda da Oğuz və Qıpçaq türkləri miladdan çox əvvəllər məskunlaşmışlar. Bu haqda çoxsaylı tarixi qaynaqlar mövcuddur. Bunları sadalamaqla sizi və oxucuları yormamaq

məqsədilə söhbətimizi XVII-XX-ci əsrlərdə Borçalıda baş vermiş bəzi hadisələri yada salmaqla davam etdirəcəyik.

Sizin də bildiyiniz kimi, 1604-cü ildə Şah Abbas Gürcüstanı zəbt etmişdi. O dövrlərdə Borçalı heç kimə tabe olmayan, sərbəst xanlıq idi. Bir qədər sonra, XVIII əsrin əvvəllərində isə Borçalı Gəncə xanlığı ilə birləşmişdi. Ancaq, təəssüflər olsun ki, bu birlik uzun sürmədi. 1736-cı ildə Borçalını zorla Gəncə qəzasından ayırdılar.

Əziz Qaraqoyunlu, əziz Göyçə yuxarıda deyilənlərdən fərqli olaraq 1736-cı ildə Borçalını öz ana yurdundan, doğma millətindən ayırıb yada təhvil verən nə erməni, nə rus, nə də digər yad bir millətin oğlu idi. Özünü düşmən kimi aparan bu söz və güc sahibi kim idi ?

- İran dövlətinin şahı, Nadir şah. O Nadir şah ki, bütün Gürcüstanı zəbt etmişdi. Bir hökmdar kimi təkzibolunmaz qüvvəsi və böyük imkanı olduğuna görə xalqına faydalı iş görmək imkanları çox idi. O bunu etdimi ? Yox, etmədi. Onu Muğanda da şah elan etmişdilər. Ancaq, Gəncə xanı Ziyad xan oğlu müəyyən səbəbləri əsas götürərək, etirazını bildirmişdi. Buna və digər əsassız səbəblərə görə, Nadir şah Borçalını Gəncə xanlığından ayıraraq, Gürcüstana, Kartlı-Kaxeti çarlığının tabeliyinə verdi, yəni mənsub olduğu xalqı və torpağı parçaladı, böldü.

O da sənin kimi islam dininə itaət edirdi, müsəlman idi, müqəddəs kitabı Qurani-Kərim idi. O da sənin kimi türk oğlu idi. O, Azərbaycanın bir, sən isə digər bölgəsindən idin. Milli mənsubiyyətinə əsasən ana dili türk dili olmalıydı, beşiyinin başında layla türkcə çalınmalıydı. Buna böyük şübhəm var ulu Borçalı. Əminəm ki, o layla türkcə səslənsəydi, Nadir şah öz xalqına qarşı belə yol seçə bilməzdi.

Bütün bunlardan sonra iki oğlunu, yəni, qul oğlun Şəmsəddin Eldəgəzi və şah oğlunu müqayisə elə və bu müvafiq nəticə çıxart, doğma xalqım.

Doğrudur, sonralar Gəncə xanı Cavad xan böyük zəhmət və qüvvə sərf edərək, Borçalını yenidən Gəncə xanlığına birləşdirdi. Lakin, bundan sonra da zamanın çarxı onun istəyinin əksinə fırlandı, bəxt üzünə gülmədi 1804-cü ildə ruslar tərə-

findən Gəncə işğal olunduqdan sonra nəinki Borçalı, onunla birlikdə Qazağın Qarayazı nahiyəsi də Gəncə xanlığından qopardılaraq, Tiflis qəzasının tərkibinə daxil edildi. Bir qədər keçdikdən sonra isə Borçalını Tiflis qəzasından ayırmaqla distansiya yaradıldı. XIX əsrin ortalarında bu distansiya geniş əraziyə malik olub, Tiflis, Qori qəzaları, Qazax distansiyası, Türkiyənin Qarş və Axalsıx paşalıqları ilə həmsərhəd idi. Əhalisinin böyük əksəriyyəti öz millətimizdən ibarət olan o zamankı Borçalının ərazisi indiki Dağlıq Qarabağın ərazisindən təxminən iki dəfə böyük olub, 8 min kvadrat kilometrə bərabər idi.

Bu tarixi həqiqəti məşhur gürcü yazıçısı və ictimai xadimi İ. Çavçavadze də təsdiqləyərək yazmışdır :

Borçalı əhalisinin üçdə ikii hissəsindən soxu türklərdən ibarətdir və ən çox işlənən dil tatar dilidir.

Əhalisinin sayına və ərazisinin böyüklüyünə görə Tiflis qəzaları arasında ikinci yeri tutan Borçalı mahalı 1880-cı ildə Borçalı qəzasına çevrild: Qəza dörd nahiyyədən (Loru, Trialet,Borçalı, Yekaterinenfeld), hər nahiyə isə öz növbəsində müxtəlif sayda rayonlardan ibarət idi. Məsələn, sonralar ermənilər tərəfindən işğal edilmiş, indi də Ermənistana daxil olan ən böyük nahiyə -Loru nahiyəsi dörd rayondan ibarət idi. Bu rayonlar Sənain, Şinix, Calaloğlu və Taşir adlanırdı.

Trialet nahiyəsinə - Başkeçid və Zalqa, Borçalı nahiyəsinə Sarvan və Qarayazı, Yekaterinenfeldə isə Bolnisi və Ağbulaq rayonları daxil idi. Bir qədər də keçdi. Oktyabr sosialist inqilabı adlanan inqilab baş verdi və dünyaya qeyri-qanuni, möhkəm təməli olmayan bir quruluş gəldi. Bu quruluşun valideyni və ermənilərin daim haqq-nahaqq köməkçisi olan rusların yardımı və fitvası ilə Loru nahiyəsi müharibə yolu ilə, 1918-ci ildə Ermənistana birləşdirildi.

Bu müharibə Ermənistanla Gürcüstan arasında oldu. Borçalının qalan hissəsi Gürcüstanın tabeliyində qaldı. O vaxtlar baş verən proseslər necə də son dövrlər Dağlıq Qarabağda gedən proseslərə oxşayır, elə bil ki, tarix olduğu kimi təkrar olunur. İkisində də ermənilər eyni üsuldan məharətlə və hiyləgərcəsinə istifadə edirlər.

Gördüyümüz kimi, zamanın bu dönəmində də öz halal torpağını itirən, doğma xalqı bölünən, bir qədər də balacalaşan, bir az da kiçilən Azərbaycan oldu, Azərbaycan türkləri oldu. Bu dönəmdə də daim pusquda dayanan, arxadan vurmaq üçün fürsət gözləyən ermənilər və ağaları üçün münbit şərait yarandı. Özgə torpağını mənimsədilər, bir az da böyüdülər, biraz da şirnikdilər, bir qədər də həyasızlaşdılar.

Borçalının hesabına Gürcüstan da qazandı, əlbəttə, o da narazı qalmadı.

Bundan sonra başınıza nə müsibətlər gəldi, hansı dəhşətlərə dözməli oldunuz əziz Göyçə, Borçalı, Qaraqoyunlu? Həm ermənilər, həm də gürcülər həmin vaxtdan başlayaraq, bütün türk mənşəli, rayon, şəhər, kənd, dağ, çay, bulaq adlarını utanıb qızarma-dan dəyişib, qondarma adlar verərək, tarixi saxtalaşdırmaqla erməniləşdirməyə, gürcüləşdirməyə çalışdılar. Beləliklə, az bir müddət ərzində Başkeçid Dmanisi, Sarvan Marneuli, Qarayazı Qardabanı adlandı.

Səndən qopardılıb ermənistana verilən rayonların və kəndlərin adını da ermənilər dəyişdirdilər.

**9. Qaraqoyunlu və Göyçə.**

172 il bundan əvvəl, 1831-ci ildə Ermənistanın 37 rayonunun 295 kəndində, 1914-cü ildə isə 484 kəndində Azərbaycan türkləri yaşayırdı.

Mənşəcə Azərbaycan Türkləri iiə bağlı olan rayonların, kəndlərdən isə ancaq Qaraqoyunlu və Göyçəyə aid kəndlərin siyahısına baxıb, müvafiq nəticə çıxarın, əziz oxucular.

Eləcə də, çayların, bulaqların, bağların, dağların, dərələrin adları dəyişdirildi.

**Ermənistanda dəyişdirilmiş şəhər və rayon adları**

| Sıra №:- si | Şəhər və rayonların köhnə adları | Şəhər və rayonların təzə adları |
|---|---|---|
| 1. | Gümrü | Leninakan |
| 2. | Qarakilsə | Kirovakan |
| 3. | Manas | Alaverdi |
| 4. | Qəmərli | Artaşat |
| 5. | Düzkənd | Axuryan |
| 6. | Keşişkənd | Yexeqnadzor |
| 7. | Karvansaray | İcevan |
| 8. | Yeni bayazid | Kamo |
| 9. | Aşağı Qaranlıq | Martuni |
| 10. | Şınıx | Noyenberyan |
| 11. | Axta | Hrazdan |
| 12. | Hamamlı | Spitak |
| 13. | Calaloğlu | Stepanavan |
| 14. | Vedi | Ararat |
| 15. | Basarkeçər | Vardenis |
| 16. | Çəmbərək | Krasnoselo |
| 17. | Ağbaba | Amasiya |
| 18. | Əzizbəyov | Hayk |
| 19. | Sənain | Tumanyan |
| 20. | Taşir | Kalinino |

**Qaraqoyunluda və Göyçənin Krasnoselo və Basarkeçər rayonlarında adları dəyişdirilmiş kəndlərin siyahısı**

| Sıra №-si | Kəndin köhnə adı | Kəndin təzə adı |
|---|---|---|
| 1 | Haqqıxlı (Vurğun) | Hovk |
| 2 | Polad | Xacardzap |
| 3 | Ağkilsə | Cermakovan |
| 4 | Salah | Hakavanabank |
| 5 | Qaraqaya | Coravank |
| 6 | Yanıqpəyə | Antaraqeğ |
| 7 | Çaykənd | Dirabak |
| 8 | Bəryabad | Barepad |
| 9 | Əmirxeyir | Kalavan |
| 10 | Gölkənd | Ayqut |
| 11 | Toxluca | Draxtik |
| 12 | Ağbulaq | Axperek |
| 13 | Ağqala | Berdunk |
| 14 | Paşakənd | Asapat |
| 15 | Ağzıbir | Lcab |
| 16 | Ağkilsə | Azat |
| 17 | Böyük Qaraqoyunlu | Norabak |
| 18 | Qırxbulaq | Akunq |
| 19 | Babacan | Qızıl kənd |
| 20 | Dərə | Danakənd |
| 21 | Daşkənd | Hayrık |
| 22 | Günəşli | Kutakan |
| 23 | Zod | Sotk |
| 24 | İnəkdağı | Tretuk |
| 25 | Qaraiman | Kaxani |
| 26 | Qayabaşı | Qeğamobok |
| 27 | Bahar | Arpunk |
| 28 | Böyük Məzrə | Metis Marşik |
| 29 | Kiçik Məzrə | Pokr Maşrık |
| 30 | Saryaqub | Cağatsadzor |
| 31 | Subatan | Qeğakap |
| 32 | Qızılbulaq | Xacaxbyur |
| 33 | Şişqaya | Qukarik |
| 34 | Yarpızlı | Lcevan |

Amma, nəzərə almalı və ümidli olmalıyıq ki, Allahın səbri uzun olsa da sonsuz deyildir. Nə vaxtsa xalqın səbr kasası aşıb-daşacaqdır. Həqiqətin bir üzü var, nə vaxtsa görünəcəkdir. Hələlik ayaq tutub yeriyən yalanin yeriyə bilməyən vaxtı gələcəkdir. Onda düşmənlərimizin şeytan sifəti üzə çıxacaq və layiqli payını alacaqdır, əziz Qaraqoyunlu.

Göründüyü kimi, düşmənlərimiz məkrli niyyətlərini yerinə yetirmək üçün hər an pusquda durmuş, fürsət axtarmışdır və indi də belədir.

Düşmən müxtəlif, gizli və ya aşkar, müvəqqəti və ya daimi, sadəlövh və ya hiyləgər, güclü və gücsüz, yaxın və uzaq, daxili və xarici, mərd və namərd olur. Bu düşmənlərin hərəsinin öz yeri var.Babalarımız mərd düşmənin qülləsindən ölməyi, namərdin daşı ilə yaralanmaqdan üstün biliblər. Babalarımız mərd və güclü düşməni layiqincə qiymətləndiriblər, gücündən isə qorxmayıblar. Babalarımız namərd düşmənin gücündən deyil, hiyləsindən ehtiyatlanıblar.

Çünki, mərd düşmən döyüşə kişi kimi gedər, şir kimi hücuma keçər, açıq-aşkar vuruşar.

Mərd düşmən yıxar, amma kəsməz. Mərd düşmən düşmənin namusuna hörmətlə yanaşar, onu öz namusu kimi qorumağa çalışar. Namərd düşmən ilan kimi sürünüb, qəflətən zəhərləyər, sinədən deyil, kürəkdən vurar.

Baxın, dərk edin və yadda saxlayın ki, bizim erməni kimi namərd, hiyləgər, məkrli, eyni zamanda təəssüf ki, yaxın qonşu olan, yaxınlıqda məskunlaşan düşmənimiz olub, indi də var.

Biz heç kimə düşmən gözü ilə baxmaq istəmirik, ancaq nə etməli, fakt-fakt olaraq qalır, həqiqətin bir üzü var və onu tarixin səhifələrindən silmək mümkün deyil.

Beləliklə, digər dövlətlər kimi, Qarqoyunlu adlı dövlət də yarandı, bir müddət yaşadı, nəhayət ömrünü başa vurdu və öz yerini müxtəlif dövrlərdə müxtəlif adlı dövlətlərə verdi. Bu dövlətlərin tərkibində Boçalı, Qaraqoyunlu və Göyçə də var idi. Qaraqoyunlu bölgəsinin Qaraqoyunlu adını daşımasına və bəzi oxşar səciyyəvi xüsusiyyətlərə diqqət yetirdikdə, belə bir sual meydana çıxa bilər ki, Qaraqoyunlu Dövləti ilə

Qaraqlyunlu dərəsi arasında nə əlaqə vardı, dövlətin adı bölgənin adından götürülüb, yoxsa əksinə, bölgəyə dövlətin adı verilib?

Buna və digər məqamlara aydınlıq gətirmək üçün hər şeydən əvvəl bu bölgənin yerləşdiyi ərazinin coğrafi mövqeyinə, əhalisinin tərkibinə, mənşəyinə, məişətinə istinad edərək, alınan nəticələri sizinlə birlikdə müzakirə etməyi, müvafiq məntiqi nəticələri ümumiləşdirməyi faydalı hesab edirik, əziz oxucular. Bu məqsədlə aşağıdakıları nəzərinizə çatdırmaq istəyirəm.

Bildiyiniz kimi, Azərbaycanımızın batısında şairlər, yazıçılar, sərkərdələr diyarı, xalqımıza Vaqif,Vidadi, Səməd Vurğun, Osman Sarıvəlli, Hüseyn Mehdi, Hüseyn Arif, İsmayıl Şıxlı və digərləri kimi şair və yazıçılar, vaxtı ilə Rus artilleriyasının atası adlanmış Əliağa Şıxlinski kimi şanlı sərkərdələr bəxş etmiş doğma və qədim Qazax elləri məskən salmışdır. Bu müqəddəs diyar batı tərəfdən Gürcüstan Respublikasının tərkibində qalan Borçalı bölgəsi ilə, güney tərəfdən isə ruslar tərəfindən zorla Ermənistan Respublikasının tabeliyinə verilmiş Dilican dərəsi ilə bilavasitə, Qaraqoyunlu dərəsi və Qaraqoyunlu elləri ilə isə Dilican dərəsi vasitəsilə qonşudur. Qazaxdan Borçalı yoluna perpendikulyar olmaqla sola, dağlar qoynuna tərəf, Dilican istiqamətində hərəkət etdikdə sağ və sol tərəfdə yol boyu düzülmüş bir sıra irili xırdalı kəndlərdən sonra qarşıya ilk iri yaşayış məntəqəsi, keçmişdə Karvansaray adlanan şəhər tipli gözəl bir qəsəbə çıxır. Sonralar İcevan adlanan bu qəsəbə-şəhər 1988-ci ilin məlum hadisələrinə qədər tərkibinə həm də qaraqoyunluların bir hissəsinin daxil olduğu eyni adlı rayonun in-zibati mərkəzi olmuşdur. Qaraqoyunluların digər yarısı isə Göyçənin bir hissəsi ilə birlikdə Krasnoselo rayonunun tabeliyinə verilmişdir. Rayon mərkəzi olan Krasnoselo əvvəllər Çəmbərək adlanmışdır.

İcevan şəhəri Qazaxdan 30-35 km, Dilican şəhəri isə 80-85 km məsafədə yerləşir.

Qazağı Dilicanla birləşdirən, təbiətin bütün gözəlliklərini özündə cəmləşdirən və gözəlliyi ilə böyük şairimiz Səməd

Vurğunu da ilhama gətirərək :

Yenə səni gördüm Dilican dərəsi,
Yadıma çox köhnə zamanlar gəlir
dedirdən Dilican dərəsidir, bu dərə.

Bu dərə ilə, mənbəyini Dilican dağlarından alan, axıb Kürə qovuşan bir çay axır. Bu Akstafa çayı adlanır. həmin dərə uzunu çayın gah sağı, gah da solu ilə Dilicana, oradan isə İrəvana qədər uzanıb, gedən magistral yol salınmışdır. Bu yol bəzi yerlərdə sıx meşəliklərin içindən, bəzi yerlərdə isə dağın yamaclarından və çəmənliklərdən keçir. Yolun kənarlarında mərmər daşlardan tikilərək,xüsusi zövqlə bəzədilmiş çoxlu bulaqlar vardır.Həmin bu-laqların üstü həmişə, xüsusən də yay aylarında yolçularla dolu olardı. İcevan, Dilican yolunun təxminən 20 kilometrliyində Dilican dərəsinə böyük bir dərə qovuşur. Bu dərə Qaraqoyunlu dərəsidir.

Bu dərə ilə axıb, Akstafa çayına birləşən çay isə Tərs çay adlanır. Qaraqoyunlu dərəsi və Tərs çayın Dilican dərəsi və Akstafa çayı ilə birləşdiyi yer Darlıq, Çayqarışan və ya Çayqovuşan adlanır.

İki çayın qovuşduğu yerdən 200-300 metr yuxarıda biri Akstafa çayının, digəri isə tərs çayın üstündən keçməklə iki körpü salınmışdır. Darlıq körpüsü adlanan bu körpülərdən keçən hər bir kəs müqəddəs bir diyara Qaraqoyunlu dərəsinə ayaq basmış olur, əziz oxucular.

Bu dərə dağlar başında yerləşən rayon, sonralar Krasnoselo adlanan Çəmbərək qəsəbəsinə qədər uzanır. Qaraqoyunlu dərəsinə və Tərs çaya sağdan və soldan irilixırdalı dərələr və kiçik dağ çayları birləşir. Bunlar hamısı birlikdə uca dağlardan, gen dərələrdən, ürək açan mənzərələrdən, zəmzəm züm-züməli büllur bulaqlardan, dünyada tayı-bərabəri olmayan qızıl xallı balıqlı çaylardan, süsənli, sünbüllü, tər bənövşəli, alagöz ceyranlı çöllərdən, əsrarəngiz meşəliklərdən, cənnətməkan bağlardan ibarət olmaqla, təbiətin bütün gözəlliklərini özündə cəmləşdirən geniş bir ərazini əhatə eləyir. Bax bura, bu ərazi Qaraqoyunlu adlanır, istəkli oxucu.

Təbiət nə qədər gözəl və cazibədar olsa da, bu gözəlliyi duyub-qavraya bilən, ondan zövq alan, gözəlliyi daha da gö-

zəlləşdirə bilmək iqtidarında olan, yaradılanın ən alisi, ən mükəmməli, dünyanın əşrəfi insan olmasa, kimə lazımdır bu gözəllik.

Büllür buxar, alma yanaq, ay qabaq, dili şəkər, qaymaq dodaq sonalarsız çinar boylu, təmiz soylu ,şahmar zülflü, müjgan oxlu sənəmlərsiz, baxışlarından qığılcımlar saçılan, döyüş meydanına şir tək atılan pəhləvan cüssəli , ər oğullarsız, nər igidlərsiz kimə lazımdır təbiətin gözəlliyi ?

Ulu borçalı, ulu Qaraqoyunlu, ulu Göyçə, siz də üzərinizdə yaşatdığınız insanlarla birlikdə gözəlsiniz. Doğmalarından ayrı düşdükdə gözəllik mahiyyətini itirir, adiləşir, yetimləşir.

Qaraqoyunluda yaşayıb-yaradan, öz varlıqlarını əməlləri ilə təsdiqləyən Qaraqoyunlular müxtəlif kəndlərdə məskən salmışlar. Əvvəllər bu kəndlərin sayı çox olmuşdur. Amma, sonralar müxtəlif obyektiv və subyektiv səbəblər nəticəsində, o cümlədən iyiriminci əsrin altmışıncı illərində Sovet İttifaqının başçısı N.S.Xruşşovun təşəbbüsünə, yəni kolxoz və sovxozların birləşdirilərək, iriləşdirilməsi planına uyğun olaraq kəndlərin sayı azalaraq, on üçə enmişdir.

Darlıqdan Krasnoselo tərəfə getdikdə magistral yol boyu yerləşən ilk kənd Alaçıqqayadır. Bu kənddən sonra növbə ilə Polad kəndi, bu sətirlərin müəllifinin də dünyaya göz açdığı Salah kəndi, daha sonra isə Qaraqaya, Çaykənd və Gölkənd kəndləri gəlir. Digər kəndlər magistral yoldan bir qədər uzaqda, ya dağlar qoynunda, yaxud da bilavasitə dağlar başında məskən salmışlar. Bu kəndlərə Əmirxeyir, Bəryabad, C-ıvıxlı, Yanıxpəyə, Mürteyil kəndləri və Dilican dərəsində yerləşən Vurğunkənd (Haqqıxlı) kəndi aiddir.

Geniş bir ərazinin Qaraqoyunlu adlanması və qaraqoyunlu kəndlərinin hamısının adlarının sırf türk mənşəli adlar olması və bir çox tarixi qaynaqlar bu bölgədə ta qədim dövrlərdən Azərbaycan türklərinin məskunlaşdığını göstərir.

B.Ə.Budaqovun və Q.Ə.Qeybullayevin nəşr etdirdikləri izahlı lüğətdə Ermənistan ərazisində, o cümlədən də Qaraqoyunlu və Göyçədə Azərbaycan-Türk mənşəli toponimlər haqda geniş məlumatlar vardır.

Qaraqoyunluların və Qaraqoyunlu bölgəsindəki kəndlə-

rin mənşəinin maraq doğuracağını nəzərə alaraq, lüğətdəki bəzi məlumatları oxucuların nəzərinə çatdırmağı faydalı hesab edirəm. Guman edirəm ki, elmin bu sahəsi üzrə məlumatlı insanlar öz faydalı münasibətlərini bildirəcəklər.

**1. Alaçıqqaya (Alaçıq).**

Kəndin adı mənşəini Alaçiki dərəsinin və Qazax qəzasında yerləşən eyni adlı dağın adından götürmüşdür. Ala sözü rəngi göstərir, çiki sözü isə türkcə "dar dərə" "darısqal dərə" deməkdir.

**2.Murteyil.**

Murteyil sözü, yəni Murtu eli, Murtu tayfası mənasını verir. Murteyillilər Türk mənşəli Təklə tayfasının Murtulu qolundan formalaşmışlar.

**3.Polad (Polad Ayrım, Polad Ayrum).**

Polad ayrımların (Ayrumların) Polad çayı kənarında məskunlaşmış hissəsinin adıdır .

Ayrım (Ayrum) orta əsrlərdə İrəvan əyalətində yaşamış Türk mənşəli tayfanın adıdır. A.Bakıxanovun yazdığına görə Əmir Teymur 1402-ci ildəki Ankara vuruşmasından sonra əlli min Türk ailəsini, yəni əlli min Rumluları (Anadoluları) İrəvanda, Qarabağda və Gəncədə yerləşdirmişdir. Ayrım sözü El-Rum, yəni Rum eli sözünün təhrif olunmuş variantı, formasıdır.

İ. Şopenə görə Türklərin bir hissəsi Türkiyədən Ərməniyəyə köçərək Ayrumlu, Seyid Axsalı, Taşanlı və Saatlı adları ilə yaşamışlar. Sonralar Ayrımlar Polad Ayrıma, Aqsaq Ayrıma, Quşçu Ayrıma, Baqanis Ayrıma və s. bölünmüşlər. Baqanis sözü türk dilində "Çayın aşağı axarında quru məcra" deməkdir.

**4 Göyərçin**

XIX əsrdə Qafqazda Göyərçin adlı altı kənd olmuşdur. Göyərçin sözü iki məna verir. Onlardan biri göyərçin quşunun, ikinci isə Qədim Türk tayfasının adıdır.

Tarixi mənbələrdən məlumdur və söhbətimizin başlanğıcında da qeyd etmişdik ki, böyük Hun imperiyasının başçısı Atilla Avropaya səfər etdikdə cənubi Qafqaza da daxil olmuşdur. O zaman bunların tərkibində Kuyərçi tayfası da ol-

muşdur. Göyərçin kəndi də öz mənşəini Kuyərçi tayfasının adından götürmüşdür. Sonralar Kuyərçi sözünün deyilişi göyərçin quşunun adı ilə yanlış olaraq eyniləşdirilmiş və toponimlərdə Göyərçin kimi qeyd edilmişdir.

Kənd 1950-cı ildə ləğv edilmiş və Salah kəndinə köçürülmüşdür.

**5.Yanıqpəyə.**

Kənd qışlaq kimi məskunlaşıb. Yandırılmış pəyə yerinin adını göstərir.

**6.Əmirxeyir.**

Kəndin adı iki sözdən, Əmir və Kair sözlərindən götrülmüşdür. Əmir şəxs adıdır, Kair isə türkcə "vadinin suvarılan hissəsi" deməkdir. ƏmirKair dəyişərək, Əmir xeyir olmuşdur.

**7.Cıvıxlı.**

Çıvıxlının əsl adı Çibiklidir. Zəngəzurda yaşamış, digər adı Çinarlı olan Çivikli adlı Türk tayfasının adını göstərir.

**8.Gölkənd.**

Yuxarıda adı çəkilən mənbənin qeyd etdiyinə görə Gölkəndin əsl adı Kulkənd və ya Qulkənddir. Kul (Qul) Qıpçaq türklərinin tayfalarından birinin adıdır.

Hörmətli oxucular, bildiyimiz kimi Gölkəndin məskunlaşdığı ərazidə bir-neçə göl var. həmin göllərə görə kəndin Gölkənd adlandırılması söylənilir və bəlkə də bu həqiqətə daha uyğundur.

Oxucuların nəzərinə çatdırmağı özümə borc bilirəm ki, dağ kəndləri olmalarına baxmayaraq, bu kəndlər çox inkişaf etmiş kəndlər idi. Bunların hər birinə geniş və abad yol çəkilmişdi. Kəndlərin hamısı elektrik işığı ilə təmin olunmuşdu. İlin istənilən fəslində-qışın qarlı, çovğunlu, boranlı, yazın leysan yağışlı günlərində adi minik maşınları ilə həmin dağ kəndlərinə getmək heç bir çətinlik törətmir və əlavə problemlər yaratmırdı. Bu bölgənin son dövrlərdəki vəziyyəti haqda sonra daha geniş və hərtərəfli məlumatlar alacaqsınız. Ona görə də söhbətimizin axarını dəyişmədən Qaraqoyunlu dərəsi ilə tərs çayın axarına əks istiqamətdə yolumuza davam edək, əziz oxucular.

Beləliklə, Qaraqoyunludan gəlib, Çəmbərəyi (Krasnoselonu) keçərək, qarşıdakı dağın zirvəsinə qalxdıqda birdən-birə göz önünə bir-birinə söykənən, sanki daha möhkəm dayana bilmək məqsədilə, köklərindən bir-birinə bağlanmağa məcbur olan irili-xırdalı, müxtəlif görkəmli və müxtəlif xassəli, dəli, ağıllı, mülayim və sərt dağların yaratdığı ucsuz-bucaqsız , əsrarəngiz bir dünya açılır.

Belə vəziyyətlərdə, ilk anlarda insan özünü möhtəşəm görkəmli dağlarla müqaisədə olduqca kiçik,həddən artıq zəyif hiss eləyir ancaq bir qədər keçdikdən sonra isə, məhs insan olduğuna, istənilən zirvəni fəth etməyə qadir olduğuna görə özünü daha üstün, daha qüvvətli, daha uca, daha böyük sanır.

Adama elə gəlir ki, dağlar səni, özü yaradıb bu dünyaya bəxş etdiyi oğlunu gördüyünə sevinir. Ana körpəsini götürüb başının üstə qaldırdığı kimi, o da səni öz zirvəsinə qaldırır, öz böyüklüyünü, əyilməzliyini nəzərə almayaraq, qarşında baş əyir və əzizləyir.

Qarşınızda görünən və görünməyən dağların və bu dağlar arasında özünə yer eləmiş göy gözlü gözəlin - Göyçə gölünün yerləşdiyi bu müqəddəs ərazi ulu Göyçədir, istəkli oxucular.

Sazın, sözün beşiyi, aşıqlar, aşiqlər məskəni, Alılı, Ələskərli, Növrəs İmanlı, dinli imanlı, qanlı-qadalı Göyçədir buralar.

Dağ çiçəyi ilə uyuyan, Göyçə gölündə yuyunan, kərəmi ilə külə dönən, cəngi ilə koroğlulaşan, misri qılınca, qasırğaya, coşqun selə dönən Göyçədir buralar.

Baxın, gözünüzü geniş açıb, yayda yaylaq, qışda ovlaq, yazda seyrangah olan dağlara, xəstə üçün təpəsində qar olan, hər cür çiçək açan, laləzar olan dağlara bir də baxın.

Gahdan çiskin tökən, gah duman eləyən, gah gəlib-gedəni peşiman eləyən, gah da geyzə gəlib, nahaq qan eyəyən dağlara, Göyçə, Qaraqoyunlu dağlarına doyunca baxın.

Baxın, gözəllər seyrandahi, murğuzar olan dağlara, aşıq Ələskəri öldürüb, günahkar olan dağlara bir də baxın və bilin ki, buralar oğuz türklərinin məskəni, çox qədim və şərəfli ta-

rixə malik Göyçədir, Qaraqoyunludur.

İstəkli oxucular, tarixi mənbələrdə Göyçə adı ilk dəfə 1515 il əvvəl, 488-ci ildə çəkilir. Həmin dövrlərin erməni mənbələrində Göyçə gölünün adı “Qelam dənizi” və yaxud “Qeqam dənizi”kimi işlədilmişdir.

Milli sərvətimiz olan “Kitabi Dədə Qorqud dastanınıda Göyçə Gölünün adı” Kökcə tenqiz, “yəni göycə dəniz” kimi göstərilmişdir.

Orta əsrin erməni müəllifləri Göyçə gölünü, Qeqakuni gölü, Göyçə mahalını isə “Qeqam ölkəsi” adlandırmışlar.

XIV əsrdə yazıb-yaratmış Həmdullah Qəzvininin əsərlərində, Əmir Teymurun 1402-ci ildə cənubi Qafqaza səfəri ilə əlaqədar mənbələrdə Göyçə gölü “Kökcə tenqiz” və yaxud “Qekcə tenqiz”,1548-ci ilə aid bəzi mənbələrdə isə “Qokca denqiz” adlandırılmışdır.

Şah İsmayıl Xətai bu yerlərlə bağlı olaraq 1510-cu ildə verdiyi fərmanların birində “Göyçə mahalı” ifadəsini işlətmişdir .

Göründüyü kimi Göyçə gölünün və bütövlükdə Göyçənin tarixi adları təmiz, təkzibolunmaz türk sözləri olan “göl” və “göy” sözlərindən götürülmüşdür. Bu, Göyçə gölünün göy rəngə çalması ilə bağlı olan ifadələrdir.

Orta əsrlərdən başlayaraq Göyçə gölü Sevan adlanmışdır. Tarixi qaynaqlarda bu belə izah olunur: XVIII əsr erməni müəllifləri qeyd edirlər ki, Göyçə gölündə bir ada var. Həmin adada iki monastr var imiş. Onlardan birini Azərbaycan türkləri tikərək “Qara kənd” adlandırmış, digərini isə ermənilər tikərək, tərcüməsi Qara kənd olan Sev-Vank adlandırmışdır.

Mənbənin yazdığına görə Eçmiadzın kilsəsi günah işlətmiş monaxları cəzalandırmaq məqsədilə həmin monastra, yəni Sev-Vanka sürgün edərmiş.

Sonralar tələffüs dəyişikliyinə məruz qalaraq, monastrın adı Sev-Vank deyil Sevan kimi tələffüs edilmiş, Göyçə gölü isə Sevan adlanmışdır.

Bədnam Sovetlər Birliyi dövründə, 1930-cı ildə Ermənistan Dövlətinin adi bir fərmanı ilə, bir göz qırpımında Göy-

çə Gölünün doğma adı dəyişdirilərək, Sevan oldu, 1935-ci ilin 3 yanvarında isə Göyçə ərazisində Sevan rayonu yaradıldı.

Hörmətli oxucular, Qaraqoyunluya və Göyçəyə ayağınız dəyməsə də, oraları görməsəniz də yuxarıda deyilənlərə görə və xəritəyə nəzər salmaqla müəyyən edə bilərsiniz ki, haqqında söhbət etdiyimiz bölgənin ərazisi Qaraqoyunlu Dövlətinin ərazisinin daxilində, təxminən orta hissədə mərkəzə yaxın yerdə yerləşir. Bundan əlavə, bu bölgədə ancaq oğuz türkləri yaşamışdır, yaşayış məntəqələrinin, dağların, çayların, bulaqların hamısının adları sırf türk mənşəli adlardır.

Hamıya yaxşı məlumdur ki, tarix boyu ərazidə müxtəlif dövrlərdə müxtəlif adlı dövlətlər yaranmış, bir müddət yaşamış və öz yerini başqa dövlətə verməyə məcbur olmuşdur. Bu zaman həmin ərazi, həmin dövlətlərin qurulduğu torpaq isə nə yerini, nə də adını dəyişməmişdi, ümumiyyətlə, bu mümkün də deyil.

Qaraqoyunlu Dövlətinin tarixi alimlərimiz tərəfindən hər tərəfli tədqiq edilmiş və dəqiq öyrənilmişdir. Müəyyən olunmuşdur ki, həmin ərazinin əsas hissəsində yaşayan oğuz türkləri Qaraqoyunlu adlanan tayfadan ibarət olmuşdur. Ona görə də deyə bilərik ki, həm Qaraqoyunlu bölgəsinin, o cümlədən Qaraqoyunlu dərəsinin adı eyni adlı tayfanın adından götürülmüşdür.

Onu da nəzərə almaq lazımdır ki, müxtəlif yerlərdə, o cümlədən Azərbaycanda, Gürcüstanda, Türkiyədə, İrakda və İranda Qaraqoyunlu adlı bir-iki yaşayış məntəqəsi və ya kəndlər var.

Amma, Qraraqoyunlu dərəsindən başqa heç bir yerdə elə bir bölgə yoxdur ki, çoxsaylı kəndlərdən ibarət geniş bir ərazi Qaraqoyunlu adlansın. Maraqlıdır ki, Qraqoyunlu dərəsindəki kəndlərdən heç birinin adı Qaraqoyunlu deyil. Ancaq, ərazinin adı Qaraqoyunludur. Bu dəlil, sübut da Qaraqoyunlu bölgəsinin adı ilə bağlı dediklərimizin doğru olduğunu söyləməyə əsas verir.

Beləliklə, Borçalının, Göyçənin və Qaraqoyunlunun da

daxil olduğu geniş bir ərazidə adını Qaraqoyunluların adından götürmüş, bayrağında qara qoyun şəkli olan Qaraqoyunlu Dövləti, sonra ağ qoyun şəkilli bayraq qəbul etmiş Ağqoyunlu Dövləti, daha sonralar isə müxtəlif formalı və şəkilli bayraqları olan digər dövlətlər yaranmışdır.

Haqqında bəhs etdiyimiz bu yerlər, bu gözəl və geniş ərazi fəxr edilməli keçmişə, qədim və şərəfli tarixə malik Qaraqoyunludur, Göyçədir.

Əvvəlləri toylu-busatlı, indisi kədərli, qüssəli, yaslı, dağ vüqarlı, torpağı bərəkətli, bağları barlı, alnı açıq, üzü ağ Qaraqoyunludur, Göyçədir.

Bəzilərinin dünyaya göz açdığı andan gördüyü, ulularının uyuduğu ana və atalarının, nənə və babaların əbədi beşiyi olan ana yurdu, digərləri üçün isə başqalarının yazdıqlarını oxuyaraq, deyilənləri eşidərək,öz təfəkkürlərində formalaşdırdıqları, təsəvvürlərində yaratdıqları Qaraqoyunludur, Göyçədir.

Mənim üçün isə özümdə, öz daxilimdə, qəlbimdə yuva qurmuş, ürəyimin başında məskən salmış, ruhumda yaşatdığım, arzusu ilə yaşadığım, həsrətilə alışdığım, yandığım, hər qarışına bələd olduğum, hər gün andığın, tikanı da gülüm olan, ağzımda dilim olan, soyadım, adım, uçmağa qanadım, tamımdadım olan Qaraqoyunludur, Göyçədir.

Ürəyim yaman istəyir oraları. Burnumun ucu göynəyir.

İstədiyim isə o qədər də çox deyil. Nə istəyirəm ki? Allahın əlində bunları və ya bunlara bənzər arzuları yerinə yetirməyə nə var ki?

Dünyaya göz açdığım, vüsalının arzusu ilə yaşadığım köhnə Salah quzeyli-güneyli bir neçə dağlar arasındakı olduqca gözəl bir yerdə, çayın kənarında yerləşirdi. Hər Fəsilin özünə məxsus gözəllikləri var idi. Yay vaxtı gecələr zil qaranlıq olurdu. Aylı gecələrdə isə təbiət süd kimi dümağ bir rəngə boyanır, əsrarəngiz bir gözəllik yaranırdı.

Axşamlar dağlar arxasından tədricən qalxan ayın işığı kəndin qabağındakı Kəmər qaya adlanan dağın zirvəsindən başlayaraq, yavaş-yavaş aşağı enir, kəndə yaxınlaşırdı.

Bir qədər keçdikdən sonra bu balaca kəndin yarısı ay

işığına qərq olub, işıqlanır, o biri yarısı isə qaranlıqda qalırdı. Belə hallarda biz uşaqlar daha böyük həvəslə oynaşırdıq. Lap Məlikməmməd nağılına oxşayırdı belə gecələr. Qara qoça minərək işıqdan qaranlığa, ağ qoça minərək qaranlıqdan işığa atılardıq və bundan sonsuz həzz alardıq. Beləcə, gecədən xeyli keçənə qədər nağıllar aləmində olardıq.

Yaddaşımda əbədi həkk olub, silinməz izlər buraxıb o günlər, duyumumda, duyğumda, özümdə, öz daxilimdə, ruhumdadı o anlar.

O dövrlər yada düşəndə ilk növbədə Məlikməmməd nağılı, yanıq Kərəmi və Dilqəmi havaları yoldaş, sirdaş olur mənimlə. Elə həmin andaca:

Ömrümün yolları yağılı imiş,
Günlər nə şirinli, ağılı imiş,
Həyat Məlikməmməd nağılı imiş,
Nəyimə lazımdı bu dövlət, bu mal,
Aşıq dərdin alım bir Dilqəmi çal!

deyib, telli sazı dilə gətirmək. yenə də nağıllar aləminə qayıtmaq istəyirəm.

İstəyirəm kəndlərdən birində toy məclisi qurula, qonşu kəndlərdən dəstə-dəstə qonaqlar gələ, qara zurnanın səsi ətrafa yayıla.

Məclisin bir küncündə dayanan bir oğlan aralarında sevgi adlanan ilahi duyğunun cücərtiləri yaranmış gözəl bir qıza incə bir göz vurub, rəqsə dəvət eləyə. Yanaqlar allana, qızıl gül rəngi ala. Onların aralarındakı müqəddəs münasibətdən başqaların duyuq düşməməsi məqsədilə, qızın rəfiqəsi meydana girib oynaya, onları rəqsə dəvət eləyə, özü isə oyundan çıxa.

İstəyirəm o işarəti, yanaqların allanmasını, dodaqların ballanmasını, ürəklərdə baş qaldıran gələcəyə ümid qığılcımlarını, arzuların çin olma istəyini görəm, duyam, qiymətləndirəm və bu ilahi duyğunun təsirindən məmnun olam.

İstəyirəm bütün Qaraqoyunlunun istəklisi, hamının sevimlisi, saf qəlbli, xoş niyyətli, nəcib, yüksək dərəcədə səxavətli, sədaqətli və əxlaqlı insan, məclislər yaraşığı və təşkilatçısı olan Qarasim müəllim Gölkənddə sovxoz direktoru iş-

ləyə. Onun təşkilatçılığı və istəyi ilə bir qrup dostlarla birlikdə Göyçə gölü tərəfdən, sürücüdən böyük sürücülük məharəti, yüksək çeviklik tələb eləyən çox çətin dağ yolu ilə, bir təhər dağın başına qalxaq və Yanıqpəyə kəndindən yuxarıdakı Soyuqbulaq adlanan novlu bulağın üstünə gələk.

Əvvəlcə yerindən qopub yanı üstə çevrilərək suyu boşalmış və bir qədər də mamırlamış novu yaxşıca təmizləyib, öz yerinə qoyaq. Nov su ilə dola. Bundan sonra süfrələr açıla, badələr qalxa, sağlıqlar deyilə.

Çox istəyirəm ki, əvvəlcədən kəsdiyimiz şərtə əməl edərək, suyu stəkanla deyil, dizimizi yerə qoyub, ağzımızı söykəyərək bilavasitə novdan içək.

İstəyirəm yay vaxtı ola, məzuniyyətə çıxıb kəndə gedəm. Aramızda yaş fərqinin böyük olmasına baxmayaraq, səmimi dost, istedadlı aşıq, tanınmış şair və qeyri-adi insan olan Mikayıl Azaflı da kəndə gələ. Ağnabadda, Alban kilsəsinin qarşısındakı gül-gülü, çiçək-çiçəyi çağıran talada, iki kiçik dağ çayının qovuşduğu gözəl bir yerdə məclis qurula. Söz qanan, dərd anlayan, el-oba sevgisi ilə alışan-yanan etibarlı, etiqadlı dostlar, tanışlar toplasa. Bir gündə dörd qoyun kəsilə, məclisdəkilərin sayı çox olmasa da yemək-içmək yenə də azlıq eləyə.

Hamı sazın-sözün sehri ilə ovsunlana, şirin-şirin, qağa deyə müraciət etdiyim Azaflının özünəməxsus səsi bütün Ağnabada yayıla, sarıtel, kərəmi, dilqəmi, ruhani, dubeyti, şərili, irəvan çuxuru, Göyçə gülü, qaraçı (Qaraça çobanı) havalarının təsirindən məst olaq.

İstəyirəm Azaflı dubeytisinə rəhmətliyin qazamatda yazdığı:

Mən məhbusa bir xəbər ver,
Açılıbmı yaz ay bülbül ?
Dərdim çoxdu, necə deyim,
Qələm götür yaz ay bülbül.

bəndi ilə başlanan şeir oxuna və bu gözəl havanın nəqarət hissəsinin oxunmasında hamımız iştirak eləyək.

İstəyirəm dünyasını vaxtsız dəyişmiş etibarlı dostum aşıq Aydın Çobanoğlu da Salaha gələ, zarafatla Əmirxeyir camaa-

tı qarşısında imtahan verib, aşıqlıq diplomu almışam deyə və məclisdəkilər tərəfindən alqışlana. Quzeydə, meşəliyin dərinliyindəki Fıstıqlı bulağı adlanan bulağın üstə məclis qurula, ürəklərdə çiçək bitə, arzular gül aça, gözlərdən şəfəq saça.

İstəyirəm məclisin qızğın çağında bir-neçə dostlarla birlikdə Gölkənddən Süleyman və Hümbət qardaşlar da gələlər.Sevinc sevincə qarışa, məclis daha da şənlənə. Bir qədər keçdikdən sonra qeyri-adi, maraqlı bir yarış başlaya. Bu yarışda neçə yüz illərin şahidi, iri gövdəsindən və şux duruşundan ilahi bir möhkəmlik, əlçatmaz əzəmət yağan qocaman bir palıd ağacına dırmaşmaqda hamıdan yaşlı olmasına baxmayaraq, rəhmətlik Həbib müəllim Aliyev, uzağa tullanmaqda isə rəhmətlik Süleyman həkim birinci yeri tuta.

İstəyirəm Tibb Universitetində işlədiyim ilk illərin xoşbəxt günlərinin birində baş verən əhvəlata bənzər əhvəlat təkrarlana.

Məsələn, istəyirəm bir axşam çağı qaş qaralanda ulu Göyçənin haylı-haraylı kəndlərindən biri olan Cilin kənarından keçən, təmir işləri aparıldığına görə hərəkətin çətinləşdiyi magistral yolun dar bir yerində digər bir avtomobillə üzüzə gələk. Bir-birimizə yol vermək məqsədilə hər ikimiz dayanaq. Həmin maşının işığı sükan arxasında mənim üzərimə düşə və məni tanıyalar.

İçində bir-neçə nəfər olan o maşında böyük təbə, deyilənə görə aşıq Əsəddən sonra ən gur səsə malik olan, aşıqlıq sənətinin tanınmış nümayəndəsi aşıq Yunus da ola.

Bu məcburi dayanma xoş bir sonluqla nəticələnə, təsadüfdən zərurət yarana. Aşıq Yunusla görüşək və qoca aşığın təklifindən çıxa bilməyib, planımızı pozaq və onlara qonaq olaq.

Cilin kolxoz sədri, sonra isə Krasnoselo rayonunun icraiyyə komitəsinin sədri işləmiş əziz dostum Abbas müəllim Mazanova xəbər çata, o da kolxoz idarə heyətinin iclasını yekunlaşdırıb, aşıq Yunus gilə gələ.

Zamanın sərt və amansız sınaqlarının silinməz izlərini üz-gözündə, oturuşunda-duruşunda, ümumiyyətlə bütün hə-

rəkətlərində həkk etmiş qoca aşıq uzun illər boyu özü ilə bərabər gəzdirdiyi ən yaxın sirdaşı və ən etibarlı dostu telli sazı götürüb, sinəsinin üstə qoya və bir-iki ağız oxumaqla könlümüzü oxşamaq istəyə.

Təssüf ki, qocalıq öz işini gördüyündən, uşaqlıq dövründən yaddaşıma həkk olmuş avazın, eşitmək istədiyim səsin, görmək istədiyim qədd-qamətin yerində olmadığını bilavasitə öz gözümlə gördükdə biruzə vermək istəməsəm də kədərlənəm.

Saf qəlbli, incə duyğulu, kövrək hissli Abbas müəllim bu övqatı dərhal duya və hiss etdirmədən, nəzakət qaydalarına yüksək formada əməl etməklə sazı götürüb, bizi əfsanəvi saz-söz dünyasına apara.

Əziz Qaraqoyunlular və Göyçəlilər, gördüyünüz kimi çox şey istəmirəm. Nə istəyirəm axı? Vəzifə istəmirəm, vardövlət istəmirəm, başı ərşə dayanan villalar, fəaliyyətdə olan zavodlar, fabriklər sahibi olmaq istəmirəm, heç bir təhsil verməyən özəl universitetlər təsisçisi olmaq istəmirəm.

Sadəcə olaraq, candan əziz sandığım doğma el-obanın öz ata- baba yurdunda olmasını, adət-ənənəmizin pozulmamasını, əvvəlki səmimiliyin, saflığın, etibarın önə çıxmasını, çirkin alver üzərində qurulan yalançı yaxınlığın, aldadıcı mehribançılığın, süni, təməlsiz dostluğun təsəvvürdən, yaddaşlardan silinməsini istəyirəm.

İstəyirəm qonşu qonşuya odu, suyu, yolu, işığı əsirgəməsin. İstəyirəm qonşu qonşuya sidq ürəklə kömək əlini uzatsın. Bu kömək əsrlər boyu olduğu kimi yenə də təmənnasız olsun. Qonşu od qonşusu, qor qonşusu olsun.

Bəli, nəzərinizə çatdırdığım kimi Ağnabadda, Fıstıqlının bulağında, Yanıqpəyənin üstündəki novlu soyuqbulaqda, Cantəpədəki Hasanca bulağında, Göyçə gölünün kənarında kef məclisləri qurmaq, Ağbulaqda, Cildə aşıqlar məclisində iştirak edərək, axırı xeyirlə qurtaran kövrək dastanlardan birini dinləmək, dünyaya göz açdığım köhnə Salahda evimizin qalıqları yanında baş əymək, qəbiristanlıqda əbədi uyuyanların hamısının, o cümlədən anamın və atamın qəbri önündə diz çöküb, narahat ruhları qarşısında düşüncəyə dalaraq,

kövrəlmək və yanımdakıları da kövrəltmək istəyirəm.

Lakin istəyimi yerinə yetirə bilmirəm. Əlim çatmır, ünüm yetmir.Yeganə təsəllim yuxularımdır.Yuxularım məndən qeyrətlidir. Ancaq yuxularda görürəm Qaraqoyunlunu, Göyçəni.

Gördüyüm bu yuxuları mənim vəziyyətimdə olan, doğma torpağına gedə bilməyən, anasının, atasının, ulularının qəbirlərini ziyarət etmək imkanından məhrum olan, köçkün ömrü yaşayan oxucularla bölüşməyə mənəvi ehtiyac duyuram. Bilmək istəyirəm ki, Kəlbəcərini, Şuşasını, Laçınını, Ağdamını, Füzulisini, Zəngilanını, Qubadlısını, Zəngibasarını, Masisini, Vedisini, Amasiyasını, Qafanını itirmiş,xəstə və qərib ruhlu əcdadlarının qəbrini ziyarət etməkdən məhrum olmuş mənim kimilər də oxşar yuxularmı görürlər ?

Bəs mən necə yuxular görürəm ? Bəzi mənim tanıdığım mən dərdlilər necə yuxu görürlər ? Mən deyim, siz isə nəticə çıxarın əziz Qaraqoyunlular, istəkli oxucular.

Mən Azərbaycan Dövlət Universitetinin II kursunda oxuyarkən atam, ondan iyirmi dörd il sonra, 1985-ci ildə, məlum hadisələrdən cəmisi üç il əvvəl isə anam dünyasını dəyişib. İkisi də Qaraqoyunlunun Salah kəndindəki qəbristanlıqda torpağa tapşırılıb.

Hasança Paşa kimi daha çox tanınan atam Musayev Paşa Hasan oğlu çox qoçaq adam olub, ermənilərlə vuruşlarda xüsusi dəstələr təşkil edərək, çoxlarını cəhənnəmə göndərib.

Bu haqda yaddaşlarda olduqca sox, bəzi kitablarda isə qısa məlumatlar vardır.Atam o bölgədən çox uzaqlara getməmiş, Bakını görməmişdi.

Anamın isə əksinə, ömrünün son iyirmi ilindən çoxu Bakı ilə bağlı olmuş, hər il bir-neçə ay Bakıda yaşamış, nəvələrinə nənəlik etmiş, bir növ Bakılılaşmışdı.

Ona görə də fikirləşirdim ki, yuxuda atamı ancaq Qaraqoyunluda, anamı isə həm Qaraqoyunluda, həm də Bakıda görməliyəm .

Amma belə olmadı.Təssüf ki, nə qədər arzusunda olsam da atamı görmürəm. Anamı isə tez-tez, ancaq Qaraqoyunluda görürəm. Bircə dəfə də olsa anamı Bakıda görməmişəm.

Hiss edirəm ki, anam həmişə gəldiyi evə, Bakıya gəlmək istəmir. O Qaraqoyunludan, Qaraqoyunlu da ondan ayrılmır.

Bəli, anamla bağlı yuxuları belə görürəm . Yəqin ki, doğulduğu yurddan, evindən-eşiyindən, ulularının uyuduğu qəbristanlıqdan ayrı düşmüşlərin hamısı buna bənzər yuxular görür.

Mən gördüyüm yuxuya nə var ki, görün Qaraqoyunlunun Salah kəndində doğulmuş, hazırda Bakıda yaşayan, bütün eldə-obada yaxşı tanınan, gözəl səsə, qeyri-adi təbə malik olan və qaçqın-köçkün həyatı yaşayan aşıq Pəhləvan necə yuxu görmüşdür.

Aşıq yuxusunda görürür ki, zil qaranlıq gecədir. Şıdırğı yağış yağır, göy guruldayır, şimşək çaxır, arabir ildırım düşür. Dağlar, dərələr bir-birinə qarışıb. Sanki təbiət içində xeyli vaxtdır ki, bir təhər saxladığı qəzəbi, kini-küdürəti, ahvayı, odu-alovu püskürərək üzə çıxarıb, mövcud varlığın hamısını amansızcasına kökündən məhv etməyə, yer üzündən birdəfəlik silməyə çalışır və bizə məlum olmayan günahlardan, pisliklərdən azad olub, yüngülləşmək istəyir.

Sazı da qoltuğuna almış aşıq Pəhləvan Salah kəndinin kənarındakı köhnə qəbristanlığın içindən keçib, hara isə getmək istəyir.

Qəbristanlıqdakı çox qədim, nisbətən köhnə və son dövrlərdə yaranmış qəbrlər pərakəndə halda, sıx bir şəkildə yerləşirlər, Qəbrlərin bir çoxunun üstündə heç bir yazısı olmayan, mamırlamış baş daşları, bəzilərinin üstündə oxunması mümkün olmayan yazıları olan köhnə adi daşlar, bəzilərinin üstündə isə sahiblərinin şəkli həkk olunmuş müasir dəbli daşlar var.

Köhnə qəbrləri tapdalamadan keçmək məqsədilə aşıq qəbrlərin arasında boş yerlər axtarır, çox çətinliklə irəliləyir. Şimşək çaxıb işıq düşdükdə bir neçə addım ata bilir, şimşəyin işığı keçib qaranlıq çökdükdə isə, qarşısını görə bilməyən aşığın hərəkət etməsi çətinləşir.

Şimşəyin, ildırımın, yağışın, göy gurultusunun səsi, üstəlik qaranlıq gecə və qəbristanlığın vahiməsi aşığı qorxudur. Ürəyi döyünür, qaçmaq istəyir, qaça bilmir, bağırıb, haykırıb

insanları köməyə çağırmaq istəyir, bacarmır, nəfəsi kəsilir, ürəyi döş qəfəsindən çıxma həddinə gəlir, səsi çıxmır, gözləri qaralır.

Bir təhər, böyük çətinliklə qəbristanlığın kənarına çıxanda təbiətin yaratdığı o müdhiş aləmə, qorxulu mühitə, dəhşətli səslərə yeni, daha qorxulu, tükürpədici səslər-sədalar, hay-haraylar, çığırtılar-bağırtılar qarışır. Bu, saysız-hesabsız insan kütləsinin ona tərəf ünvanlanıb, göylərə ucalan haqq-ədalət tələbi, yüzlərlə ruhlardan qopub alov kimi puskürərək, ətraflı yandırıb, yaxan söyüş, qarğış, təhqir, məzəmmət, umu-küsü idi.

Aşıq Pəhləvanın qorxusu daha da artır. Çətinliklə də olsa dönərək geri baxır. Onu heyrət bürüyür. Görür ki, bu ildırımlı, şimşəkli, yağışlı, bu müdhiş zülmət gecədə ölülərin hamısı ağ kəfənə bürünmüş, ya qurşaqdan, yaxud da dizdən yuxarı torpaqdan üzə çıxmışlar. Aşığı haraylayan, söyən, təhqir eləyən onlardır. Ölülər torpaqdan aralana bilməsələr də, əllərini yuxarı qaldırıb, bütün bədənləri ilə birlikdə yellədə yellədə söyüşlər söyüb, qarğışlar yağdıra-yağdıra, hara gedirsən, niyə gedirsən, bizi niyə burada qoyursan, bizi kimə tapşırıb gedirsən, nə vaxt qayıdacaqsan deyərək bağırır, çığırır, qeyri adi səslər çıxarır və qorxunc hərəkətlər edirlər.

Onlara cavab verməyə sözü, taqəti və imkanı olmayan aşıq qan tər içində, gecə yarısı yuxudan oyanır.

Əlbəttə ki, bu dəhşətli yuxudan sonra onsuz da dərdi başından aşan aşıq səhər açılana qədər yata bilmir. Belə bir yuxudan sonra kim yata bilərdi ki ?

Əziz Qaraqoyunlu, Borçalı və Göyçə çox maraqlıdır ki, təxminən bu yuxuya oxşar yuxunu oğlum Paşa da görmüş və ilk dəfə mənə danışmışdı.

Bəli, belə yuxular görürürlər sənin qaçqın adlanan övladların, doğma Göyçə, sənin köçkün adlanan balaların, əziz Qaraqoyunlu.

Səhər yuxudan oyanan və gecə gördüyü yuxunun təsirindən hələ də özünə gəlməyən, rəngi saralmış, bənizi qaçmış xəstə hallı aşıq dərdini dağıtmaq üçün qaçqınlar cəmiyyətinə gəlir. Orada xalqımızın tanınımış şairi, istedadlı publisisti, qiymətli ta-

rixi romanlar müəllifi, bütün varlığı ilə doğma Azərbaycana, bütün türk dünyasına bağlı olan Eldar İsmayılla görüşür.

Dərdli dərdlini gendən tanıyar deyib atalar. Qaçqınlıq, köçkünlük ömrü yaşayan, vətən həsrətli, el niskilli şair bu dərdli aşığın pərişan halını ilk baxışdan duyur və səbəbini soruşur. Aşıq gördüyü yuxunu Eldar İsmayıla danışır. Yarım saatdan sonra bu kövrək şairin ürəyindəkilər kövrək misralarla dolu olan aşağıdakı şerə çevrilərək, dodaqlardan qəlblərə süzülür.

Bu gecə kəndimiz yağış içində
Qara örtük altda, naxış içində,,,
Qalmışdın tək-tənha qarğış içində
Ay Allah, sən mənim dərdimə bir bax !

Dözüm fəryad edir, səbir ağlayır,
Hörmət əldən gedib, xətir atlayır,
Ulular uyuyan qəbir ağlayır
Ay Allah, sən mənim dərdimə bir bax !

Ağaclar başını qoyub torpağa,
Bir həsrət şaxtası düşüb yarpağa,
Ölülər kəfəndə qalxıb ayağa
Ay Allah, sən mənim dərdimə bir bax !

Əgər yuxudursa, yuxu nədəndi ?
Dərdin azı itib, çoxu nədəndi ?
Bura Salahdırsa, qorxu nədəndi ?
Ay Allah, sən mənim dərdimə bir bax !

Tutacaq bu ahlar-amanlar məni
Nə günə qoyubdu düşmənlər məni !
Bu qərib ruhlar yamanlar məni,
Ay Allah, sən mənim dərdimə bir bax !

Bu gecə yaş tökdü Qaraqoyunlu,
Dönüb boyun bükdü Qaraqoyunlu,
Sinəmə dağ çəkdi Qaraqoyunlu,
Ay Allah, sən mənim dərdimə bir bax !

Eldara məlhəmdi söz, ey Pəhləvan,
Əlində alışsın saz, ey Pəhləvan,
Bir səs mənə deyir, döz ey Pəhləvan
Ay Allah, sən mənim dərdimə bir bax !

Bəli, Qaraqoyunlunun, Göyçənin, qəriblikdə qalan digər torpaqlarımızın övladları belə dəhşətli yuxular görürlər, ulu Borçalı. Şükürlər olsun ki, sənin evladların belə yuxular görməkdən azaddırlar.

Söhbətimizin bu hissəsinin əvvəlində dedeyim kimi, düz onsəkkiz ildir ki, anam Bakıya gəlmir. Səbəbi nədir, niyə gəlmir axı?

Səbəbini axtarıram. Müxtəlif cür yozuram. Düşünürəm ki, anamın yeri rahatdır. Axı o, Qaraqoyunludadır. Anamın anası da, anasının anası da, çox analar oradadır. Qaraqoyunlu isə bu anaların hamısının anasıdır. Onlar bir-birinə etibarlıdırlar.

Yəqin ki, etibarlı Qaraqoyunlu anamı, öz doğma, öz etibarlı balasını ana nəvazişi ilə, şirin layla çala-çala, əzizləyə-əzizləyə saxlayır və gözünün önündən uzağa, qoynundan, qucağından kənara buraxmaq istəmir. O haqlıdır, düz eləyir. Axı, niyə analar gəlməlidir? Əksinə, doğma torpaqlarımız, həmin torpaqlarda uyuyanlarımız bizim yolumuzu, öz mərd oğullarının və etibarlı, namuslu, qeyrətli, isмətli, abırlı-həyalı qızlarının yolunu gözləyirlər.

Biz isə evladlıq borcumuzu yerinə yetirə bilmədik və hələlik bilmirik. O qədər də qiyməti olmayan, çoxumuzda vətəndən başqa hər şey haqda çox dərin düşünən başımızı götürüb, səni tərk etdik, doğma Qaraqoyunlu, istəkli Göyçə.

Ona görə də niyə buraxmalıdı anamı Qaraqoyunlu, anam niyə gəlməlidi Bakıya ?

Hörmətli oxucu! Bəzi məsələlərin, bir çox hadisələrin mahiyyətini biz çox sonralar başa düşürük. O zaman isə gec, iş işdən keçmiş olur. Axı ov bərəsindən keçdisə, nə qədər atırsan at, nə qədər sərrast ovçu olsan da vura bilməzsən .

Atam və anamla bağlı çoxdan baş vermiş, əslində bəlkə

də ilk baxışdan kiçik görünən, məncə isə mahiyyəti böyük olan bir əhvalat yadımdan çıxmır. Bu əhvalatı nəzərinizə çatdırmağın faydalı olacağını və yerinə düşəcəyini güman edirəm, əziz oxucu.

Yay vaxtı idi. Universitetin birinci kursunu bitirib, kəndə getmişdim. Atam da, anam da sağ idilər. Evimizin qabağında böyük bağımız var idi. Eyvanın düz qarşısında ucalan qoşa qanadlı iri alma ağacı digərlərindən öz görkəminə, yaşına, verdiyi barın miqdarına və keyfiyyətinə görə fərqlənirdi.

O ağacın barı çox olmurdu, ancaq verdiyi almalar indi bazarlarda gördüyümüz, parıltısı göz qamaşdıran, müştərilərə gəlgəl deyən, dadsız-tamsız, rayihəsiz, süni surətdə cilalanmış kimi görünən almalara bənzəmirdi.

Mənim üçün bağımızdakı çoxsaylı meyvə ağaclarının ən qiymətlisi olan bu ağacın almalarının çopur-çopur qabığı, düyünlü, yaralı üzü, xoşa gəlməyən yaşılımtıl göy rəngi var idi. İlk baxışdan heç nə ilə cəlbedici deyildi. Ona görə də, çox zaman ona diqqət vermədən, yanından ötüb digərlərinin yanına gedirdilər.

Bu insanlar yanılırdılar. Alma ağacı bunu yəqin ki, duyurdu, ancaq incimirdi. Çünki, o öz qiymətini yaxşı bilirdi. Onun qiyməti və ondan yaranan təbii gözəllik bizə bəxş etdiyi almaların mahiyyətində, onun daxilində, içində, dadında-tamında idi. Qeyri-adi qoxusu ilə adamı məst eləyirdi, ortasına, tumu olan yerə sanki, beçə balı doldurulmuşdu bu almaların.

Dahi insanlara bənzəyirdi o ağac. Elədiklərini heç zaman üzə vurmayan dahilər öz əməllərilə seçildiyi kimi, bu ağac da öz barı ilə seçilirdi. Özünü gözə soxmurdu, haqqı olsa da qürrələnmirdi bu ağac.

Nə isə! O ağac üçün indi də burnumun ucu göynəyir, əziz oxucular.

Xoş bir hava idi.

Evimizdə həmişə tüfəng olub. Onda da var idi. Gözüm ona sataşdı. Nədənsə, həmin tüfənglə atam və anamın atəş açma qabiliyyətini yoxlamaq fikrinə düşdüm.

Bütün el-obaya, o cümlədən mənə də, atamın tüfənglə davranma bacarığı məlum idi. Çoxları bilirki, atam Hasança

Paşa göydə quşu gözündən vururdu. Buna baxmayaraq atamı bir qədər yaşlı, ağsaqqal vaxtı sınağa çəkmək istəyirdim. Onda onun 65 yaşı var idi. Eşitmişdim ki, anam da vaxtı ilə tüfəngdən yeri gəldikdə istifadə etmişdir. Fikrimdə qəti idim.

Həmin qoşa qanadlı alma ağacının budağından bir kibrit qutusu asdım. Atam və anam evimizin eyvanında oturmuşdular. Onların xəbəri olmadan, gözlənilməz bir halda tüfəngi çıxarıb, yaxşıca sildim, təmizlədim, sonra isə gətirib, onlara verərək, kibrit qutusunu nişan almalarını istədiyimi bildirdim.

Əvvəlcə, anam ancaq analara məxsus olan yalvarışlarla yalvarmağa başladı və bunun haradan, birdən-birə yadıma düşdüyünü soruşdu. Mən isə müxtəlif bəhanalər gətirdim. Əvvəlcə razı olmadılar, amma mənim son beşik olmağın, Bakıdan təzəcə gəlməyim onları yumşaltdı.

Evimizin eyvanından nişan alaraq ikisi də bircə dəfəyə kibrit qutusunu yerə saldılar. Sonra mən atdım. Özü də iki dəfə atdım. Heç birində vura bilmədim.

Bəli, altmış beş yaşlı atam və altmış yaşlı anam o şərti düşməni məhv etdi. Hər yerdə, Göyçədə, Qaraqoyunluda, Zəngibasarda, Vedidə, Masisdə, indi yağı tapdağında qalan Qarabağda atam, anam kimi yüzlərlə atalar, analar, nənələr, babalar var idi.

Onlar ov ovlamağı, quş quşlamağı, at çapmağı, qılınc oynatmağı, vətəni qorumağı bacarırdılar. Onların orta təhsil şəhadətnamələri, ali təhsil sənədləri, elmlər namizədi və ya elmlər doktoru diplomları yox idi. Onlar vətənə, millətə, nəsilə-kökə böyük sevgi, sədaqətə, etibara, bütövlüyə, namusa, qeyrətə bağlı böyük həyat dərsi keçmişdilər.

Ona görə də ana torpağı sevə-sevə saxlayıb, bizə əmanət verə bildilər. Gorları nurla dolsun, hamısının. On doqquz yaşlı, iti gözlü, sağlam bir gənc olan mən o şərti düşməni, kibrit qutusunu vura bilmədim. O atalardan, analardan sonra mənim kimi on minlərlə, yüz minlərlə oğullar yarandı və meydan sulamağa başladı. Bizim vətənimizin getməsinə səbəb bu oldu, o şərti düşməni vura bilməməyimiz oldu, ulu Borçalı, əziz oxucu .

Biz başqa mühitə düşdük, biz başqa cür yetişdirildik, babalarımız tutduğu yoldan fərqli yol keçdik. Yolsuz yolumuz,

məqsədsiz məqsədimiz, yersiz yerimiz, plansız planımız oldu, ulu Göyçə. Qiymətli nəyimiz var idisə dandıq. Dilimizi dandıq, əlifbamızı rədd etdik, dinimizi bəyənmədik, hətta milli mənsubiyyətimizi də qəbul etmədik. Ermənilərin bizə çox haqlı olaraq türk deyə müraciət etməsini özümüzə təhqir hesab etdik. Ermənini qardaş, türkü düşmən bildik. Bir sözlə, əməlli-başlı manqurdlaşdıq, robotlaşdıq, ulu Qaraqoyunlu.

Oxumadan "əlaçı" şağırd, tapşırıqla qırmızı diplomlu ali məktəb məzunu, nəhayət səviyyəsiz "alim" olduq və ali məktəblərdə "səviyyə" elmindən mühazirə lər oxuduq.

Əqidəmizə görə deyil, əqidəsizliyimizə görə, istənilən anda istənilən səmtə yönələ bilən sədaqətdən kənar sədaqətimizə görə, ağlımıza, dünya görüşümüzə görə deyil, başdan, beyindən xeyli aşağıda dayanan, doymaq bilməyən qarnımıza, dolmaq bilməyən cibimizə görə yağlı-yağlı vəzifələr aldıq. Gibimiz və qarnımız üçün işlədik və:

Millət necə tarac olur olsun, nə işim var.
Düşmənlərə möhtac olur olsun, nə işim var.

əqidəsizliyinə qul kimi tabe olduq, qul psixologiyası yaşadıq.

Əlbəttə ki, bir qisim övladların bu yolla getmədi, doğma torpaq.

Ən yaxşı bacardığımız iş ucuz, çirkin alver oldu. Həyətdə, küçədə, səkidə, vağzalda, bazarın həm içində, həm də çölündə alver etdik. Nə desən satdıq, hər şey meyvə, tərəvəz, pal-paltar, yalan, həyət yeri, qəbir yeri satdıq, əzrailə elə dil tökdük, elə and içdik, yazığı elə inandırdıq ki, ən ucuz qiymətə nə qədər deşən ölüm satdıq.

Başımız elə qarışdı ki, nə istəsən bacardıq, ancaq bircə dostumuzu, düşmənimizi tanımaq barədə düşünmədik, şərti düşməni alma budağından asılıb qalmış, yerindən tərpənməyən kibrit qutusunu vurmaq haqda fikirləşmədik.

Ona görə də sizi qoruya bilmədik əziz Göyçə, doğma Qaraqoyunlu.

Ona görə də dünyasını orada dəyişənlərimiz haqlı olaraq bizdən inciyiblər, heç olmasa yuxuda belə, oralardan ayrılıb Bakıya, bizim yanımıza gəlmək istəmirlər. Vəzifə kresloları bir çoxumuzun yaddaşını yaman korlayıb, ağıllı adamlar dəli,

barmağı ilişənlər zəli olublar, ulu Göyçə. Üzdəniraq qazanclarımızdan biri də yalan danışmağa aludəçilik olub.

Atalarımız, analarımız, nənələrimiz, babalarımız yalan danışmağı ən böyük qəbahət sanıblar. Yalançılar dəyərsiz insanlar kimi barmaqla göstəriliblər. Hətta uşaq da danışığına kiçik bir yalan qatdıqda xəcalətdən yanaqları allanıb, dili dolaşıb və yalanı üzə çıxıb. Bəziləri danışdığının yalan olduğunu bilmədiklərinə görə yalan danışıblar. Digərləri iki düşməni dost etmək, insanlar arasındakı pis münasibəti yaxşılaşdırmaq məqsədilə yalan danışıblar.

İndi isə yalan danışmaq adiləşib, yalançılıq bir çoxumuzun peşəsi olub, yalan eşitməkdən qulaqlarımız özünəməxsus xəstəlik tapıb, yalan söz eşidəndə qızarır, yanır, doğru söz gələndə pambıq tıxanır.

Yalan danışanlar yaman çoxalıb. Bir çox qızlar, oğlanlar ağbirçəklər, ağsaqqallar, böyük vəzifə sahibləri heç bir məsuliyyət hiss etmədən, nəticənin necə olacağı haqda düşünmədən yalan danışır.Çünki bir çox hallarda yalan düzə qalıb gəlir. Yalan ayaq açar, amma yeriməz xalq məsələsi öz mahiyyətini itirib. İndi bəzən yalan nəinki yeriyir, hətta elə böyük sürətlə qaçır ki, düz onun arxasınca həsədlə baxa-baxa qalır.

Hərə öz tutduğu vəzifəsinə müvafiq, öz məqsədinə uyğun yalan danışır. Biri bir-neçə dəstə göy satmaq xatirinə, bir başqası vəzifə almaq məqsədilə, digəri mənfəət götürmək üçün yalandan and içərək, inandırmaq üçün yalan danışır. İndi yalanı bilə-bilə, məqsədyönlü danışırlar, utanıb-qızarmadan, heç bir məsuliyyət hissi keçirmədən danışırlar.

Dəhşətli odur ki, indi yalan keçmiş dövrlərdən fərqli olaraq iki-üç adam arasında deyil, mavi ekranlarda, radio dalğalarında, qəzet və jurnal səhifələrində, ağzınadək dolu iclas salonlarında danışılır.

Dəhşət odur ki, deyilən yalanı elə həmin andaca hamı, uşaq da, böyük də, savadlı da, savadsız da, vəzifəli də, vəzifəsizi də çox yaxşı başa düşür, elə ordaca xəlvətə salıb,gizlicə ağız burub, köks ötürür, ancaq reallıqla barışaraq dinmir, danışmır. Zəbt etdiyi vəzifə olduqca kiçik olsa belə mane olur və zavallı, dinə bilmir, tədricən peşəkar məddah,

ikiüzlü, yaltaq və yalançı olur.

Atalarımız, babalarımız bir “mən ölümə” qan düşmənlərini barışdırıblar, dağı dağ üstə qoyublar.

İndi isə ictimai bəlaya çevrilmiş rüşvətsiz bir çoxlarına allahın salamını belə vermək müşkül işə çevrilib. On şirvanlıq maaşı olan vəzifəyə düzəlmək üçün özünü mələk donunda göstərməyə çalışan hərhansı bir məmura ən azı on min dollar verməlisən, hər görəndə isə on dəfə ikiqat dörd büküm olub, baş əyməli və şit bir tərzdə üzünə gülümsəməlisən bu başı boş, cibi dolu vəzifə sahibinin.

Bəli, cılızlaşdıq ulu Qaraqoyunlu, adiləşdik, bayağılaşdıq, ucuzlaşdıq, doğma Göyçə. Ona görə də doğma torpağımızı, müqəddəs qəbirlərimizi qoruya bilmədik. Ona görə də ulularımızın ruhlarını incitdik, onları da özümüz kimi qaçqın, köçkün, xəstə, qərib vəziyyətinə saldıq, məzardan ayağa qalxmağa məcbur etdik.

Ulu Borçalı, ulu Göyçə, ulu Qaraqoyunlu, xeyli vaxtdır ki, dör dümüz də bir masa arxasında əyləşmişik. Sözü mənə veribsiniz Mən danışıram, siz isə böyüklərə xas olan səbrlə, təmkinlə qulaq asırsınız. Hiss etməyəsiniz deyə arabir gözucu üçünüzə də xəlvəti fikir verir, nəzər yetirirəm. Əziz Qaraqoyunlu və Göyçə, hər ikinizin dərin-dərin dərdləriniz hamıya, o cümlədən də mənə çox yaxşı məlumdur. O dərdləri dərənlərin biri də mənəm. Görürəm ki, danışılan söhbətin məzmunundan asılı olaraq hərəniz öz daxili duyğularınızı bir cür biruzə verirsiniz.

Amma, hiss etdim ki, son söhbətlərimiz Borçalıya daha çox təsir etdi, ciddi narahatçılıq keçirdi. Onun üzündə eyni zamanda həm öz həyatına inamsızlıq hissi, həm də gələcəyə ümid qığılcımları gördüm. Borçalı, narahatçılığını biruzə verməmək istəməməsinə baxmayaraq, yenə də yerində rahat otura bilmir, ətrafına boylanır, dərindən köks ötürür, sanki yeri gəlsə, dar ayaqda kimlərin ona kömək edə biləcəyini müəyyənləşdirmək istəyir. Sağına, soluna baxıb, Qaraqoyunlunun, Göyçənin bu gününü gördükdə rəngi saralır, doğma Azərbaycanı, öz igid övladlarını yadına saldıqda isə üzündə gələcəyə bəzi ümid cizgiləri yaranır.

Mən səni, sənin haqlı narahatçılığını qəlbən duyuram və həmin təşvişi mən də keçirirəm. Sənin başın nələr çəkməyib? Bunları sadalamaqla qurtaran deyil, əzizim. Hansını deyim axı ?

Sən ömrün boyu hansı məşəqqətlərə dözməmisən, nələr görməmisən, əziz Borçalı ?

Sovet hakimiyyəti qurulduqdan sonra amansız repressiyaları, günahsız övladlarının Sibirə surgün edilmələrini, qırxıncı illərdə etnik təmizləmələri, türkdilli toponimlərin gürcüləşdirilməsi proseslərini görmüsən. 1947-cu ildə Tiflisdə Azərbaycan Dram Teatrının bağlanmasının, 1949-cu ildə Şah Abbas məscidinin dağıdılmasının şahidi olmusan.

1940-cı illərdə Bolnisi qəsəbəsi yaxınlığında kəndlər salınaraq gürcülərin ora köçürüldüyü yaxşı yadındadır. Azəri türklərinin çoxluq təşkil etdiyi ərazilərdə gürcüləşdirmə prosesinin indi də davam etməsi hamımızın yadındadır. lap bu yaxınlarda, 1987-ci ildə Svanetidə xırda bir təbii fəlakət baş verdi. Elə bil ki, uzun illərdi ki, böyük səbrsizliklə bunu gözləyirdilər. Əllərinə fürsət düşmüşdü. Göydəndüşmə bu fürsəti əllərində bayraq edərək, gürcülərin sayını artırmaq məqsədilə, bilavasitə sənin yerləşdiyin ərazidə tələm-tələsik, ağına-bozuna baxmadan, yeni qəsəbələr saldılar və Svanları həmin qəsəbələrə köçürdülər. Köçürülməni mütəşəkkil keçirmək üçün xüsusi şərait yaradıldığı, qeyri-adi canfəşanlıq göstərildiyi, sənə qarşı müxtəlif yönlü təxribatlar törədildiyi hamımızın yadındadır.

Qaraqoyunlunun, Göyçənin, Vedinin, Sisyanın və digərlərinin başına gələnləri sənin də taleyinə yazmaq istəyirdilər. Bu məqsədlə “Gürcüstan görcülərindir” şüarı ilə silahlandılar və borçalıları öz ana yurdundan çıxarmaq planı hazırladılar. Çox təəssüf ki, onlar öz məkrli niyyətlərinə qismən də olsa nail oldular.

Belə ki, az bir müddətdə Borçalı türklərini Bolnisi, Dmanisi, Kazareti kimi şəhər və qəsəbələrdən çıxartdılar, Saatlı, Muğanlı, Hüseynkənd, Salamməlik, Məhəmmədağalar kimi kəndləri tamamilə boşaltdılar. Şükürlər olsun ki, bu proses başqa bölgələrə sirayət etmədi, bir təhər dözə bildilər, öz yurdlarında qaldılar .

Yenə də varlıların, vəzifəlilərin, imkanlıların, sözü keçənlərin bəziləri üzüdönük çıxdı. Kasıblardan, imkansızlardan fərqli olaraq bir çoxu tələm-tələsik səni tərk edib, Azərbaycana qaçdılar, əziz Borçalı.

Buna görə də yerində sakit otura bilməməyin, haldan-hala düşməyin, narahatçılığın təbiidir, ulu Borçalı.

Narahatçılığa əsas var. Çünki, sənə qarşı təxribatlar yenə də davam eləyir. Sözdə qardaşıq deyirlər, işdə isə ögey münasibət göstərirlər. Məsələn, azərbaycanlıların çoxluq təşkil elədiyi rayonların heç birində icra hakimiyyətinin başçısının azərbaycanlı olmaması, torpaq sahələrinin azərbaycanlılara 5 ilə, gürcülərə isə daha uzun müddətə icarəyə verilməsi, bir çox Azərbaycan məktəblərinin bağlanması, orta məktəbdə Ermənistan tarixi tədris olunduğu halda Azərbaycan tarixinin tədris olunmaması deyilənləri təsdiq eləyir və sənin haqlı narahatçılığına əsas verir, doğma Borçalı.

Amma fikir eləmə, indi xalqımız tam yuxulu vəziyyətindən heç olmasa yarı yuxulu vəziyyətə keçib, demək olar ki. az da olsa oyanıb. Dar ayaqda sənə kömək etmək ehtimalı var. Ona görə də Azərbaycandan ola biləcək köməklə bağlı üzündə yaranan gələcəyə ümid qığılcımları da əsassız deyildir, ulu Borçalı.

Hörmətli oxucu! Qaraqoyunlu Dövlətinin yaranması və süqutu, həmçinin Göyçə və Qaraqoyunlunun coğrafi mövqeyi, onlardan qaçqın düşənlərin bəzi spesifik xüsusiyyətləri haqda söhbətimiz axarını, istiqamətini dəyişdi, maraqlı söhbətimizi daşa da maraqlı və şirin etdi. İndi qarşıya qoyduğumuz məqsədin süjetinə riayət etməyə çalışaq.

Müsibətlərimiz sonrakı dövrlərdə də davam etdi.

Böyük Oktyabr Sosialist inqilabı adlanan bədnam inqilabdan sonra qeyri-qanuni yolla doğulmuş Sovetlər Birliyi dövründə xalqımız daha böyük məşəqqətlərlə üzləşdi.

Birdən-birə öz babamızı unudub, özümüzə baba hesab etdiyimiz Lenin, Stalin siyasəti nəticəsində 1918-1920-ci illərdə soyqırıma, 1930-1938-ci illərdə repressiyaya, 1948-1953-cü illərdə isə deportasiyaya məruz qaldıq, görünməz fəlakətlərə düçar olduq. Fikir verin, 1914-cü ildə İrəvan quberniya-

sında 238 min Azərbaycan Türkü yaşadığı halda, erməni-rus siyasəti nəticəsində bu böyük rəqəm azalaraq, 1922-ci ildə 73 minə enmişdir. Bu Ermənistanda Azərbaycanlılara muxtariyyət verilməsi ehtimalına son qoymaq demək idi.

Ermənilər isə əksinə, xaricdən gələn ermənilər hesabına həm Ermənistanda, həm Dağlıq Qarabağda, hətta Azərbaycanın digər rayonlarında ermənilərin sayını artırdılar .

Ona görə də 1923-cü ildə 157 min əhali olan Dağlıq Qarabağda Muxtar Vilayət statusu ildə etdilər. 1918-ci ildə sahəsi 9,8 min kvadrat kilometr olan Erməni vilayəti yaradılmış, ikicə ildən sonra, yəni 1920-ci ildə həmin ərazi üç dəfə böyüdülərək, 29,8 min kv. kmə çatdırılmışdır. Bu artım Azərbaycanın ərazisi hesabına baş vermişdir. Bu siyasət sonrakı illərdə müxtəlif yollarla davam etdirilmişdir.

Hansı ildə Azərbaycanın hansı ərazisinin ermənilərə verilməsi cədvəlinə diqqətlə baxın, əziz oxucular.

**Ermənistana verilən ərazilər**

| **Ərazinin verildiyi il** | **V e r i l ə n  ə r a z i** |
|---|---|
| 1920 | Yeni Bayazid qəzasının Basarkeçər mahalı |
| 1920 | İrəvan qəzasının Vedibasar mahalı |
| 1920 | Gəncə quberniyasının Zəngəzur qəzası |
| 1920 | Qazax qəzasının cənubu, o cümlədən Qaraqoyunlu. |
| 1922 | Göyçə, Dilican əraziləri |
| 1923 | Naxçıvanın 9 kəndi |
| 1929 | Qazağın 5 min hektar sahəsi |
| 1929 | Cəbrayıl qəzasının Nüvədi, Ernəziz, Tuğud kəndləri |
| 1969 | Tovuz rayonu ərazisinin 760 hektarlıq sahəsi |
| 1984 | Qazax ərazisindən bir hissə |

Zəngəzurun verilməsi Naxçıvanı Azərbaycanın digər bölgələrindən ayırmaq məqsədi güdürdü. Bunun nəticəsində Ermənistan İranla həmsərhəd oldu və bu imkandan məharət-

lə istifadə etdi, halhazırda da bundan yüksək səviyyədə bəhrələnmədədir. Hörmətli oxucuların nəzərinə çatdırım ki, 1929-cu ildə verilmiş torpaqların Ermənistanın tabeliyinə keçməsi qanuni qüvvəyə minməmişdi, qanuniləşməmişdi.

Qeyri-qanuni olaraq Ermənistanın xeyrinə, bizim isə ziyanımıza olan bu məsələ, ata-baba torpaqlarımızın ermənilərə verilməsi düz 40 il sonra, 1969-cu ilin may ayının 7-də Azərbaycan Respublikasının konstitusiyasına uyğunlaşdırılaraq, qanuni qüvvəyə mindirldi.

1968-ci ilin 26 noyabrında Azərbaycan Kommunist Partiyasının Mərkəzi Komitəsinin bürosunda 40 il əvvəl verilən torpaqla bağlı məsələ müzakirə edildi və Ali Sovetin Rəyasət heyəti 1969-cu ilin may ayının 7- də xüsusi fərman verərək, həmin torpaqların Ermənistana verilməsini qanuniləşdirdi. Yuxarıdan, Moskvadan təzyiqlər olmasına baxmayaraq, yəqin ki,bunu etməmək də olardı.

İndi səsimizi qaldırıb, həmin torpaqların bizim olduğunu deməyə haqqımız olsa da, öz verdiyimiz sənədə görə hüququmuz, imkanımız yoxdur. Çünki,özümüz öz əlimizlə, öz imzamızla, öz razığımızla, guya ki, qanuna müvafiq olaraq vermişik. Həmin sənəd təsdiq edilməsəydi, indi həmin torpaqlara iddiali olmağa daha böyük, daha kəskin əsasımız olardı.

Bəli, həmişə olduğu kimi, bu məsələdə də özümüz öz işləməyən başımız, görməyən gözümüzlə öz yolumuzu bağlamışıq. Azərbaycan torpaqları hesabına öz ərazilərini mütəmadi olaraq genişləndirmək siyasəti yeridən ermənilər, eyni zamanda ermənilərin sayını artırmaq və deportasiya hesabına Azərbaycan türklərinin sayını və xüsusi çəkisini azaltmağa çalışıblar.

Bu siyasətin nəticəsində Ermənistanın 37 şəhər və rayonunda yaşayan Azərbaycan türklərinin sayı və xüsusi çəkisi ictimai - siyasi vəziyyətdən asılı olaraq tədricən azalmışdır.

A.P.Manvelyan və Q.M.Martirosyanın müəllifliyi ilə Ermənistan statistika idarəsi tərəfindən Ermənistandakı yaşayış məntəqələri və əhali haqda məcmuə tərtib edilərək,1962-ci ildə nəsr edilmişdir.

Məcmuədəki rəqəmlərin Azərbaycan türklərinin ziyanına dəyişdirildiyinə baxmayaraq, həmin məcmuədəki bəzi

məlumatları oxucuların nəzərinə çatdırmağı faydalı hesab edirəm. Ermənilərin özlərinin verdiyi məlumatlara görə, XIX əsrin əvvəllərində, məsələn 1831-ci ildə türklərin ən çox yaşadığı bölgə irəvan şəhəri olmuşdur. O zaman orada 16 min Azərbaycan türkü yaşamışdır ki, bu da ümumi əhalinin 85,2%-ini təşkil eləyirdi. Təsəvvür edirsinizmi ki, o zamanlar İrəvanda yaşayan hər yüz nəfərdən 85-indən çoxu bizimkilər olmuşdur.

Həmin məcmuədə göstərilir ki, Azərbaycan türklərinin ən çox məskunlaşdığı ikinci yaşayış məntəqəsi Eçmiadzin olmuşdur. Orada əhalinin 42,3%-i Azərbaycan türklərindən ibarət idi. 1831-ci ildə Göyçənin Basarkeçər və Çəmbərək rayonlarında erməni yaşamamış, bölgədə 100% Azərbaycan türkləri məskunlaşmışdır. Həmin ilə aid məlumata görə Azərbaycan türklərinin xüsusi çəkisi Ağbabada (Amasiyada) 87,8%-ə, Vedidə 77,3%-ə bərabər olmuşdur.

Sovet ittifaqı dövründə bu göstəricilərin hamısı Azərbaycanın ziyanına olaraq dəyişmişdir, əziz oxucular.

Bizim üçün haqsız olaraq vətən müharibəsi adlanan ikinci Dünya müharibəsindən sonra, 1948-1953-cü illərdə Ermənistandan Azərbaycana 144700 Azərbaycanlı köçürülmüşdür. Azərbaycanda isə onların qəbuluna lazımi diqqət yetirilməmiş, soyuq iqlimə malik dağlıq şəraitdən köçürülən ermənistanlılara ən isti bölgələrdə məskunlaşmağa icazə verilmişdir. Buna görə də soydaşlarımızın böyük bir hissəsi uyğun gəlməyən təbii şəraitə dözməyərək, müharibəsiz, davasız, vuruşsuz qırılmış və yaxud sağalmaz xəstəliklərə düçar olmuşlar.

Ermənilər Ermənistanda müxtəlif vəzifələrdə çalışan Azərbaycan türklərini müxtəlif bəhanələrlə vəzifələrindən azad eləyir, ali məktəbləri bitirib öz kəndinə qayıdanları isə işlə təmin etmir, onlara qəsdən şərait yaratmır, beləliklə də onların Ermənistandan çıxmasına, Azərbaycanda və yaxud digər respublikalarda məskunlaşmasına səbəb olurdular.

Gənc ali təhsillilərdən böyük əksəriyyəti Azərbaycanda da iş tapa bilmirdilər. Əvvəla, ona görə ki, Bakı kimi böyük bir şəhərdə pasport qeydiyyatına alınma müşkül məsələ idi və bununla demək olar ki, hər yerdə ermənilər məşğul olur-

dular, mənzil istismar sahələrinin demək olar ki, hamısında ermənilər işləyirdi. Ümumiyyətlə Azərbaycanda işlər Ermənistandan tam fərqli formada cərəyan edirdi.

Ermənistandan fərqli olaraq Azərbaycanın dövlət idarələrində də müxtəlif əməliyyatlar, yazışmalar, iclaslar, müxtəlif tədbirlər mütləq rus dilində aparılırdı. Rusca bilməyənlər və yaxud zəif bilənlər məsuliyyət tələb eləyən işə götürülmürdülər. Ona görə də, dövlət idarələrində işləyənlərin çox böyük əksəriyyəti ermənilər və digər millətlərin nümayəndələri idilər.

Nisbətən yüksək vəzifələrdə çalışmalı olan azərbaycanlılar isə, yazılmamış qanuna əsasən, mütləq qarışıq irqdən ibarət olmalı idi. Əlbəttə ki, belələri, adətən, milli hissdən, milli duyğudan, milli təəssübkeşlikdən uzaq olan insanlar idi. Elə bir vəzifəli məmur yox idi ki, onun katibəsi və sürücüsü erməni olmasın.

Deməli, müxtəlif formalı səbəblər üzündən Ermənistanda Azərbaycan türklərinin sayı, xüsusi çəkisi, azərbaycanlıların məskunlaşmış olduğu qədim yaşayış məntəqələrinin, kəndlərin sayı ilbəil azalırdı.

Məsələn, Erməni müəlliflərinin verdikləri məlumatlara görə Ermənistanda Azərbaycan türklərinin sayı, xüsusi çəkisi və azərbaycanlıların məskunlaşdığı kəndlərin sayı nə qədər azaldısa da aşağıdakı cədvəldə göstərilənə uyğun olmuşdur.

| **İllər** | **Azərbaycanlıların sayı** | **Azərbaycanlıların xüsusi çəkisi** | **kəndlərin sayı** |
|---|---|---|---|
| 1831 | 51600 | 32 | 295 |
| 1873 | 132000 | 26,6 | 422 |
| 1886 | 1786000 | 28,1 | 457 |
| 1914 | 237700 | 23,4 | 484 |
| 1922 | 73000 | 9,3 | 316 |
| 1931 | 110000 | 10,5 | 291 |
| 1959 | 100000 | 5,7 | 213 |
| 1970 | 148000 | 4,9 | - |

Cədvəldən göründüyü kimi, 1914-cü ildə Ermənistanın 484 kəndində 237700 Azərbaycan türkləri yaşayırdısa, 1922-ci ildə Azərbaycanda və Ermənistanda kommunist rejimi qurulduğunun ilk illərində, bu rəqəmlər azalaraq 316-ya və 73000-ə enmişdir. Halbuki təbii artım hesabına 1914-cü ilə aid rəqəmlərə nisbətən 1922-ci ildəki rəqəmlər daha artıq olmalı idi. Növbəti cədvəldə ermənistanın bəzi şəhər və rayonlarında Azərbaycan türklərinin sayı, xüsusi çəkisi, Göyçə və Qaraqoyunluda isə həmin göstəricilərlə yanaşı həm də kəndlərin sayı verilmişdir.

## Ermənistanın bəzi şəhər və rayonlarında Azərbaycan türklərinin sayı.

| Şəhər və rayonun adı | 1831 | 1873 | 1886 | 1914 | 1922 | 1931 | 1959 |
|---|---|---|---|---|---|---|---|
| Basarke-çər | 4111 | 11459 | 1636 | 24568 | 11406 | 16165 | 15847 |
| Çəmbə rək | 1442 | 3131 | 4602 | 7629 | 6322 | 8250 | 10044 |
| Amasiya (Ağbaba) | 3027 | 7231 | 7138 | 13199 | 6252 | 7572 | 9560 |
| İrəvan | 15992 | 8690 | 2367 | 10642 | 4660 | 4629 | 7617 |
| Qafan | 1702 | 3863 | 7213 | 7094 | 3761 | 5141 | 7042 |
| Eçmiad-zin | 4880 | 1969 | 1707 | 18376 | 3877 | 1793 | 6801 |
| Sisyan | 1168 | 1419 | 7297 | 107362 | 2689 | 14836 | 6204 |
| Vedi (Ararat) | 3349 | 1556 | 1860 | 4083 | 9379 | 11226 | 6810 |
| Axta (Hrazdan) | 1375 | 2487 | 3375 | 7168 | 1024 | 1670 | 1539 |
| Artaşat (Qəmərli) | 3604 | 7919 | 8549 | 1494 | 2694 | 3637 | 911 |

## Ermənistanın bəzi şəhər və rayonlarında Azərbaycan türklərinin xüsksi çəkisi,%-lə

| Şəhər və yarayo - nun adı | 1831 | 1873 | 1886 | 1914 | 1922 | 1931 | 1959 |
|---|---|---|---|---|---|---|---|
| Basarke-çər | 100 | 78,5 | 82,8 | 74,7 | 64 | 55,2 | 43,9 |
| Çəmbərək | 100 | 50 | 54,9 | 53.8 | 40,7 | 42,6 | 41,6 |
| Amasiya | 87,8 | 88,6 | 80,9 | 79,4 | 86,4 | 57,7 | 72,7 |
| Sisyan | 36,4 | 30,6 | 34,6 | 28,9 | 12,5 | 18,2 | 20,8 |
| Vedi | 77,3 | 75,4 | 73,6 | 69,4 | 70,4 | 56,7 | 17,7 |
| Qafan | 47,1 | 35,8 | 36,3 | 34,3 | 17,7 | 19,4 | 14,8 |
| Yexeqnad-zor | 35,9 | 50,1 | 50,4 | 47,8 | 18,5 | 17,0 | 12,3 |
| Eçmiad-zin | 42,3 | 62,4 | 53,7 | 44,9 | 13,8 | 37,6 | 10,8 |
| Axta | 25,7 | 15,6 | 15,5 | 20.0 | 3,5 | 4,7 | 4,4 |
| İrəvan | 85,2 | 36,2 | 86.7 | 23 | 8 | 4,4 | 1,5 |

**Göyçə və Qaraqoyunluda Azərbaycanlıraraın sayı, xüsusi çəkisi və kəndlərin sayı**

| Rayon | İl | Azərbaycan lıların sayı | Xüsusi çəkisi,%-lə | Kəndlərin sayı |
|---|---|---|---|---|
| Basarkeçər | 1831 | 4111 | 100 | 21 |
| | 1873 | 11459 | 78,5 | 29 |
| | 1886 | 16386 | 82,8 | 30 |
| | 1914 | 24568 | 74,7 | 30 |
| | 1922 | 11406 | 64 | 28 |
| | 1931 | 16165 | 55,2 | 27 |
| | 1959 | 15847 | 43,9 | 26 |
| Krasnoselo | 1831 | 1442 | 100 | 7 |
| | 1873 | 3131 | 50 | 5 |
| | 1886 | 4602 | 54,9 | 5 |
| | 1914 | 7629 | 53,8 | 8 |
| | 1922 | 6322 | 40.7 | 11 |
| | 1931 | 8250 | 42,6 | 11 |
| | 1959 | 10044 | 41,6 | 15 |
| İcevan | 1831 | - | - | - |
| | 1873 | 478 | 4,9 | 2 |
| | 1886 | 655 | 4,9 | 2 |
| | 1914 | 620 | 2,4 | 4 |
| | 1922 | 1138 | 5,9 | 7 |
| | 1931 | 4281 | 8,5 | 8 |
| | 1959 | 2385 | 7,3 | 8 |

Növbəti cədvəllərdə yenə də erməni müəlliflərinin verdikləri məlumatlara görə Göyçənin Krasnoselo və Basarkeçər rayonlarının və Qaraqoyunlunun Azərbaycan türkləri yaşayan kəndlərində əhalinin sayı göstərilmişdir.

Bəzi illərdə bəzi kəndlər haqda məlumatın olmaması, həmin kəndlərin mövcud olmaması demək deyil. Bu, sadəcə olaraq, həmin illərdə siyahıyaalmanın olmaması və yaxud, arxiv sənədlərinin müxtəlif səbəblər üzündən itməsi ilə əlaqədar ola bilər. Bəzi kəndlər haqda məlumatların qəsdən verilməməsi, kənd lərdə yaşayan əhalinin sayının bilərəkdən azaldılması da mümkündür.

Bu deyilənlərə baxmayaraq arxiv sənədlərinə əsasən tərtib olunmuş aşağıdakı cədvəldəki tarixi məlumatların maraq doğuracağını güman edirəm.

**1831-1959-cu illərdə Qaraqoyunlu və Göyçənin kəndlərində əhalinin sayı**

| Sıra №-si | Kəndin adı | 1831 | 1873 | 1886 | 1914 | 1922 | 1931 | 1959 |
|---|---|---|---|---|---|---|---|---|
| 1 | Vurğun | - | 188 | 265 | -- | 306 | 431 | 710 |
| 2 | Alaçıqqaya | -- | -- | -- | 116 | 97 | 119 | 183 |
| 3 | Polad | -- | 290 | 390 | 347 | 302 | 460 | 546 |
| 4 | Salah | -- | -- | -- | 64 | 80 | 112 | 414 |
| 5 | Göyərçin | -- | -- | -- | 93 | 143 | 205 | 106 |
| 6 | Ağkilsə | -- | -- | -- | -- | 124 | 166 | 217 |
| 7 | Murteyil (Çiçək bulaq) | -- | -- | -- | -- | 86 | 161 | 127 |
| 8 | Qaraqaya | -- | -- | -- | 265 | 170 | 205 | 376 |
| 9 | Yanıqpəyə | -- | -- | -- | -- | 150 | 197 | 383 |
| 10 | Çaykənd | -- | -- | -- | 677 | 569 | 672 | 809 |
| 11 | Bəryabad | -- | -- | -- | -- | 85 | 109 | 216 |
| 12 | Əmirxeyir | -- | -- | -- | -- | 132 | 250 | 348 |
| 13 | Gölkənd | 357 | 1567 | 2157 | 1866 | 1015 | 1283 | 1123 |
| 14 | Cıvıxlı | -- | -- | -- | -- | 137 | 132 | 290 |
| 15 | Qaratorpaq | -- | -- | -- | -- | 46 | 44 | 179 |

| Sı--ra №-si | Kəndin adı | 1831 | 1873 | 1886 | 1914 | 1922 | 1931 | 1959 |
|---|---|---|---|---|---|---|---|---|
| 1 | Toxluca | 296 | 466 | 681 | 1373 | 1176 | 1723 | 1572 |
| 2 | Ağbulaq | 136 | 422 | 575 | 1134 | 1053 | 1392 | 1154 |
| 3 | Cil | 265 | 287 | 587 | 1035 | 697 | 1041 | 1182 |
| 4 | Ardanış | 119 | 389 | 602 | 1209 | 1138 | 1246 | 1417 |
| 5 | Şorca | 140 | -- | -- | -- | -- | -- | 733 |
| 6 | Ağkilsə | -- | 263 | 321 | 515 | 198 | 307 | 273 |
| 7 | Babacan | -- | 107 | 173 | 265 | 309 | 373 | 615 |
| 8 | Daşkənd | 357 | 560 | 816 | 1389 | 899 | 1330 | 930 |
| 9 | Zod | 245 | 905 | 1088 | 1988 | 1054 | 1599 | 1294 |
| 10 | Qaraiman | 207 | 418 | 569 | 743 | 478 | 1652 | 564 |
| 11 | Zərzibil | 211 | 462 | 653 | 841 | 581 | 808 | 808 |
| 12 | İnəkdağı | -- | 317 | 469 | 674 | 297 | 383 | 445 |
| 13 | Böyük Qaraqoyun | 379 | 408 | 591 | 655 | 392 | 488 | 762 |
| 14 | Qomabu- | 117 | 316 | 419 | 672 | 337 | 478 | 663 |
| | laq-1 | -- | 183 | 255 | 377 | 166 | 224 | 430 |
| 15 | Kərkibaş | | | | | | | |
| 16 | Kiçik Məzrə | 227 | 675 | 978 | 1373 | 359 | 912 | 1110 |
| 17 | Böyük | 293 | 956 | 1379 | 1970 | 1133 | -- | -- |
| | Məzrə | 212 | 770 | 1020 | 1653 | 942 | 1638 | -- |
| 18 | Qızılbulaq | 251 | 592 | 905 | 1088 | 461 | 863 | 1434 |
| 19 | Şişqaya | | | | | | | |
| 20 | Yuxarı Şorca | 75 | 123 | 158 | 283 | 204 | 295 | 401 |
| 21 | Aşağı | 164 | 411 | 524 | 910 | 394 | 617 | 660 |
| | Şorca | 121 | 398 | 465 | 815 | 440 | 831 | -- |
| 22 | Yarpızlı | | | | | | | |
| 23 | Pəmbək Quşçu | -- | 166 | 237 | 392 | 390 | 512 | 713 |

## 10. 1941-1945-ci il müharibəsi və Qaraqoyunlu.

Sovet imperiyası tərkibinə daxil olan bütün xalqlar, o cümlədən Qərbi Azərbaycan elləri kimi, qaraqoyunlular 1941-ci ildə başlayıb, 1945-ci ildə başa çatan və Böyük Vətən Müharibəsi adlanan müharibəyə əli silah tuta bilən oğulların demək olar ki, hamısını göndərmişdi.

Mənim anlamıma, mənim təfəkkürümə, əqidəmə, fərdi analitik baxışıma görə sosializm quruluşunu, kommunizm xo-

funu və dinsizlik əqidəsi üzərində qeyri-qanuni doğulmuş qırmızı imperiyanı dünya xəritəsindən silmək məqsədi güdən, əhatə dairəsinin genişliyinə və dağıdıcılıq qüvvəsinə görə misli-bərabəri olmayan bu dəhşətli müharibənin, bu böyük savaşın bizim və digər türk xalqlarının da müqəddəs vətən müharibəsi adlandırılması o qədər də yerinə düşmür və şübhə doğurur.

Bir çoxlarının, əsasən də uzun sürən dəhşətli müharibənin məşəqqətlərini yaşayanların, onun ağılasığmaz ağırlıqlarını çiyinlərində daşıyanların, ölüm adlanan qara kabusla dəfələrlə üz-üzə dayanmışların, hal-hazırda çox cüzi bir qismi sağ qalmış, hər cür hörmət və diqqətə layiq olan müharibə iştirakçılarının, onlarla birlikdə, yaşlı nəslin bir çox nümayəndələrinin mənim bu fikrimə, bu kəskin və fərqli qiymətə etiraz edəcəklərini bunun üçün hansı arqumentlərə istinad edəcəklərini, qarşıya hansı dəlillər qoyacaqlarını bəribaşdan bilir, başa düşür və yetərikcə qiymətləndirirəm.

Amma, onu da bildirmək istəyirəm ki, həmin arqumentlərə, sübutlara və suallara qarşı mənim də tutarlı cavablarım vardır. Alman, rus və türk xalqlarının dünya tarixində yerləri, bir-birlərinə münasibətdə tutduqları mövqelərini mən də müəyyən qədər bilir,təhlil eləyir müvafiq nəticə çıxarıram. Hərtərəfli analiz nəticəsində belə bir köklü sualla üzbəüz qalıram: kim, ruslar, yoxsa almanlar qalib gəlsə türk xalqları üçün xeyirli olardı?

Nə isə...

Tarix öz sözünü dedi. 1945-ci ilin may ayının 9-da Sovet İttifaqının Almaniya üzərində qələbəsi rəsmi olaraq elan edildi. Müharibə başa çatdı.

Amma, zəhmət olmasa, siz deyin görək, kim qalib gəldi?

50 milyona qədər əskər itirmiş, ərazisinin ən inkişaf etmiş hissəsinin şəhər və kəndləri yerlə yeksan edilmiş Sovetlər Birliyi, yoxsa üç milyon əskər itirmiş Almaniya?

Kim məğlub oldu? Müharibədən bir müddət sonra parçalanaraq, tarixin səhifələrindən silinən Sovet Sosialist Respublikaları İttifaqı (SSRİ) məğlub oldu, yoxsa əvvəlcə parçalanıb, sonra daha sıx birləşən Almaniya?

Hansı quruluş məğlub oldu? Sosializm quruluşu, yoxsa Lenin nəzəriyyəsinə görə ölümə məhkum olan kapitalizm quruluşu?

Hansı partiya məğlub oldu? Bəşərin vicdanı, eşqi, ürəyi; zehni, düşüncəsi, fikri, diləyi; bütün yer üzünün xoş gələcəyi; hər zövqü səfası olduğu bəyan edilib, daim təriflənən, bu günün, sabahın, əbədiyyətin ən böyük mənası; neçə min nəğməli, neçə min səsli həyat sinfoniyası; hər sadə, mürəkkəb cümləmizin əzəl mübtədası; böyük ilhamçısı şerin-sənətin; bir bayraq altında yüz min millətin qardaşlıq dünyası kimi qələmə verilən, beyinlərə yeridilən, lakin, bircə anın içində isə pərəstişkarları tərəfindən tüpürülərək atılan Kommunist Partiyası, Lenin-Stalin partiyası məğlub oldu, yoxsa Fürerin partiyası ?

Hər dəfə vəzifəyə seçiləndə liderlərin diz çöküb öpdükləri, qarşısında tutuquşu kimi ötərək, and içdikləri, sonra isə murdar əski parçası kimi təpikləyib atdıqları qırmızı rəngli, oraq-çəkic nişanlı, beşguşəli ulduzlu SSRİ bayrağı uduzdu, yoxsa Almaniyanın bayrağı ?

Kim uduzdu? Almaniya üzərindəki tarixi qələbənin tək və təkzibolunmaz səbəbkarı kimi qələmə verilən, şəxsiyyətinə ağılasığmaz formada pərəstiş olunan, atamız-babamız, əvəzolunmaz rəhbərimiz adlandırılan, bizi yorulmadan, dinclik və rahatlıq bilmədən, gecə-gündüz kommunizmin işıqlı gələcəyinə aparan Stalin uduzdu, yoxsa Hitler? İyrənc bir xəstəliyə tutulub, iyrənc bir xarici görkəm, ürək bulandırıcı bir sir-sifət alaraq, əzab-əziyyət içərisində dünyasını dəyişən, lakin yarandığı torpağa qovuşmağa belə qisməti olmayan və layiq görülməyən, dahi rəhbər V.İ.Leninin ən böyük şagirdi və silahdaşı, dahi davamçısı olan, əvvəl onun yanında dəfn olunan, az sonra isə lənətlər yağışı altında süpürülüb atılan İ.V.Stalin uduzdu, yoxsa elədiyi əməllərinin nəticələrini dərindən dərk eləyərək, sevdiyi qadınla birlikdə ölümü qəbul eləyib, dünyasını dəyişən, dəfn olunduğu yeri də məlum olmayan Adolf Hitler ?

Bilmirəm ruslar tərəfindən əsrlər boyu dəfələrlə parçalanmaya məruz qalaraq kiçilən, zəifləyən, zaman-zaman tor-

paqları yadlara hədiyyə kimi paylanan Azərbaycan məğlub oldu, yoxsa Rusiya qalib gəldi ?

Nə deyim, hörmətli Qaraqoyunlu, suallar çox, hər bir suala veriləcək cavablar isə daha çox və müxtəlif.

Hörmətli oxucular, siz bu kitabda böyük fateh Əmir Teymur haqda yazılmış bəzi maraqlı məlumatları oxumuş və bu böyük türkə münasibətdə müvafiq nəticəyə gəlmişsiniz. 1941-1945-ci il müharibəsi və bu dahi Fatehlə bağlı olduqca qeyri-adi və maraqlı bir hadisəni də nəzərinizə çatdırmağın yerinə düşəcəyini güman edirəm.

Yəqin təəccüblənəcəksiniz ki, müharibə başladığı ildən 536- il əvvəl, 1405-ci ildə dünyasını dəyişmiş Topal Teymurun bu müharibə ilə nə əlaqəsi ola bilər ?

Mən sizi yaxşı başa düşürəm, istəkli oxucular. Belə fikirləşməyə, bu əlaqəyə şübhə ilə yanaşmağa haqqınız var.

Amma, onu da unutmaq lazım deyil ki, doğmayan, doğulmayan, forması, rəngi, quruluşu, bənzəri məlum olmayan, ancaq bütün yaradılmışların yaradıcısı, qurulmuşları qurucusu, sonsuz böyük və mürəkkəb kainatın idarəedicisi olan ulu Tanrı üçün zaman və məkan anlayışı ola bilərmi ?

Nəzərinizə çatdırmaq istədiyim bu maraqlı, düşündürücü və qeyri-adi hadisə hansısa bir yoldan ötənin söylədiyindən, yaxud da mənbəyi çox-çox qədimlərə, əlyetməz-ünçatmaz uzaqlara söykənən nağıllardan deyil, birbaşa bu gündən, 2004-cü ilin yanvar ayında Rusiya televiziyasının mavi ekrana çıxardaraq bütün dünyaya yaydığı verilişdən, olduqca maraqlı bir sənədli televiziya filmindən götürülmüşdür.

Bu hadisənin açıqlanması qadağan olunmuş, indiyədək gizli saxlanılmış və onun barəsində heç bir məlumat verilməmişdir.

Hadisəni mənimsəyib, qiymətləndirərək, ulu Tanrının qüdrətinə şükürlər diləyin, ulu babamızın ilahi dərgahındakı ruhuna isə dualar oxuyun, istəkli oxucular.

Müharibədən bir neçə ay əvvəl,1941-ci ildə Teymurilər dövrünü ətraflı tədqiq etmək, Fatehin, oğlanlarının və nəvələrinin Səmərqənddə, hamının tanıdığı məlum məzarda dəfn olunub-olunmamasını dəqiqləşdirmək, Teymurilər dövrünə

aid böyük, zəngin bir muzey yaratmaq məqsədilə İ.V.Stalin xüsusi göstəriş, ciddi bir tapşırıq verir.Həmin tapşırığa əsasən dərhal adlı-sanlı dövlət və elm adamlarından ibarət geniş tərkibli bir komissiya, böyük bir işçı qrupu yaradılır, iş planı hazırlanır.

Həmin plana görə işçi qrupunun üzvlərinin bilavasitə iştirakı ilə qəbrlər açılmalı, qalıqlar Moskvaya aparılıb, Elmlər Akademiyasına təhvil verilməli və ciddi tədqiqatlara əsaslanaraq, qalıqların Əmir Teymura, onun oğullarına və nəvələrinə aid olub-olmaması, beləliklə də həmin məzarların onlarınkı olub-olmaması müəyyənləşməli idi.

Bu məsələyə dünyanın bəzi aparıcı ölkələrinin alimləri də böyük maraq göstərirdilər.

1941-ci ilin iyun ayının 2-də səhər saat 8-dən işə başlayan qrup əvvəlcə Fatehin oğlanları Şahruh və Miranşahın qəbrini rahat bir şəraitdə, səliqə və səhmanla açır, şəklini çəkir, qalıqları toplayaraq, komissiyaya təhvil verirlər. İşin gedişi, bütölüklə bütün proses sonralar SSRİ xalq artisti fəxri adına layiq görülmüş kinorepartyor və kinorejissor Malik Kayumov (Qəyyumov) tərfindən lentə alınır və indiyədək gizli saxlanılır. 2004-cü ilin yanvarında iki dəfə göstərilən həmin verilişdə də hadisələri Malik Kayumov özü şərh edirdi və vaxtı ilə özü lentə aldıqlarını göstərirdi.

Qəbrlər açılandan sonra məlum olur ki, Teymurun oğlu Şahruhun cəsədi dağılmağa daha çox məruz qalıb.

Hamıya məlumdur ki, Əmir Teymurun nəvəsi olan dünyanın ən böyük astronomlarından biri hesab olunan, Səmərqənddə rəsədxana tikdirərək ulduzları öyrənən və buna görə də guya dinə uyğun olmayan işlə məşğul olduğuna görə başı kəsilən və kəsik başla dəfn olunan Uluqbəyin qəbrinin açılması və üzərində iş aparılması daha çox, iki həftə çəkir. Uluqbəyin skeletinin daha yaxşı qaldığı göstərilir.

Gözlənilməz hadisələr səhərisi gün, Əmir Teymurun məzarının açıldığı dəqiqələrdə baş verir. Moskva Televiziyasının verilişində həmin işçi qrupuna daxil olan operator öz gözü ilə gördüyü, bilavasitə iştirakçısı olduğu hadisəni belə təsvir eləyir, istəkli oxucular.

Teymurun məzarının açılması vaxtı çatdıqda, işçi qrupu məzarın açılması prosesinə başladığı zaman onların yanına üç nəfər nurani, ağsaqqal kişi yaxınlaşıb, müsəlman qaydasına müvafiq incə bir tərzdə, ədəb-ərkan qaydalarına uyğun salam verir. Hamının diqqəti onlara yönəlir. Kimliklərini bildirməyən, özlərini təqdim etməyən bu nur cöhrəli insanlardan biri əlində tutduğu, ilk baxışdan qədimiliyi və müqəddəsliyi duyulan qalın bir kitabı göstərərək:

-Bu kitabda yazılıb ki, Əmir Teymurun məzarını açmaq olmaz. Məzar açılsa ölkədə fəlakət baş verəcəkdir, deyir.

Hamı. o cümlədən Özbəyistan Kommunist Partiyasının birinci katibi Osman Yusupov, məşhur tacik şairi və ictimai xadimi Sədrəddin Aynı, komissiya üzvlərinin hamısı biri-birinin üzünə baxır. Ərəbcə yaxşı bilən operator və Aynı kitabı alıb oxuyur və qocanın dediklərini təsdiqləyirlər. Vəziyyətə müdaxilə eləyən Özbəkistan Elmlər Akademiyasının prezidenti Sədrəddin Aynı kobud bir tərzdə qocalardan işə mane olmamalarını, cəfəngiyyat danışmağın yersiz olduğunu məsləhət görür və oranı tərk etmələrini tələb eləyir.

Kitabı stolun üstə qoyub, bir neçə xoşa gələn kəlam söylədikdən sonra bu naməlum insanların üçü də qapını açıb bayıra çıxırlar. Bunların şəxsiyyətlərini müəyyənləşdirmək məqsədilə komissiya üzvlərindən bir neçəsi də dərhal onların arxasınca çıxır. Gözlənilməz qeyri-adi hadisə də bu vaxt baş verir.

Çağrılmamış qonaqlar qapını açıb bayıra ayaq basan andan qeybə çəkilirlər, birdən birə, gözlənilməz bir tərzdə yox olurlar. Onların arxasınca bayıra çıxanlar nə qədər axtarsalar da tapa bilmirlər, onları gördüm deyən olmur.

Həmin saatlarda ikinci qeyri-adi hadisə o olur ki, stolun üstə qoyulmuş kitab da yoxa çıxır.

Hamını, işçi qrupunun bütün üzvlərini-ateizm təbliğatı ilə təlimlənmiş və tərbiyələnmiş dövlət və elm adamlarını təəccüb bürüyür, hamı dəhşətə gəlir, ilk anlarda özlərini itirirlər. Buna baxmayaraq, 21 iyunda Əmir Teymurun qəbrinin açılması işi başlanır. Qaldırıcı kran gətirib Əmir Teymurun məzarı üstündəki daşı qaldırmaq istəyirlər. Əvvəlcə gözlənil-

mədən işıqlar sönür, sonra isə qaldırıcı kranın qarmağı sınır. Bir qədər sonra daş öz yerindən tərpəndikdə hamını təəccüb bürüyür. Qəbrdə qeyri-adi işıqlanma baş verir və oradan ətrafa yayılan aromat hər kəsi məst eləyir.

Nəhayət Fatehin qəbri açılır. O üç nəfərin dedikləri isə doğru çıxır. Elə həmin gün, həmin saatlarda radio Almaniyanın Sovet İttifaqı üzərinə hücum etməsini, müharibənin başlanması xəbərini, bu ümumixalq fəlakətini bütün ölkəyə yayır.

Müharibənin başlanması xəbərinin, o üç naməlum adamların dediklərinin düz çıxdığını xəbər verən Malik Kaumov mavi ekrandan belə bir ifadə işlətdi :

- Bu xəbərdən Aynı o dərəcə sarsıldı ki, birdən-birə yazıq bir görkəm alaraq, pişik kimi otağın bir küncünə sıxıldı.

Həmin filmdə göstərilir ki, Əmir Teymurun qalıqları xüsusi təyyarə ilə Moskvaya göndərilir, üzərində elmi tədqiqat işi aparılır, skeletə əsaslanaraq antropoloq Mixail Qerasimov onun 400-ə qədər maketini hazırlayır, heykəlini düzəldir. Müharibənin ilk ayları, Sovet Ordusunun böyük itkilər verərək, sürətlə geri çəkildiyi ağır günlərin birində Səmərqənddə baş vermiş bu maraqlı qeyri-adi hadisəni Sovet ittifaqı marşalı Jukov eşidir və 1942-ci ilin oktyabrında Stalinə danışır. Stalin bu xəbərdən sarsılır, bir müddət fikrə getdikdən sonra Teymurun qalıqlarını təyyarəyə qoyub, müsəlman din xadimlərinin müşayəti ilə cəbhə xəttini gəzdirməyi, onun ruhuna dualar oxunmasını və qalıqlarının Səmərqənddə, öz yerində böyük hörmətlə dəfn edilməsini əmr eləyir. Bu məqsədlə o Özbəkistana Osman Yusupova zəng eləyir. Müharibənin o ağır dövründə digər heç bir sahəyə büdcədən bir qəpik də olsun ayırmayan Stalin böyük Fatehə məqbərə tikmək üçün bir milyon rubl pul ayırır. Bu tapşırıq 1942-ci ilin 20 dekabrında yerinə yetirilir. Teymurun qalıqları öz yerində dəfn edilir. Həmin Filmdə deyildiyinə görə, Teymurun qalıqlarının dəfn olunduğundan iki gün sonra radio Rus ordusunun Stalinqradda əks hücuma keçərək, altmış min plen götürdüklərini və almanlara üstün gəldikləri xəbərini yayır.

Şükür sənin qüdrətinə İlahi, Allah sənə rəhmət eləsin,

ruhun şad olsun fatehlər fatehi ulu Teymur!

Deyilənləri dərk elə, yaradanın böyüklüyünü qəlbində yaşat, ulu Teymurun Allahın dərgahında olduğuna, dünyanı əlində oyuncaq kimi oynada bilən bu böyük insanın eyni zamanda, Tanrının istəklisi olduğuna inan və imanlı ol, əziz oxucu.

Yuxarıda qeyd etdiyimiz kimi bu amansız müharibəyə Qaraqoyunlu əli silah tuta bilən balalarını göndərdi. Onların əksəriyyəti qayıtmadı, bəzilərinin haradansa, çox-çox uzaq diyarlardan bir parça kağızla qara xəbərləri gəldi. Bəziləri isə itkin düşdü,. Onların adlarını, soy adlarını və atalarının adlarını tapıb yazaraq, gələcək nəsillərə çatdırmaq və tarixin, o cümlədən Qaraqoyunlu tarixinin səhifələrindən itməsinin qarşısını almaq istədim. Təəssüf ki, dərhal çətinliklərlə üzləşdim.

Çünki, müharibə dövrünə aid lazımi məlumatları toplamaq, məsələn müharibədə həlak olanlarla yanaşı kənddə yaşayan əhalinin sayını, tayfaların adlarını müəyyənləşdirmək üçün arxiv sənədləri yoxdur.

Ona görə də, bizə lazım olan məlumatları toplamaq üçün hər bir kəndin yaşlı sakinlərinin bildiklərindən, kəndləri yaxşı tanıyan, ömrünü həmin kənddə keçirmiş ağsaqqallardan, ağbirçəklərdən istifadə etmək, onların dediklərinə , verdikləri məlumatlara istinad etmək lazım gəldi. Bəzi hallarda bu da özünü doğrultmadı. Çünki, müharibə dövründən 55-60 il keçdiyinə görə , o dövr kəndlərini yaxşı tanıyanların çox cüzi bir qismi, hər kənddən bir-iki nəfəri salamatdır, onların isə yaşları 75-80-i ötmüş yaddaşları korşalmışdır.

Bunu nəzərə alaraq, hər kənddə həmin kəndi daha yaxşı tanıyan bir-neçə adamın verdiyit məlumatları toplayıb müqayisə etdim, şübhəli görünənləri aydınlaşdırdım və təxminən düz hesab elədiyimiz ümumi nəticələri bu kitab vasitəsilə sizin nəzərinizə çatdırmağı doğru hesab etdim.

İstərdim ki, verilən məlumatlarda müharibənin başlanğıcında və sonunda kəndlərdə əhalinin sayı da göstərilsin.Təəssüf ki, belə bir məlumatı verə biləcək mənbə tapılmadı.

Məndə olan mənbə 1931-ci ilə aid olduğuna cörə Qaraqoyunlu kəndlərində yaşayan əhalinin sayını həmin ilə istinadən verməyi lazım bildim, istəkli qaraqoyunlular.

Çəkilən zəhmətə, həqiqəti üzə çıxarmaq istəyimə baxmayaraq, müharibədə həlak olanlar və itkin düşənlər haqda verilən məlumatların tam, tamamilə dəqiq və qüsursuz olmasına bəri başdan müəyyən qədər şübhəm var.

Ona görə də bu kitabı oxuyanlardan xahiş edirəm ki, bildikləri əlavə məlumatları müəllifə çatdırmağı unutmasınlar.

Aşağıda Qaraqoyunlunun hər bir kəndində yaşayanların 1931-ci ilə aid sayı və 1941-1945-ci il müharibəsində həlak olanların siyahısı verilmişdir.

**1.A l a ç ı q q a y a**

1931-ci ildə Alaçıqqayada 119 nəfər yaşamışdır. 1941-1945-ci il müharibəsində 9 nəfər alaçıqqayalı həlak olmuş və ya itkin düşmüşdür. Bunların adı soyadı və atasının adı aşağıda qeyd edilmişdir.

1.Budaqov Cahancir Yusif oğlu
2.Qurbanov Mahmud Nəbi oğlu
3.Əliyev Qədim Kərim oğlu
4.Əliyev Bayram İskəndər oğlu
5.Nəbiyev İsmayıl
6.Musayev Səməd
7.Həsənov Xıdır
8.Hətəmov Əskər Mərdan oğlu
9.Orucov Camal Suleyman oğlu

**2.M u r t e y i l**

1931-ci ildə kənd sakinlərinin sayı 161 nəfər olmuşdur.1941-1945-ci il müharibəsində 17 nəfər həlak olmuş və yaxud itkin düşmüşdür. Bunlar aşağıdakılardır.

1.Budaqov Əskər Əskər oğlu
2.Budaqov Muxtar Əskər oğlu
3.Budaqov Mehdi
4.Budaqov Mahmud
5.Bayramov Məhəmməd Abdulla oğlu
6.Qurbanov Alməmməd Məşi oğlu
7.Mustafayev Mahmud Cəfər oğlu

8.Mustafayev Cəfər Məhəd oğlu
9.Mustafaev Əli Məhəd oğlu
10.İsmayılov Musa Məmmədhüseyin oğlu
11.İsmayılov İskəndər Avdı oğlu
12.İsmailov Hacı Avdı oğlu
13.İsmayılov Məmməd Avdı oğlu
14.Zeynalov Əhməd Rüstəm oğlu
15.Həsənov Həsən Novruz oğlu
16.Əliyev Hüseyin
17.Orucov Məhəmmədəli Vəli oğlu

**3.Ağkilsə**

1931-ci ildə kəndin 166 nəfər sakini olmuşdur. Almanlarla müharibədə aşağıdakı 18 nəfər sakin müharibə qurbanı olmuşdur.

1.Abdalov Qasım Qasım oğlu
2.Qasımov Qasım Məhəd oğlu
3.Qasımov Gülməmməd Məhəd oğlu
4.Quliyev Qasım Məmmədhüseyin oğlu
5.Quliyev Nəsib Məmmədhüseyin oğlu
6.Quliyev Nadir Məmmədhüseyin oğlu
7.Quliyev Həsən
8.Quliyev Tağı Ocaqverdi oğlu
9.İsmayılov Mahmud
10.İsmailov Məhəmməd
11.Rüstəmov Səfər Gülməmməd oğlu
12.Şahmarov Tahir Kərim oğlu
13.Şahmarov İsrafil Şahmar oğlu
14.Məmmədov BayramRüstəm oğlu
15.Mustafayev Sadıq Nəbi oğlu
16.Piriyev Piri Mehdi oğlu
17.İsmayılov Mahmud İbrahim oğlu
18.Dünyamalıyev Məhəmməd Məhəmməd oğlu

**4.P o l a d**

1931-ci ildə kəndin 460 nəfər sakini olub.1941-1945-ci il müharibəsində 38 nəfər poladlı şəhid olmuşdur. Onlar haqda aşağıda məlumat verilmişdir.

1.Abdalov Məhəmməd Hüseyin oğlu

2.Allahverdiyev Hüseyin Həsənəli oğlu
3.Allahverdiyev Məhərrəm Həsənəli oğlu
4.Qasımov Məhəmməd Hüseyin oğlu
5.Qasımov Xəlil Əbdülrəhman oğlu
6.Qasımov Əli Əbdülrəhman oğlu
7.Qasımov Qasım Bayram oğlu
8.Quliyev Fətəli Mustafa oğlu
9.Quliyev Əmirqulu Allahverdi oğlu
10.Qocayev Əli Abutalıb oğlu
11.Qocayev Həsən Abutalıb oğlu
12.Hümbətov Xıdır Elləzxan oğlu
13.Həmzəyev Qəhrəman Abdulla oğlu
14.Hacıyev Dünyamalı Nuru oğlu
15.Hacıyev Nadir Nuru oğlu
16.Hacıyev Hacalı Nuru oğlu
17.Hacıyev İsmayıl Hüseyin oğlu
18.Hacıyev Əli Hüseyin oğlu
19.Hacıyev Mərdəli Hüseyin oğlu
20.İbrahimov Əlirza Məhəmməd oğlu
21.Xasıyev Məhəmməd Gülməmməd oğlu
22.Murtuzov Əli Avdıləzim oğlu
23.Məmmədov Məhərrəm Pirməmməd oğlu
24.Məmmədov Məhəmməd Pirməmməd oğlu
25.Məhəmmədov Məmməd Mövlamverdi oğlu
26.Mirzəyev Rəcəb Muxtar oğlu
27.Mirzəyev Qəmbər Muxtar oğlu
28.Əliyev Məhəmmədəli Əli oğlu
29.Əskərov İbrahim
30.Sariyev Nəsib Rza oğlu
31.Sarıyev Abdulla Rza oğlu
32.Sarıyev Həbib Bayram oğlu
33.Tağıyev Nadir Avdı oğlu
34.Tağıyev İslam Allahverdi oğlu
35.Tağıyev Hüseyin Nağı oğlu
36.Tağıyev Həsən Nağı oğlu
37.Şükürov Rüstəm Abbas oğlu
38.Mirzəyev Məhəmmədəli Ağamməd oğlu

**5.S a l a h**

1931-ci ildə Salah kəndində yaşayanların sayı 112 nəfər olmuşdur. Müharibəyə gedənlərin 12 nəfəri qayıtmamışdır. Onların siyahısına aşağıdakılar aiddir.

1.Həsənov Cahangir Paşa oğlu
2.Həsənov İsmayıl Məhəmməd oğlu
3.Həsənov Dəryah Şərif oğlu
4.Əhmədov Xoca Göyüş oğlu
5.Mustafayev Allahverdi Mirzə oğlu
6.Talıbov Allahverdi Qara oğlu
7.Talıbov Davud Seyid oğlu
8.Sarıyev Qoşunəli Əmirxan oğlu
9.Allahverdiyev Alməmməd Gülməmməd oğlu
10.Seyidov Həmid
11.Qurbanov Mustafa
12.Kərimov Hüseyin

**6.G ö y ə r ç i n**

1931-ci ildə Göyərçin kəndində 205 nəfər adam yaşamışdır. Adları siyahıya salınmış 19 nəfər Göyərçin kənd sakini Böyük Vətən Müharibəsində həlak olmuşdur.

1.Qarayev Ağamalı Süleyman oğlu
2.Qarayev Omar Paşa oğlu
3.Qarayev Nəsəf Süleyman oğlu
4.Səfərov İbrahim
5.Abdullayev Alı Allahverdi oğlu
6.Abdullayev Qaçaq Allahverdi oğlu
7.Abdullayev Ənvər Vəli oğlu
8.Lələyev Hasanalı Şölə oğlu
9.Lələyev Bayraməli
10.Cəfərov Cəfər Astan oğlu
11.Bayramov Gözüqara Əmirvan oğlu
12.Piriyev Şirin Piri oğlu
13.Hüseyinov Kazım Paşa oğlu
14.Abbasov İslam Hasan oğlu
15.Haqverdiyev Nəsir Qaraoğlan oğlu
16.Hüseyinov Mahmud Paşa oğlu
17.Musayev Cəbrayıl İdris oğlu

18.Tağıyev Həsən
19.Tağıyev Tağı Tağı oğlu

**7.Y a n ı q p ə y ə**

1931-ci ildə kənddə 205 nəfər sakin yaşamışdır.Müharibədə həlak olanlar və itkin düşənlər 17 nəfərdir.

1.Abbasov Elbəyi
2.Bayramov Qurban Mustafa oğlu
3.Qarayev Bəkir
4.Mustafayev Mustafa Murğuz oğlu
5.Mustafayev Ələskər Murğuz oğlu
6.Mustafayev Hüseyin Alviz oğlu
7.Murğuzov Məhəmməd Mustafa oğlu
8.Muradov Əliməmməd
9.Mamoyev Məhəmməd Mamoy oğlu
10.Mancanov Məhəmməd
11.Hüseyinov Yusif
12.Hüseyinov Nəsib
13.Hətəmov Pirqələm
14.Həsənov Məmməd Mahmud oğlu
15.Əhmədov Mancan
16.Əhmədov Bəkir Əhməd oğlu
17.İsmayılov Piri Məmmədxan oğlu

**8. Ç a y k ə n d**

1931-ci ildə kənddə 672 nəfər adam yaşamışdır. Adlarını qeyd etdiyimiz 85 nəfər Çaykəndli müharibədə həlak olmuş və ya itkin düşmüşdür.

1.Abdullayev İsmayıl Abbas oğlu
2.Abdullayev Səftər Abdul oğlu
3.Abdullayev Məhəmmədəli Abdul oğlu
4.Abdullayev Qaraca Eyyub oğlu
5.Abdullayev Hətəm Eyyub oğlu
6.Abdullayev Sayad Qəşəm oğlu
7.Abdullayev Həmid Qəşəm oğlu
8.Abdullayev İmirzəalı Əskər oğlu
9.Abdullayev Heydər Abdulla oğlu
10.Abiyev Xanbaba Əhməd oğlu
11.Aliyev Daşdəmir Əhməd oğlu

12.Aliyev Məhərrəm Əhməd oğlu
13.Aliyev Ağbaba Əhməd oğlu
14.Aliyev Museyib Alı oğlu oğlu
15.Aliyev Bayram Ali oğlu oğlu
16.Aliyev Oruc Ramazan oğlu
17.Aliyev İsmayıl Ramazan oğlu
18.Babayev Zəryar Qulu oğlu
19.Babayev Musa Qulu oğlu
20.Babayev Sarı Mansır oğlu
21.Binnətəliyev İmirzalı İskəndər oğlu
22.Binnətəliyev Həmid İskəndər oğlu
23.Qasımov Yusif Börəki oğlu
24.Qasımov Rəfi Məmməd oğlu
25.Məmmədov Bayram Məsim oğlu
26.Məmmədov Ramazan Omar oğlu
27.Məmmədov Bəxtiyar Oruc oğlu
28.Məmmədov Hümbət Məmməd oğlu
29.Məmmədov Məcid Məmməd oğlu
30.Məmmədov Məhəmməd Əhməd oğlu
31.Məmmədov Alı Məhəmməd oğlu
32.Məmmədov Həsən Kamal oğlu
33.Məmmədov Çoban İskəndər oğlu
34.Mehdiyev Abbas Sadıq oğlu
35.Mahmudov Rəşid Qasım oğlu
36.Mahmudov Nəsir Qasım oğlu
37.Mustafayev İbrahim Salman oğlu
38.Nəsibov Nəsib Neymə oğlu
39.Nəsibov Əsəd Neymə oğlu
40.Nəsibov Yusif Neymə oğlu
41.Həsənov Bayram Mehralı oğlu
42.Həsənov Mustafa Mehralı oğlu
43.Həsənov Həsən Mehralı oğlu
44.Həsənov İmran Gülməmməd oğlu
45.Həsənov İsmayıl Gülməmməd oğlu
46.Həsənov Hüseyn Süleyman oğlu
47.Hətəmov Pirqələm Əbdülkərim oğlu
48.Hətəmov Nəbi Əbdülkərim oğlu

49.Hətəmov Hümbət Qərib oğlu
50.Əskərov Hüseyn Alı oğlu
51.Əfəndiyev Xalid Məhəmməd oğlu
52.Əfəndiyev Becan Həsən oğlu
53.Əfəndiyev Bayram Həsən oğlu
54.Əhmədov Əhməd Alıbala oğlu
55.Əhmədov Hasanalı Əli oğlu
56.Əhmədov Sultanəli Əli oğlu
57.Əhmədov İsmayıl Kazım oğlu
58.Kərimov Məmməd Osman oğlu
59.Kazımov Kazım Bəhman oğlu
60.Kərimov İbrahim Abuzər oğlu
61.Kərimov Hüseyin Abuzər oğlu
62.Osmanov Zozu Alı oğlu
63.Osmanov Mürsəl Alı oğlu
64.Osmanov Seyfəddin Qurban oğlu
65.Osmanov Hüseyin Qara oğlu
66.İsgəndərov Əmirxan Məhəmməd oğlu
67.İsgəndərov Allahverdi Tapdıq oğlu
68.İbrahimov Məhəmməd Yusif oğlu
69.İsmayılov İlxıçı Mustafa oğlu
70.İsmayılov Mustafa Mustafa oğlu
71.Cəlilov Klaf Ələkbər oğlu
72.Pirverdiyev İsgəndər Həmid oğlu
73.Pirverdiyev Piriverdi Həmid oğlu
74.Pirverdiyev İsə Həmid oğlu
75.Məmmədov Həsən Əskər oğlu
76.Yusifov Yusif İsmayıl oğlu
77.Yusifov Ağakişi İsmayıl oğlu
78.Yusifov Atakişi İsmayıl oğlu
79.Ustalıyev Ustalı Mustafa oğlu
80.Ustalıyev Süleyman Mustafa oğlu
81.Şabanov Avqədir Mustafa oğlu
82.Sevdimalıyev İmamalı Yusif oğlu
83.Sevdimalıyev Əliskəndər Yusif oğlu
84.Tanrıverdiyev Qurban Məhəmməd oğlu
85.Tahirov Əmirverdi Rəsul oğlu

**9. G ö l k ə n d**

1931-ci ildə kəndin əhalisi 1283 nəfərdən ibarət olmuşdur.1941-1945-ci il müharibəsində kənd 97 nəfər itirmişdir.

1.Ağamalıyev Həzi Daşdəmir oğlu
2.Allahverdiyev Museyib Mehbalı oğlu
3.Allahverdiyev Haqverdi Xoylu oğlu
4.Allahverdiyev Xalıqverdi Xoylu oğlu
5.Abdullayev Qaraxanlı Qaraca oğlu
6.Alıyev Cəfər Museyib oğlu
7.Alıyev Mustafa Qədir oğlu
8.Alıyev Mansur Möylə oğlu
9.Alıyev Səməd Alı oğlu
10.Alıyev Qalib Alı oğlu
11.Alıyev Qafqara Alı oğlu
12.Alıyev Səməd Paşa oğlu
13.Vəliyev Əliş Murğuz oğlu
14.Qocayev Məcid Nadir oğlu
15.Qocayev Pirverdi Nadir oğlu
16.Qocayev Həmid Nadir oğlu
17.Qocayev Bəkir Qoca oğlu
18.Qocayev Sarı Asdan oğlu
19.Qocayev Yusif Gülməmməd oğlu
20.Qocayev Musa Pirqulu oğlu
21.Bayramov Kazım Niftalı oğlu
22.Dadaşov Allahverdi Dadaş oğlu
23.Daşdəmirov Oruc Quzuçu oğlu
24.Sarıyev İsrayıl Niyaz oğlu
25.Saxanov Kərəm Qələndər oğlu
26.Səmədov Alıbəy
27.Sadıqov Araz Niyaz oğlu
28.Şəmilov Əsəd Məcid oğlu
29.Şirinov İmran Gülməmməd oğlu
30.İsgəndərov Zabit Daşdəmir oğlu
31.İsgəndərov Xanqara Ömər oğlu
32.İsmayılov Ədil Mərdan oğlu
33.İsgəndərov Pirməmməd Məhərrəm oğlu
34.İsgəndərov Gülməmməd Məhərrəm oğlu

35.İsmayılov Şəmil Şükür oğlu
36.ismayılov Əfəndi Şükür oğlu
37.Məmmədov Binnət Məhəmməd oğlu
38.Məmmədov Abalı Məhəmməd oğlu
39.Məmmədov İbrahim Qılıc oğlu
40.Məmmədov Əhməd Mustafa oğlu
41.Məmmədov Əmirullah Zaman oğlu
42.Məmməd Məmmədalı Məhərrəm oğlu
43.Məmmədov Cəfər Alı oğlu
44.Məmmədov Allahverdi Alı oğlu
45.Məmmədov İbrahim Qurban oğlu
46.Məmmədov Alı Ramazan oğlu
47.Məmmədov Məmməd Ramazan oğlu
48.Məmmədov Misir Pirqulu oğlu
49.Məmmədov Ağalar Məmməd oğlu
50.Mustafayev Oruc Süleyman oğlu
51.Mustafayev Məhəmməd Allahverdi oğlu
52.Mustafayev Nayib Alzaman oğlu
53.Mustafayev Eyyub Alzaman oğlu
54.Mustafayev Əhməd Məmməd oğlu
55.Mustafayev Əhməd Hacı oğlu
56.Mikayılov Qulu Tağı oğlu
57.Musayev Alqara Alı oğlu
58.Musayev Miskinli Alı oğlu
59.Mürsəlov Naib
60.Mansurov Miri Pirqulu oğlu
61.Mansurov Oruc Pirqulu oğlu
62.Mahmudov Dağıstan Qaraca oğlu
63.Namazov Həmid Namaz oğlu
64.Nəsibov Mayıl Ramazan oğlu
65.Nəsibov Nəcəf Ramazan oğlu
66.Nəbiyev Qarayasar Nəbi oğlu
67.Nağdaliyev Əliş Yusif oğlu
68. Nağdaliyev Yusif Yusif oğlu
69.Nağdaliyev Pirverdi Fərzalı oğlu
70.Nağdaliyev Danaçı Hacıvəli oğlu
71.Niftaliyev Məmiş Niftalı oğlu

72.Niyazalıyev İsrayıl Əhməd oğlu
73.Hacıyev Sarı Xamoy oğlu
74.Hacıyev Əzbər Rəhim oğlu
75.Hacıyev Novruz
76.Hacıyev Mehdi Bayram oğlu
77.Hacıyev Qonsur Bayram oğlu
78.Hacıyev Müzəffər Müseyib oğlu
79.Hacıyev Alı Qahrı oğlu
80.Hacıyev İbrahim Fərzalı oğlu
81.Hacıyev Qasım Mehbalı oğlu
82.Hacıyev Sənhan Mehbalı oğlu
83.Hacıyev Pənah Mahmud oğlu
84.Hacıyev Şəmil Qəhrəman oğlu
85.Həsənov İsrafil Göyüş oğlu
86.Həsənov Dölçü Hüseyin oğlu
87.Həsənov Məhəmməd Vəli oğlu
88.Gülməmmədov Müseyib Mehbalı oğlu
89.Yunusov Əlfət Yunus oğlu
90.Orucov Novruz Malagedən oğlu
91.Orucov Murğuz Malagedən oğlu
92.Orucov Knyaz Molla oğlu
93.Orucov Ayvaz Molla oğlu
94.Kərimov Bağır Şərif oğlu
95.Kazımov Nəsrəddin Yaqub oğlu
96.Piriyev Fikrət Məmiş oğlu
97.Tarlanov Ağalar Məmməd oğlu

**10.Ə m i r x e y i r**

1931-ci ildə Əmirxeyirdə 250 nəfər adam yaşayırdı. Kənd müharibədə 20 nəfər oğul itirmişdir.

1.Alıyev Teymur Yusif oğlu
2.Alıyev Tapdıq Nəsib oğlu
3.Alıyev Möysüm Qasım oğlu
4.Allahverdiyev Teymur Səməd oğlu
5.Əliyev Mehdi Sarı oğlu
6.Əliyev Məcid Əbdürəhman oğlu
7.Əliyev Mustafa Abbas oğlu
8.Əliyev Yusif Həsən oğlu

9.Əsədov Aslan Əhməd oğlu
10.Dəmirov Dəmir Səməd oğlu
11.Həsənov İbrahim Mirzə oğlu
12.Həsənov Babaxan Mirzə oğlu
13.Həşimov Şəmistan Əhməd oğlu
14.Mahmudov İsmayıl Şəmil oğlu
15.Süleymanov Musa Ağamalı oğlu
16.Süleymanov Laçın (Süleyman)Ağamalı oğlu
17.Seyidov Şəmistan Rza oğlu
18.Nəsibov Rüstəm Heşim oğlu
19.Nəsibov Həsən Heşim oğlu
20. Kərimov Bayram Pirvəli oğlu

**11.B ə r y a b a d**

1931-ci ildə 109 nəfər sakini olan kənd 1941-1945-ci il müharibəsində siyahıda qeyd edilən 14 nəfəri itirmişdir.

1.Allahverdiyev Şəmşəd Məhəmməd oğlu
2.Qurbanov Allahverdi Şaqqulu oğlu
3.Qurbanov Tanrıverdi Şaqqulu oğlu
4.Qurbanov Məcid Ocaqqulu oğlu
5.Qurbanov Mahmud Ocaqqulu oğlu
6.Həsənov Bilal Mirzə oğlu
7.Alıyev Namaz İsgəndər oğlu
8.Alıyev Səməd İsgəndər oğlu
9.Mirzəyev Daşdəmir Bilal oğlu
10.Əliyev Alməmməd Nəsib oğlu
11.İsgəndərov Yusif Sayad oğlu
12.İsgəndərov Tələt Sayad oğlu
13.Yusifov Cəfər İsgəndər oğlu
14.Xəlilov Xəlil Ləzim oğlu

**12. H a q q ı x l ı**

1931-ci ildə Haqqıxlı kəndində 431-nəfər əhali yaşamışdır. 1941-1945-ci il müharibəsində 56 nəfər Haqqıxlı həlak olmuşdur.

1.Alıyev Alı Qasım oğlu
2.Alıyev Vəli Qasım oğlu
3.Alıyev Süleyman Mehdixan oğlu
4.Alıyev Müslüm Mehdixan oğlu
5.Allahverdiyev Allahverdi Rəhim oğlu

6.Bayramov Oruc Rəhim oğlu
7.Bayramov Rzaqulu Məhəmməd oğlu
8.Bayramov Əhməd Həsənxan oğlu
9.Vəliyev Hüseyinqulu Mehdi oğlu
10.Vəliyev Qəhrəman İsgəndər oğlu
11.Vəliyev Alış İsgəndər oğlu
12.Mustafayev Mustafa Paşa oğlu
13.Mustafayev Musa Alməmməd oğlu
14.Mustafayev Mustafa İmran oğlu
15.Mustafayev Ramazan Qurban oğlu
16.Mustafayev Qəmbər Oruc oğlu
17.Məmmədov Məmməd Məhəmməd oğlu
18.Məmmədov Əhməd Hacıəli oğlu
19.Məmmədov Məmməd Hacıəli oğlu
20.Məmmədov Əmir Əlifxan oğlu
21.Məmmədov İsa Əlifxan oğlu
22.Musalıyev Murad Alməmməd oğlu
23.Mirzəyev Rza Əskər oğlu
24.Nağıyev Muxtar Əmrah oğlu
25.Nağıyev Məhəmməd Əmrah oğlu
26.Nəsibov Oruc Hüseyin oğlu
27.Nəsibov Mahmud Hüseyin oğlu
28.Nəbiyev Mahmud Mövlud oğlu
29.Hüseyinov Hüseyin Rəhim oğlu
30.Hüseyinov Seyfulla Rəhim oğlu
31.Hüseyinov Tacir Rəhim oğlu
32.Haqverdiyev Alməmməd Vəli oğlu
33.Həsənov Allahyar İsaq oğlu
34.Həsənov Məhəmməd Allahverdi oğlu
35.Həsənov Salman Allahverdi oğlu
36.Həsənov Hüseyin Məhəmməd oğlu
37.Həsənov Novruz Murad oğlu
38.Həsənov Zahid Tanrıverdi oğlu
39.Rzayev İsmayıl Məhəmməd oğlu
40.Rzayev İsrafil Məhəmməd oğlu
41.Şərifov Abbasəli Qasım oğlu
42.Şərifov Qurban Qasım oğlu

43.Şərifov Mustafa Paşa oğlu
44.Şərifov Şərif Qasım oğlu
45.İsmayılov Kazım Yəhya oğlu
46.İsmayılov Ələkbər Hüseyin oğlu
47.İsmayılov Cəfərqulu Əmiraslan oğlu
48.İsmayılov Əbdürrəhman Tanrıverdi oğlu
49. İsmayılov Ənvər Camal oğlu
50. İsmayılov Oruc Əmirxan oğlu
51.İsmayılov Məhərrəm Əmirxan oğlu
52.İsmayılov Zeynal Rüstəm oğlu
53.İbrahimov Qasım Kazım oğlu
54.İsmayılov Oruc Cəfər oğlu
55.Cəfərov Balakişi Bayram oğlu
56.Süleümanov Nuhiddin Süleüman oğlu

**13. Qaraqaya**

1931-ci ildə kəndin 140 nəfər sakini olmuşdur. Bu kənddən müharibəyə gedənlərdən aşağıdakı 18 nəfəri qayıtmamışdır.

1.Abdullayev Məmməd Rəsul oğlu
2.Məmmədov Məhəmməd Yusif oğlu
3.Mustafayev Möylə Mustafa oğlu
4.Mustafayev Şöylə Mustafa oğlu
5.Mustafayev İslam Mustafa oğlu
6.Hacıyev Həmid Süleyman oğlu
7.Hacıyev Nəsir Süleyman oğlu
8. Rəhimov Məhəmməd Hüseyin oğlu
9. İsmayılov Qoşum İskəndər oğlu
10. İsayev Əşrəf Daşdı oğlu
11. İsayev Novruz Həsən oğlu
12. İsayev Mehdi Allahyar oğlu
13. Süleymanov Bahəddin Eyvaz oğlu
14. Əfəndiyev Teymur Əhməd oğlu
15. Həsənov Əhməd Musa oğlu
16. Süleymanov Bayraməli Manaf oğlu
17. İbrahimov Möyləverdi Paşa oğlu
18. İbrahimov Şövkət Paşa oğlu

**14.Ç ı v ı x l ı**

1931-ci ildə kənddə 132 nəfər sakin yaşamışdır. Bu kənd-

dən müharibəyə gedənlərdən aşağıdakılar qayıtmamışdır.

1.Vəliyev Bayramalı Hacıalı oğlu
2.Vəliyev Tavariş Aşıralı oğlu
3.Məmmədov Atabəy Nəbi oğlu
4.Məmmədov Allahverdi Alı oğlu
5.Məmmədov Şəkər
6.Məsimov Qiyas Mansır oğlu
7.Qocayev Ağakişi Qoca oğlu

Hörmətli oxucular, verilmiş məlumatlardan aydın olur ki,13 kənddən ibarət olan Qaraqoyunlu bu müharibədə 411 oğlunu itirmişdir. Bu əli silah tuta bilənlərin təxminən 95%-ni təşkil eləyir. Bu bədnam müharibə anaları oğulsuz, gəlinləri ərsiz, bacıları qardaşsız, körpələri atasız qoymuşdur.

Aşağıdakı cədvəldə Qaraqoyunlunun ayrı-ayrı kəndləri üzrə müharibədə həlak olanların ümumi sayı və müxtəlif sayda itki verən ailələrin sayı göstərilmişdir.

| sıra №- si | Kəndin adı | Həlak olanların ümumi sayı | 4 oğul itirən ailə | 3 oğul itirən ailə | 2 oğul itirən ailə | 1 oğul itirən ailə | oğul itirmiş ailələrin ümumi sayı |
|---|---|---|---|---|---|---|---|
| 1. | Gölkənd | 97 | - | 1 | 15 | 64 | 80 |
| 2. | Çaykənd | 85 | 1 | 4 | 18 | 31 | 54 |
| 3. | Əmirxeyir | 19 | - | - | 3 | 13 | 16 |
| 4. | Bəryabad | 14 | - | - | 4 | 6 | 10 |
| 5. | Yanıqpəyə | 17 | - | - | 1 | 15 | 16 |
| 6. | Salah | 12 | - | - | - | 12 | 12 |
| 7. | Göyərçin | 19 | - | - | 1 | 17 | 18 |
| 8. | Polad | 38 | - | 2 | 7 | 94. | 27 |
| 9. | Alaçıqqaya | 9 | - | - | - | 9 | 9 |
| 10. | Murteyil | 17 | - | 1 | 2 | 10 | 13 |
| 11. | Ağkilsə | 18 | - | - | 3 | 12 | 15 |
| 12. | Qaraqaya | 18 | - | 1 | 2 | 11 | 14 |
| 13. | Cıvıxlı | 7 | - | - | - | 7 | 7 |
| 14. | Haxqıxlı | 57 | - | 1 | 13 | 28 | 42 |

Göründüyü kimi dörd, üç, iki oğul itirənlərin dərdi daha böyük olmuşdur.

Çaykənddən Xanbala, Ağabala, Daşdəmir və Məhərrəm adlı dörd oğlunu müharibəyə yola salıb, gecə-gündüz yollarına göz tikən, lakin, dördünü də itirən, heç olmasa bircəciyini belə qarşılamaq səadətinə qovuşa bilməyən ata-ananın nələr çəkdiklərini, daşıdıqları dərdlərin dərinliyini ancaq belə dərdi çəkənlər yaxşı bilərlər.

Bu dərdə Qaraqoyunlunun 10 ailəsinin hər birində üç oğul, 68 ailəsinin hər birində isə iki oğul itirmiş analar-atalar daha yaxından şərik ola bilərlər.

Bu dərdi gözünün ağı-qarası, yeganə ümidi olan tək oğlunun qara xəbərini alan analar başa düşərdilər.

Növbəti cədvəldə dörd və üç oğul itirən ailələr və həlak olanların adları göstərilmişdir.

| Sıra №-si | Kəndin adı | Valideyinin adı | İtirilmiş oğulların sayı | Həlak olmuş oğulların adları |
|---|---|---|---|---|
| 1 | Çaykənd | Alıyev Əəə əd | 4 | Xanbala, Ağabala Daşdəmir. Məhərrəm |
| 2 | Çaykənd | Nəsibov Neymə | 3 | Həsib, Əsəd, Yusif |
| 3 | Çaykənd | Pirverdiyev Həmid | 3 | İsgəndər,Pirverdi, İsə |
| 4 | Çaykənd | Həsənov Mehralı | 3 | Bayram, Mustafa, Həsən |
| 5 | Çaykənd | Yusifov İsmayıl | 3 | Yusif, Ağakişi, Atakişi |
| 6 | Polad | Hacıyev Nuru | 3 | Dünyamalı, Nadir, Hacalı |
| 7 | Polad | Hacıyev Hüseyin | 3 | İsmayıl, Əli, Mərdəli |
| 8 | Murteyil | İsmayılov Avdı | 3 | İsgəndər, Hacı, Məmməd |
| 9 | Gölkən | Qocayev Nadir | 3 | Məcid, Pirverdi, Həmid |
| 10 | Haqqıxlı | Hüseyinov Rəhim | 3 | Hüseyin, Tacir, Seyfulla |
| 11 | Qaraqaya | Mustafayev Mustafa | 3 | Möylə, Şöylə, İslam |

Cədvəllərdən göründüyü kimi Qaraqoyunlunun cəmisi 11 ailəsi 34 oğul, 68 ailənin hər biri iki oğul itirməklə 136 oğul, qalan 257 ailə isə 257 oğul itirmişdir.

## 11. 1945-ci ildən sonrakı dövr və Qaraqoyunlu.

Beləliklə ikinci dünya müharibəsi başa çatdı. Müharibədən salamat qayıdanlar bütün el-obanı sevindirdi, qara kağızı gələnlərdən də ümidlər birdəfəlik üzülmədi, itkin düşənlərin valideynlərinin gözləri uzun illər yol çəkdi. Axırda həmı mövcud vəziyyətlə barışmaq məcburiyyətində qaldı. Müharibədən sonrakı dövrdə də rusların türk xalqlarına, o cümlədən bizə olan mənfi münasibəti müxtəlif yollarla davam etdi.

Nəhayət, 30 il avtoritar rejimə başçılıq eləyən İ. V.Stalin 1953-cü ildə bu dünya ilə vidalaşdı. Manqurdlaşmış insanların gözündə bu işıqlı dünyaya zülmət çökdü. Bu böyük imperiyanın vətəndaşlarının demək olar ki, hamısını dəhşət bürüdü, uşaqdan tutmuş ömrü sona yaxınlaşan ağsaqqallara. ağbirçəklərə qədər hamı,xoşbəxt gələcəyini itirmək qorxusunu, kommunizmə aparan ikinci bir rəhbərin ola bilməyəcəyi xofunu yaşadı.

Dünyagörüşü, təhsili zəif olan, doğulub boya-başa çatdığı kənddən kənara çıxmayıb, xarici aləmlə əlaqəsi olmayan, ona görə də hara iləsə, kimlərləsə müqayisə eləyib lazımı nəticə çıxarmaq təcrübəsindən kənar olan gül kimi tər-təmiz başlara zor bəla ilə doldurulmuş Lenin-Stalin nəzəriyyəsi, Stalin "böyüklüyü", Stalin "əvəzedilməzliyi", Stalin "müdrikliyi" öz məqsədyönlü, məhvedici işini görmüşdü.

Ömrü boyu bircə dəfə də ağlamaq nə olduğunu bilməyən dağ cüssəli kişilər də, cöhrəsindən müqəddəslik, paklıq yağan ağbirçək nənələr də, nə baş verdiyini dərk eləyə bilməyən körpələr də, müəllimləri ilə birlikdə şagirdlər də ürək dolusu hönkürtü ilə ağladılar.Ağlamaq istəməyəni, ağlaya bilməyəni də məcburən ağlatdılar. Axı ağlamamağa heç kimin cürəti, heç kimin ixtiyarı yox idi. Bütün bunlar uzun illər təlqin olunmuş kommunist ideologiyasının əks sədası idi.

Nəhayət 30 illik Stalin hakimiyyəti dövrü öz ömrünü sona verdi. Ölkə rəhbərsiz qala bilməzdi, təbii ki. qalmadı da. 1988-ci ilin məlum hadisələrinə qədər olan 35 ildə 6 rəhbər dəyişdik. Malenkov, Xruşşov, Brejnev, Çernenko, Andropov və Qorbaçov kimi rəhbərlər gördük. Kimisi az, kimisi isə çox

müddət rəhbər olan bu əldən ayaqdan düşmüş qoca, mənəvi və ya fizioloji xəstə, fiziki iş üçün yararsız dövlət başçılarına münasibətdə də öz əqidədən kənar olan əqidəmizdən əl çəkmədik. Növbə ilə, tez-tez dəyişən bu rusların, bu rəhbərlərin hamısını atamız, babamız, müdrik rəhbərimiz, Lenin yolunun sədaqətli davamçısı, dahi kommunizm carçısı, Azərbaycan xalqının böyük dostu kimi qəbul etməyə məcbur edildik O ki var tərifədik, bacardığımızdan da çox yaltaqlandıq, qarşılarında oynadıq-güldük, atıldıq-düşdük, məddahlığı özümüzə sənət seçdik, şit bir tərzdə mənimsədik, bir sözlə, nə başınızı ağrıdım, təlxəkliyin təlxəyə yaraşmayan pis formasında təlxəklik etdik.

Əlbətdə, mən keçmiş dövrlərdə sultanların, şahların. xaqanların, xanların yanında fəaliyyət göstərən təlxəklərin müqəddəs ruhları qarşısında baş əyib, üzr istəyir və tanrıdan onlara rəhmət diləyirəm.

O dövrlərdə hamı, hər arzu eləyən təlxək ola bilməzdi. Təlxək olmaq istəyənin böyük dünya görüşü, yüksək savadı, ali əxlaqi keyfiyyəti. qüsursuz dil qabiliyyəti, namuslu-qeyrətli, saf ailəsi olmalı idi. Təlxək öz ölkəsinin və qonşu ölkələrin və xalqların tarixini, ədəbiyyatını, incəsənətini, hərb və savaş elmini yaxşı bilməli, istənilən vəziyyətdən çıxış yolunu tapmağı bacarmalı idi. Təlxək yeri gəldikdə öz əqli, öz zəkası ilə hökmdara təsir etməli, onu əyri yoldan çəkindirməli və bu yolla öz xalqına, öz dövlətinə, öz hökmdarına kömək etməli idi.

Sarayda təlxək yeganə insan idi ki, ən qəddar, ən ciddi hökmdardan belə qorxusu yox idi. Hökmdarın onu cəzalandırmağa ixtiyarı çatmırdı. Çünki, təlxəklər düz danışırdılar. Əksinə, təlxəklər bütün saray əyanlarının gözü qarşısında sultana, şaha, hökmdara nə istəsələr deyərdilər, ilk baxışdan təhqiramiz görünən istənilən ifadəni işlədə bilərdilər. Çünki, onların istədiyi haqq olurdu, ədalət olurdu, hökmdarın, ölkənin və xalqın xeyrinə olurdu.

Bunun belə olduğunu yəqin etmək istəyirsinizsə, böyük Hüseyin Cavidin "Topal Teymur" və Səməd Vurğunun "Vaqif" dramlarını bir də oxuyub müvafiq təlxəklərin səviyyələrinə və tutduqları mövqeyə, dediklərinə və elədiklərinə bir

daha diqqətlə fikir verin, istəkli oxucular.

Bəli, biz də təlxək olduq, ancaq o təlxəklər kimi təlxək deyil, tamam başqa cür, başqa əqidəli, fərqli fikirli təlxək olduq. Vəzifəyə gəlib, samballı bir kresloda oturmaq xətrinə və yaxud tutduğumuz vəzifədən bərk-bərk yapışaraq, ondan ayrılmamaq xətrinə təlxək olduq. Şöhrət xətrinə, müftə qazanc xətrinə təlxək olduq. Möhtəşəm saraylar tiktirmək və onu əldən buraxmamaq xətrinə təlxəklik etdik. Kimisə vurmaq,kimisə kreslosundan ayırmaq xətrinə təlxək olduq. Nəhayət bu uzun keşməkeşli yolda bütün çətinliklərə, müxtəlif təhqirlərə, çeşidli alçaldıcı üsullara namərdliklə sinə gərərək, ancaq özümüzə məxsus təlxək olduq. Qoy əsl təlxəklər bizi bağışlasınlar. Amma, onların bizi bağışlayacağına inam varmı? Onların buna mənəvi haqları çatırmı?

Beləliklə müharibədən sonrakı 1988-ci liə qədərki dövr də arxada qaldı. Çox sular axdı, çox küləklər əsdi, dünyanın bütün bölgələri kimi Qaraqoyunlu da dialektikanın inkişaf qanununa muvafiq olaraq, özünə məxsus inkişaf yolu keçdi. Uşaqlar böyüdü, boyüklər qocaldı, həyat davam etdi.

Müharibə dövründə və ondan sonra dünyaya gələn körpələr böyüdü, oxudu, orta məktəbi bitirib, SSRİ-nin və doğma Azərbaycanımızın müxtəlif ali məktəblərinə daxil oldu, ali təhsil aldı. Bir çoxumuz təhsilimizi davam etdirərək, elmlər namizədi, elmlər doktoru olduq və müxtəlif sahələrdə, müxtəlif vəzifələrdə çalışdıq. Sovetlər birliyini gəzdik, müxtəlif xalqların adət-ənənəsini, yaşayış tərzini, inkişaf yollarını öyrəndik və onlarla öz ölkəmizi, öz xalqımızı, öz bölgəmizi müqayisə etmək imkanı əldə etdik.

Bu sırada olanlardan biri də mən oldum.

Doğma Azərbaycanımıza və Qərbi Azarbaycana, o cümlədən Göyçəyə, Qaraqoyunluya bilavasitə bələd olmağım Sovet İttifaqının müxtəlif bölgələrini yaxşı tanımağım, mənə bu bölgələri müqayisə etmək, onların inkişaf səviyyələri haqda müvafiq nəticələr əldə etmək imkanı yaratdı.

Bu imkandan istifadə edərək, Qaraqoyunlu, Göyçə, ümumiyyətlə Qərbi Azərbaycan haqda bildiyim, gördüyüm bəzi həqiqətləri həmin bölgələri yaxşı tanımayan və o bölgələr

haqda az məlumatı olan istəkli oxucuların nəzərinə çatdırmağı özümə mənəvi borc hesab edirəm.

1950-ci illərdə bütün Qərbi Azərbaycan elləri kimi Qaraqoyunlu və Göyçə də böyük tikinti meydanına çevrilmişdi. Az bir müddətdə Qaraqoyunlu kəndləriinin hamısında qayaların qırılmasından alınan daşlardan istifadə edilərək təzə evlər tikildi. 1960-cı ildə Qqaraqoyunlu kəndlərində demək olar ki, bir dənə də olsun köhnə ev qalmamışdı.

Dağın başında və ya ətəyində, magistral yoldan uzaqda və yaxud yaxında yerləşməsindən asılı olmayaraq kəndlərin hamısına rahat yol çəkilmişdi. Qışın qarlı-buzlu, çovğunlu-boranlı, yazın leysan yağışlı, çənli-dumanlı günlərindən asılı olmayaraq istənilən minik avtomobili ilə istənilən kəndə heç bir çətinlik çəkmədən, asan və problemsiz gedilirdi.

Qaraqoyunluda elektrik işığı ilə ən tez təmin olunan kəndlər Çaykənd və Gölkənd olmuşdur. 1951-1953-cü illərdə həmin kəndlərdə tikilmiş xırda su elektrik stansiyası vasitəsi ilə evlərə elektrik işığı verilmişdir. Az bir müddətdən sonra isə bütün kəndlər mərkəzləşmiş şəkildə dövlət tərəfindən elektrik işığı ilə təmin edildi.

Qaraqoyunluda təbii meşələrin olduqcu çox olmasına, camaatın yanacaq kimi odunla gen-bol təmin olunmasına və yanacağa ehtiyacları olmamalarına baxmayaraq, hər bir evə ardıcıl və mütəmadi olaraq, maye qaz verilirdi. Bu tədbir də çox mütəşəkkil təşkil olunmuşdu. Sakinlər boşalmış balonları evlərinin qabağına, yolun kənarına qoyurdular. Qrafik üzrə müəyyən günlər rayon mərkəzindən gələn qaz maşınları kəndin arasından keçərək boş balonları götürüb, yerinə dolu balonları qoyurdular.

Kəndlərin hamısında müvafiq avadanlıqlarla təchiz olunmuş gözəl məktəb binaları var idi. Hansı kənddə məktəb binasının necə olduğunu təsvir edib sizi yormaq istəmədiyimə görə, ancaq onu əlavə edirəm ki, mənim doğulduğum kənddə, yəni 1988-ci ildə 152 evdən ibarət olan Salah kəndində qırmızı tuf daşından yüksək zövqlə tikilmiş iki mərtəbəli gözəl məktəb binası var idi.

Təəssüf hissi və ürək ağrısı ilə deyə bilərəm ki, çox his-

səsini gəzdiyim Azərbaycan rayonlarının kəndlərinin böyük əksəriyyətində yuxarıda dediklərimi görməmişəm.

Məktəblərdə yüksək tələbkarlığa lazımı səviyyədə riayət eləyən peşəkar müəllimlər çalışırdı. Şagirdlərdə və valideyinlərdə təhsilə böyük maraq və qayğı var idi. Əlaçı şagirlərə böyük qayğı göstərilirdi. Əsil əlaçılar medalla təltif olunurdular. Qızıl və gümüş medala layiq görülmüş medalçılar, eləcə də bir çox əlaçı məzunlar heç bir kənar təsir olmadan, hər il yüksək bal toplayaraq müxtəlif ali məktəblərə daxil olurdular. Çünki, əlaçılar həqiqi əlaçılar, medalçılar,həqiqi medalçılar olurdular. Nəyə görəsə medal verilmirdi. Medal vermək üçün nə İrəvandan, nə rayon mərkəzindən heç kim, nə də məktəb direktorlarından heç kəs heç nə ummurdu, uma da bilməzdi. Çünki, vəzifəli şəxslərdə məsuliyyət hissi var idi. Hər vəzifəli özündən yuxarıda duran vəzifəlidən ehtiyat edirdi. Qanunun və vicdanın aliliyi heç olmasa müəyyən qədər gözlənilir, həqiqətə, doğruya, saflığa istər-istəməz kifayət qədər tabe olunurdu.

Ali məktəb məzunlarının bir çoxu təhsillərini davam etdirib, elmlər namizədi, elmlər doktoru elmi dərəcəsinə layiq görüldülər, alim oldular.

Təsədufi deyil ki. 1988-ci ildə ancaq kənddə yaşayanları nəzərə alsaq, cəmisi 300 ailədən ibarət olan Salah və Əmirxeyir kəndlərində dünyaya göz açmış olan 11 elmlər doktoru, 29 elmlər namizədi var. Bu rəqəm hər 7-8 ailəyə bir alim düşdüyünü və bu göstəricinin kifayət qədər yüksək göstərici olduğunu göstərir.

Bəli, istəkli oxucular, abad məktəbdə və münbit mühitdə peşəkar və savadlı müəllimlərin yüksək təhsil verməsi təbiidir, labüddür və qanunauyğundur. Başqa cür ola bilməz.

Hörmətli oxucular, Azərbaycan televiziyası bu ilin, yəni 2004-cü ilin yanvarında Bakının Şüvəlan qəsəbəsində və C-əlilabad rayonunda fəaliyyət göstərən uçuq-sökük, nəinki məktəb binasına, ümumiyyətlə heç nəyə yaramayan məktəb binalarını, otağa oxşamayan sinif otaqlarını, əllərində dəftərə, kitaba oxşayan nə isə tutmuş, reportyorların, müxbirlərin və düşdükləri acınacaqlı mühitin təsirindən məzlum görkəm

almış bəzi müəllimləri göstərdi.

Bu verilişdən bir-neçə gün sonra Azərbaycan televiziyası 1932-ci ildə tikilmiş Şəkidəki bir məktəbin tavanının uçduğunu. xoşbəxtlikdən tam təsadüf nəticəsində şagirdlərə ziyan dəymədiyini bildirdi.

Fikir verin hörmətli oxucular, 1932-ci ildə primitiv bir üsulla, primitiv formada tikilmiş bu bina əhalinin sayının dəfələrlə çoxaldığı, elmin, texnikanın müqayisə olunmayacaq dərəcədə inkişaf etmiş olduğu müasir dövrdə məktəb üçün nə dərəcədə yararlı ola bilər? Bu fakt elmə, təhsilə, gələcəyə neqatiıv münasibətin bariz nümunəsi deyilmi?

Çoxları kimi mənim də bir neçəsini tanıdığım, haqqında hələ heç nə yazılmamış, acınacaqlı vəziyyəti göstərilməmiş belə məktəblərin sayı yəqin ki, çoxdur.

Siyahıya alınmada bilavasitə doğma paytaxtımıza aid olan kəndlərdə belə məktəblər fəaliyyət göstərirsə rayonlardakı məktəblərin vay halına.

Nə isə, yüz minlərlə tamaşaçı kimi, mən də həmin televiziya verlişinə baxdım və haqlı olaraq mütəəssir oldum. Dərin bir təəssüf hissi keçirdim. Uzaq dağ bölgəsi olan, indi əlim yetib, ünüm çatmayan Qaraqoyunlu kəndlərinin o dövrdəki vəziyyətini indliki bu məktəblərin durumu ilə müqayisə etdim. Ürəyimdən bir sızıltı keçdi. Yazığım gəldi özümüzə.

Başı ərşə dirənən saraylarının üzü həmin məktəblərə tərəf baxan yekə qarın, boynu yoğun məmurların, mənəviyatı korlaşıb, özündən başqa heç kimi görməyən və nəticədə korlaşan, lallaşan vəzifə sahiblərinin sırtılmış sifətlərinə, padoşlaşmış üzlərinə heç olmasa az da olsa bir qızartı gəldimi?

Çox ehtimal ki, yox.

Qaraqoyunlu və Göyçə kəndlərinin hamısında lazımı avadanlıqlarla və dərman preparatları ilə təchiz olunmuş tibb məntəqələri fəaliyyət göstərirdi. Bu məntəqələrdə ali təhsilli həkimlər çalışırdı.

Bu yerləri tanımayan oxucuların nəzərinə onu da çatdırmaq istəyirəm ki, Qaraqoyunlu və Göyçənin kəndlərinin hamısı telefonlaşdırılmışdı. Demək olar ki, hər evdə telefon var idi və hər kəs öz evində oturub, nömrəni yığmaqla istəydiyi

yerlə, Sovet İttifaqının istənilən bölgəsi ilə, o cümlədən Bakı ilə danışa bilərdi. Amma, təssüf ki, nəinki Azərbaycanın ucqar rayonlarının kəndlərində, hətta Bakı kəndlərində də telefon rabitəsi demək olar ki, yox dərəcəsində idi.

1988-ci ilin məlum hadisələri ərəfəsində Fatmayi bağlarının ərazisində mənim də bağım var idi. Bəzi hallarda evlə telefon əlaqəsi yaratmaq lazım gəlirdi. Nə Fatmayidə, nə Novxanıda, nə də Mehdiabadda telefon tapmaq mümkün deyildi, çünki yox idi.

Kifayət qədər böyük kənd olan Mehdiabaddan 9-cu mikrorayonun yuxarı hissəsində yerləşən evimiz görünsə də, telefon olmadığından əlaqə yarada bilmirdim və evə gəlməyə məcbur olurdum. Əlbəttə, heç bir tərəddüd etmədən çoxları bu deyilənləri təsdiq eləyə bilər.

Acınacaqlı olsa da, ürəyimizcə olmasa da, belə vəziyyətin yaranmasını istəməsək də, Ermənistanın daha sürətlə, daha keyfiyyətli, daha hərtərəfli inkişaf etdiyini deməyə məcburuq. Bu acı həqiqəti nəzərə alaraq, düşmənin üstünlüyünü qeyd etməyim mənim günahım sayılmamalıdır. Sübut, dəlil budur və bundan istəsək də qaça bilmərik.

Düşmənin həm üstün, həm də çatışmayan cəhətlərini öyrənməyi və obyektiv qiymətləndirməyi bacarmalı və müvafiq nəticə çıxarmalıyıq.

Qalib gəlmək, inkişaf etmək, güclənmək, məqsədə nail olmaq üçün həm öz gözümüzdəki, həm də düşmən gözündəki tükü görməyi bacarmalıyıq. Çalışmalıyıq ki, öz gözümüzdəki tükü daha tez, daha aydın görək.

Amma nə etməli? Sən saydığını say, gör fələk nə sayır? -deyib atalar.

Bütün qərbi Azərbaycan elləri kimi, nəzərinizə çatdırdığım durumda olan Qaraqoyunlu və Göyçə də bir günün içində öz doğma yurdundan, elindən-obaşından didərgin düşdü, qaçqın, köçkün oldu, yurdu ola-ola yurdsuzlaşdı.

Bu hadisələr haqda mavi ekranlarda, radio dalğalarında, qəzet, jurnal və kitab səhifələrində çox göstərilmiş, deyilmiş. yazılmışdır və bu proses hələ uzun müddət davam edəcəkdir.

Mən isə 1988-ci lidəki Qaraqoyunlu kəndləri haqda bəzi

məlumatları növbəti cədvəl vasitəsilə nəzərnizə çatdırıram, istəkli oxucular.

**Q a r a q o y u n l u k ə n d l ə r i h a q d a 1988-ci ilə aid olan bəzi məlumatlar.**

| Kəndin adı | Tayfaların sayı | Evlərin sayı | Kənddə yaşayanların sayı | Kənddən olub,kənarda yaşayanların sayı | Elmlər doktorlarının sayı | Elmlər namizədlərinin sayı | 1941-1945- ci il müharibə-sində həlak olanların sayı | Qarabağ müharibəsin- də şəhid olanların sayı |
|---|---|---|---|---|---|---|---|---|
| Gölkənd | 26 | 48 | 2800 | 1350 | 2 | 26 | 97 | 10 |
| Çaykənd | 22 | - | 1110 | - | 3 | 15 | 85 | 8 |
| Əmirxeyir | 12 | 86 | - | - | 6 | 12 | 20 | 2 |
| Bəryabad | 87 | 45 | - | - | - | 3 | 14 | 2 |
| Cıvıxlı | 81 | 60 | - | - | - | - | 7 | 3 |
| Qaraqaya | 22 | 66 | 260 | - | - | 5 | 18 | - |
| Yanıqpəyə | 11 | 100 | 534 | 600 | - | 10 | 17 | 6 |
| Salah | 13 | 152 | 1004 | - | 5 | 17 | 37 | 5 |
| Polad | 45 | 129 | 950 | 980 | 2 | 8 | 38 | 8 |
| Alaçıqqaya | 5 | 75 | 375 | 125 | - | 2 | 9 | 1 |
| Ağkilsə | 5 | 20 | 138 | 260 | - | 1 | 7 | 4 |
| Murteyil | 5 | 24 | 210 | 200 | - | 3 | 17 | 2 |
| Haqqıxlı | 17 | 180 | 800 | 700 | 1 | 8 | 57 | 8 |

Yuxarıda yazılanlardan və cədvəldəki rəqəmlərdən aydın olur ki, Qaraqoyunlu 1941-1945-ci il müharibəsində 412 nəfər oğul itirmişdir.

1988-ici ildə 1650 ailədən ibarət olan Qaraqoyunlunun təx-minən bir o qədəri də Qaraqoyunludan kənarda, Azərbaycanda, Rusiyada və digər ölkələrdə məskunlaşmışlar.

Qaraqoyunlu xalqımıza 19 nəfər elmlər doktoru, 114 nəfər elmlər namizədi, yəni 133 nəfər alim bəxş etmişdir. Bu

göstərici yüksək göstərici hesab olunur və bölgənin inkişaf səviyyəsini əks etdirir.

Hesablamalar göstərir ki, Qaraqoyunlunun hər ailəsinə iki nəfərdən çox ali təhsilli mütəxəssis düşür.

Hər yerdə olduğu kimi Qaraqoyunlu kəndləri də irili-xırdalı müxtəlif tayfalardan ibarət olmuşdur. Bəzi tayfalar ancaq müəyyən bir kənddə, bəziləri isə müxtəlif kəndlərdə məskunlaşmışlar. Hər bir kənddə yaşamış tayfaların adlarını müəyyənləşdirmək istədik. Bu məsələdə də çətinliklərlə rastlaşsaq da müəyyən dərəcədə dəqiq və düzgün nəticə əldə etməyə çalışdıq.

1988-ci ilin sərt qış günündə qaçqın düşən qaraqoyunluların bəziləri bu çətin şəraitə dözməyərək yollarda, bəziləri isə mənzil başına çatıb yenicə qurmaq istədiyi, hələ lazımı dərəcədə isidə bilmədiyi yuvasında dünyasını dəyişdi. Qaraqoyunluların bəzi evladları isə ermənilərlə bilavasitə müharibədə qəhrəmancasına həlak olaraq, şəhidlik zirvəsinə yüksəldi. Elə oğullar oldu ki, amansız müharibə alovunda itkin düşərək şəhid oldu. Heç olmasa bir ziyarət yeri, qəbir evi məlum olmadı ki, istəyənləri üstə gedib təskinlik tapsınlar.

Qaraqoyunlunun kəndlərində tayfaların adları və Qarabağ müharibəsi ilə əlaqədar şəhid olanlar və itkin düşənlər haqda məlumatları nəzərinizə çatdırırıq, əziz Qaraqoyunlular.

**1.Alaçıqqaya.**

Alaçıqqayada dörd tayfa məskunlaşmışdır.Bunların adları belədir.

1.Elləzlilər
2.Şahniyarlılar
3. Qurbanlılar
4.Tatarlar

Qarabağ müharibəsi ərəfiəsində cavan gəlin olan ***Orucova Tahirə Eldar qızı*** ermənilər tərəfindən güllə ilə vurularaq. şəhid olmuşdur.

**2. Murteyil**

Kənd aşağıdakı beş tayfadan ibarət idi.

1. Budaqlılar
2.Elləzlilər
3.Şeydalar
4.Civallağılar
5.Məcihlilər

Kəndin şəhid olan iki sakinindən birincisi Tərtərdəki, ikincisi isə Xankəndindəki döyüşlərdə şəhid olmuşdur.

***1. Mustafayev Şahin Cəmşid oğlu***
***2. İsmayılov Yusif İsrafil oğlu***

**3. Ağkilsə**

Beş tayfa kəndin əhalisini təşkil etmişdir.

1.Rüstəmlilər
2.Arıxlılar
3.Şahmarlılar
4.Ocaqqulular
5.Şeydalar

Kənd aşağıdakı dörd oğlunu Qarabağ uğrunda müharibədə itirib.Bu şəhid olanlardan ikisi qardaşdır.

***1.Quliyev Fazil Əjdər oğlu***
***2.Quliyev Tağı Əjdər oğlu***
***3.Məmmədov Musa Alvız oğlu***
***4.Həsənov Saleh Hüseyin oğlu***

**4.P o l a d**

Kənd aşağıdakı on üç tayfadan ibarət olmuşdur.

1.Abdallılar
2. Budaqlılar
3. Şahmarlılar
4. Muradxanlılar
5. Fatalılar
6.Qasımlılar
7.Məcidlilər
8.Şeydalar
9.Tağılar
10.Seyidlilər
11.Qarayekələr

12.Qarabuludlular
13.Gülməmmədlilər

Kənd səkkiz nəfər şəhid vermişdir. Aşağıda onların şəhid olduqları döyüş bölgəsi də göstərilmişdir.

***1.Qəhrəmanov Rəhman Sadıq oğlu 1992-ci ildə Şuşada.***
***2.Abdalov Nadir Əsəd oğlu 1992-ci ildə Qazaxda.***
***3.Budaqov Mahir Əsəd oğlu 1992-ci ildə Laçında.***
***4.Qasımov Məhəmməd Əli oğlu 1992-ci ildə Qazaxda.***
***5.Tağıyev Həmid Əli oğlu 1993-cü ildə Zəngilanda.***
***6.Sarıyev Əli Mülkədar oğlu 1993-cu il Gülüstanda.***
***7.Zeynalov Elşad Vahid oğlu 1994-cü ildə Tərtərdə.***
***8.Rüstəmov Yaqub Rüstəm oğlu 1988-ci ildə İcevanda.***

**5. S a l a h**

Kəndin əhalisi aşağıdakı on doqquz tayfadan ibarət olmuşdur

1. Hasançalı
2. Talıblı (koranlı)
3. Qaradöşlü
4.Eçənli
5. Əlləzalılar
6. Tağılar
7. Xocalı
8. Bəyxanlı (Şollaqlı)
9. Göyçəli
10. Dəmirli
11. Məhəmmədalılar
12. Şöləli
13. Yunuslu
14. Çıvıxlı
15. Paşalar
16.Abdullalılar
17.Pirilər
18.Daqqahasanlı
19.Danaçılar

Qarabağ müharibəsində beş nəfər şəhid olmuşdur. Onlardan sonuncu ikisi itkin düşmüşdür.

***1.Göyüsov Ruslan Möysüm oğlu***
***2.Yunusov Qaraxan Allahverdi oğlu***
***3.Abbasov Eldar Kamal oğlu***
***4.İbrahimov Şərif Fəxrəddin oğlu***
***5.Qarayev Qələndər Vəli oğlu***

**5.Y a n ı q p ə y ə**

Yanıqpəyədə 12 tayfa məskən salmışdır.
1.Sərdarlı
2. Murğuzlu
3. Mancanlı
4. Qaramanlı
5. Tapdıqlı
6. Qaraəhmədli
7. Ramazanlı
8. Qaralar
9. Zeynallı
10. Qurbanalılar
11. Hacıçodarlı
12. Mamoylu
Kənd altı nəfər şəhid vermişdir.
***1.Bayramov Rakif Sarı oğlu***
***2.Zeynalov Şeyda Qaçaq oğlu***
***3. Zeynalov Ramiz Rövşən oğlu***
***4. Əhmədov Şaiq Arif oğlu***
***5.Hətəmov Yaşar Əliş oğlu***
***6. Xəlilov hicran Pirməmməd oğlu***

**6. Ç a y k ə n d**

Kənd aşağıdakı tayfalardan ibarət olmuşdur.
1.Osmanlar
2.Qaraəhmədli
3. Giləkli
4. Məşədilər
5.Mehdilər
6. Manquzular
7.Martlar

8.Damılar
9.Hətəmlilər
10. Tayırlılar
11. Molla Ayablılar
12.Qasımlılar
13.Təpə Kərimlilər
14.Zeynallılar
15.Hacı Məmmədlilər
16.Payızdoğanlar
17.Tatlar
18.Əfəndilər
19.Yaralılar
20.Qaracalar
21.Geçəllər
22.Oğrudərəlilər

Kənd səkkiz nəfər şəhid vermişdir.
***1.Qasımov Natiq***
***2.Qasımov Mehdi Bəzirgan oğlu***
***3.Əyyubova Mələk Əli qızı***
***4.Əyyubova Natavan Nəbi qızı***
***5. Qasımov Mutalib Sevil oğlu***
***6. Əfəndiyev Mübariz Qurban oğlu***
***7. Həsənov Binnət Nəcəf oğlu***
***8.Abdullayev Yusif Qacar oğlu***

**7. G ö l k ə n d**

Gölkənd 27 tayfadan ibarət olmuşdur.

Kəndin yarıdan çoxunu beş tayfa təşkil etmişdir. Cəmisi 265 evdən ibarət olan bu tayfalara Çıvıxlı, Qarayekələr, Alıuşağı, Gödək-alılar və Nurular aiddir. Çıvıxlı 110, Qarayekələr50, Alıuşağı 40. Gödəkalılar 35, Nurular isə 30 evdən ibarət olmuşdur.

1. Edilli -10
2.Qocalar -10
3.Pirilər -10
4.Alıuşağı -40 ev
5.Tağılar - 6

6.Nurular -30
7.Gödəkalılar - 35
8.Qaraəhmədli - 10
9.Mehdixanlı - 15
10.Aşırlı -20 ev
11.Pürüzlü -20
12.Sadıxlı -16
13.Mansırlı -17
14.Zəryarlı -10
15.Qarayekələr - 50
16.Marxallı - 5
17.Pirənli - 10
18.Nağdalılar - 5
19.Haqverdilər - 5
20.Xamoylu - 6
21.Qaraçuxalılar - 8
22.Molla Bayramlı - 7
23.Şükürlü - 15
24.Pəmbəkli-5
25.Zeynallı-5
26.Dındılılar
Kənd Qarabağ müharibəsində on nəfərini itirmişdir.
***1. Bayramov Əmir Oruc oğlu***
***2. Qocayev Xaqani Hacan oğlu***
***3. Qocayev Rafiq Kərəm oğlu***
***4. Musayev Ramil Novruz oğlu***
***5. Mustafayev Anar İbrahim oğlu***
***6. Hacıyev Əbülfət Talıb oğlu***
***7. Ramazanov Yolçu Bilal oğlu***
***8. Pirnəzərov Rizvan Məhərrəm oğlu***
***9. Məmmədov İkram Məsim oğlu***
***10.Əfəndiyev Zaman Əziz oğlu***
Bu şəhidlərdən İkram və Zaman itkin düşmüşlər.

**9. Ə m i r x e y i r**
Kənddə 13 tayfa yaşamışdır.
1.Alıuşağı (Cüyürlülər)

2. Dəmirlilər
3. Dümələlər
4. Nazlılar
5. Ayrımlar
6. Sarılar
7. Molla Yaqublu
8. Polular
9. Asdanalılar
10.Çapbağanlılar
11.Qacılı
12. Qələndərli
13.Osmanlar

Kənd əhalisi iki nəfər şəhid vermişdir.

***1. Əliyev Azər Nağı oğlu***
***2. Hacıyev Əzim Şura oğlu***

**10. Q a r a q a y a**

Kənddə aşağıdakı tayfalar məskunlaşmişdır.

1. Hacıçodarlı
2. Qaramanlılar
3. Qurbanalı
4. Zəryarlılar
5. Göyçəlilər
6. Əfəndilər
7. Düşməli
8. Qarabağlılar

Kənd şəhid verməmişdir.

**11. H a q q ı x l ı**

1980-cı illərdə kənd aşağıdakı 15 tayfadan ibarət olmuşdur.

1. Tatarlı
2.Kərimli
3.Tatrəhimli
4.Qaraqasımlı
5.Poylu
6.Şərifli
7.Dümbüllü

8. Qarabağlı
9.Şahnazarlı
10.Bayramlı
11.Naifli
12.Quleşli
13.Tülübaşlı
14.Sadıqlı
15.Söyünlü (Hüseyinli)

Kənd Qarabağ uğrunda müharibədə 8 nəfər itki vermişdir. İki ailənin hərəsi iki, dörd ailənin işə hərəsi bir oğul itirmişdir.

***1.Xasməmmədov Fazil Əjdər oğlu***
***2. Xasməmmədov Tağı Əjdər oğlu***
***3.Vəliyev Vəli Qara oğlu***
***4.Vəliyev Emil Qara oğlu***
***5. Məmmədov İsmayıl Həsən oğlu***
***6. Şahnazarov Hüseyinqulu Şamil oğlu***
***7. Zeynalov Rəşid Vidadi oğlu***
***8.Vəliyev Elxan Səməd oğlu***

**12. Ç ı v ı x l ı**

Kənddə yaşayanlar aşağıdakı tayfalardan ibarət idi.

1. Mansırlı
2. Qocalar
3. Tatlar
4. Vəlilər
5. Kirlilər
6. Məlikli
7. Allahyarlı

Kəndin Qarabağ müharibəsində itirdiyi evladları aşağıdakılardır.

***1. İsayev Marif Əhməd oğlu***
***2. Vəliyev Əhməd Vəli oğlu***
***3.Məmmədov Yaqub Oruc oğlu***

**13. B ə r y a b a d**

Bəryabadda 8 tayfa məskunlaşmışdı.

1. Şəmilli
2. Sarılar
3. Hasanalı uşağı
4. Asdanalılar
5. Hacı Usublu
6. Molla Yaqublu
7. Bozbayramlı
8. Qacılar

Qarabağ müharibəsində kənd iki şəhid vermişdir.

***1. Mahmudov Mehman Paşa oğlu***
***2. Şaxquliyev Elşən Nağı oğlu***

Verilən məlumatlardan aydın olur ki,1988-ci ildə 13 kənddən ibarət olan Qaraqoyunluda 1650 ev olmuşdur. Araşdırmalar göstərir ki, bundan bir qədər artıq Qaraqoyunlu ailəsi isə Qaraqoyunludan kənarda, əsasən Azərbaycanda, müəyyən qədər Rusiyada, ondan bir qədər az Müstəqil Dövlətlər Birliyinin digər respublikalarında, həmçinin Türkiyədə və bəzi Avropa ölkələrində yaşayırlar.

Məlum olur ki, Qaraqoyunluda irili xırdalı 150 tayfa məskunlaşmışdır. Bu tayfalar bir-birini çox yaxşı tanıyırdılar və çoxsunun qohumluq əlaqəsi var idi. Bunlarla yaxından tanış olduqda və tayfaların yaşlı nümayəndələrinin dediklərindən aydın olur ki, Qaraqoyunluda bir dənə də olsun fars və kürd mənşəli tayfa olmamışdır. Qaraqoyunlular qədim Oğuz türkləri olaraq öz mənşə və məişət saflıqlarını axıra qədər qoruyub, saxlamışlar.

Bu dəlil akademik B.Budaqovun istinad etdiyi mənbəyə əsaslanaraq Qaraqoyunlunun Çaykənd kəndində guya kürdlərin məskunlaşması haqda verdiyi məlumatın doğru olmadığını göstərir.

İstəkli oxucuların nəzərinə onu da çatdırmaq istəyirəm ki, uzun müddət Ermənistanın tabeliyində olmasına və erməni yaşayış məntəqələri ilə əhatə olunmasına baxmayaraq, Qaraqoyunluda bir dənə də olsun erməni ailəsi yaşamamışdır.

Bütün Qaraqoyunlu bölgəsində cəmisi bir rus ailəsi yaşayırdı. Gölkənddə poçt rabitəsi işinə xidmət eləyən bu ailənin

uşaqları tamamilə müsəlmanlaşmışdı, azərbaycan türkcəsini bizimkilər kimi bilir, rusca isə zəif danışırdılar. Ənənəmizi ürəkdən qəbul etmiş həmin ailənin mənim yaxın dostumla ailə quraraq Bakıda yaşayan qızlarından biri öz danışığında bəzən Ət Ağanın cəddinə and içirdi. Ümumiyyətlə erməni və ya rusla evlənənlərin sayı iki-üç nəfərdən artıq olmazdı.

Hər hansı obyektiv və ya subyektiv səbəbdən qızların başqa millətə ərə getməsi hadisəsi olmamışdır.

Beləliklə, öz saflığını saxladı, müqəddəsliyini qorudu, milli mənsubiyyətini uca tutdu, yaşadı, yaratdı, öyrəndi, öyrətdi Qaraqoyunlu, Göyçə. Günlərin bədnam bir günündə bu müqəddəs məkandan, bu doğma diyardan, bu ana vətəndən ayrı düşməyə, ulularıın ruhlarını narahat etməyə məcbur edildilər, Qaraqoyunlular, Göyçəlilər.

1988-ci ilin qarlı-şaxtalı bir qış günündə əbədi düşmən ermənilər tərəfindən qəddarcasına qovuldular, qarlı aşırımlar aşmalı, keçilməz yollar keçəməli oldular Qaraqoyunlular, Göyçəlilər. Tək qaldı təkləndi, səsinin eşidən, ününə çatan, harayna hay verən olmadı, dərmansız dərdə düçar oldu Qaraqoyunlu, Göyçə. Çox çətin bir şəraitdə öz Azərbaycanına pənah gətirdi, öz doğma xalqına sığındı, bütün Azərbaycana səpələndi Qaraqoyunlu, Göyçəli. Evladlarını ermsənilərldə vuruşmağa göndərdi və 59 nəfər şəhid verdi Qaraqoyunlu.

İstəkli oxucular,Qaraqoyunlu, Göyçə və borçalı ilə bir masa arxasında mən də oturdum və onların razılığı ilə oxuduqlarım. gördüklərim və eşitdiklərim haqda bildiklərimi, müxtəlif hadisələrə fərdi münasibətimi nəzərinizə çatdırmağa çalışdım. Nə dərəcədə nail olduğumu siz yaxşı bilərsiniz, əziz oxucular. Demək istədiklərimi deyim qurtardım. İndi söz Qaraqoyunluya, Göyçə və Borçalıya veriləcək. Onların deyəcəklərinin daha sərt, daha kəskin olacağını və bizi çox böyük günahlarla günahlandıracaqlarını bəri başdan duyuram. Buna onların haqqı var. Qaraqoyunlunun, Göyçənin, ümumiyyətlə Qərbi Azərbaycanın öz evladlıq borcunu yerinə yetirməyən evladlarının ünvanına deyə biləcəkləri ittihamları haqda siz də fikirləşin, əziz oxucular.



**Cıvıxlı kəndi**



# II hissə

## YANAR ÜRƏYİN POEZİYASI

İstedadlı şair, publisist, nasir və gözəl insan olan Eldar İsmayılın poetik nümunələrdən ibarət yeni bir kitabı bu yaxınlarda nəfis şəkildə nəşr olunaraq, oxucuların istifadəsinə verilib. Kitab "Mən burda qəribəm, yurd orda qərib" adlanır. İlk növbədə insanda zərif və niskilli duyğular yaradan bu ad məni özünə cəlb etdi. Tanışlıq məqsədilə və adətə müvafiq olaraq, kitabı götürüb əvvəlcə içindəkilər qeyd olunan son səhifəyə baxdım, sonra isə vərəqləyərək, təsadüfi rast gələn bəzi şerləri oxudum. Məlum oldu ki, kitabda vətənə, xalqa, dövrümüzün çoxsaylı səciyyəvi xüsusiyyətlərinə həsr edilmiş müxtəlif səpkili şerlər, satira, yumor, təmsil nümunələri və iki poema dərc edilib. Etiraf edim ki, ilk anlardan elə cəlb olundum ki, uzun müddət ondan ayrıla bilmədim. Bunun səbəbini aydınlaşdırmaq və ümumiyyətlə, kitab və müəllif haqda adi bir oxucu fikrini açıqlamaq və şersevərlərin diqqətinə çatdırmaq fikrinə düşdüm. Mən ixtisasca kimyaçıyam. Fikrimcə, istənilən əsər sadə oxucu tərəfindən ilk andan öz müsbət qiymətini ala bilmirsə, ona tənqidçilərin verdikləri və ya vermək istədikləri yüksək qiymət heç cür öz yerini tapa bilməz.

Təəssüf ki, əksər hallarda oxuduğumuz şerlərdə müəllifin nə demək istədiyini başa düşmək üçün xeyli fikirləşməli, götür-qoy etməli oluruq. Bunun səbəbi belə şerlərdə fikir anlaşılmazlığının, bir-birini inkar edən fikirlərin, yersiz söz və ifadələrin olması, bəzi sözlərin şerə qafiyə xatirinə daxil edilməsi ilə izah oluna bilər. Belə hallarda qədirbilən oxucu kitabı qapamaqla belə şairlərdən və belə şerlərdən canını qurtarır və azad nəfəs alır.

Ancaq Eldar İsmayılın təqdim etdiyi bu 261 səhifəlik kitabda elə bir şer, beyt, misra nümunəsi yoxdur ki, sözlər sadə olmasın, cümlələr bitmiş fikri ifadə etməsin, məqsəd aydın, anlaşıqlı olmasın və oxucunu öz axıcılığı, məzmun və məna

gözəlliyi ilə ağuşuna çəkməsin.

Közərən od və yüksələn tüstü ocağın varlığının təzahürü olduğu kimi, qəlb döyüntüsünün, beyin fəaliyyətinin təzahürü də səs, söz və yazı şəklində meydana gəlir, ərsəyə minir. Buna görə də bədii əsərlə müəllif şəxsiyyəti arasında müəyyən oxşarlıq, uyğunluq yaranır, əsəri oxumaqla müəllifi qiymətləndirmək mümkün olur.

Bunu nəzərə alaraq, kitabı oxumaqla onun müəllifinin kimliyini, hansı qayənin, hansı amalın, hansı istəyin, hansı vətəndaş və şairanə duyğuların sahibi olmasını, dövrümüzün hansı çalarlarından narahat olduğunu müəyyənləşdirmək istədim. Açığını deyim ki, "Mən burda qəribəm, yurd orda qərib" kitabını oxumaqla bu istəyə heç bir çətinlik çəkmədən nail oldum. Bu nailiyyət məni bir oxucu, vətəndaş, bir azəri türkü və nəhayət, bir ziyalı kimi məmnum etdi, sevindirdi.

Bəli, kitabı oxumaqla öyrəndim ki, əzəli Azərbaycan torpağı olan qərbi Azərbaycanda qədim Göyçə elinin çoxsaylı kəndlərindən biri olan gözəl, axarlı-baxarlı təbiətə malik Ağbulaq adlı bir kənd var. Kitabda həmin kəndə həsr edilmiş bir neçə şer var. Həmin şerlərdən aydın olur ki, şair həmin kənddə doğulub, kiçik ölçülü pəncərə kimi açılan həmin kənddən dünyaya baxıb və xoşbəxt insandır ki, bu kiçik pəncərədən böyük dünyanı görmək səadətinə nail olub. İndi doğma kənddən uzaqlarda yaşamağa məcbur olan şair:

Nə qədər ki, Eldar, sağam,
Vüqarımda bir Şahdağam,
Olmuşam və olacağam,
Sorağında Ağbulağın.

deməklə, doğma kəndə əbədi bağlılığını, daim həsrətində olduğunu bədii formada bildirib.

Qərbi Azərbaycanda bir Göyçə eli var. Sazlı, sözlü Göyçə. Göy gözlü Göyçə göllü, dağları, dərələri, çəmənləri, düzənləri, çiçəkli, güllü Göyçə, mənlikli, vüqarlı, dağlarının başı qarlı, indi isə doğmalarından, qoynunda boya-başa çatdırdığı evladlarından niskilli, intizarlı Göyçə. Qədirbilən,

qədri bilinən Göyçə, Alılı, Ələsgərli, Nəcəfli, Novrəs İmanlı, dinli-imanlı Göyçə...

Ulu Göyçə, ululardan ulusan,
Çəmənlisən, çeşməlisən, sulusan,
Ələsgərin gövhəriylə dolusan,
Dünya boyu bu xəzinən var olsun,
Bar gətirsin, bəxtin sənə yar olsun.

Ulu Göyçə, can demişəm bu ada!
Ağzım gəlib bu ad ilə min dada!
İnnən belə mən olmasam dünyada,
Hər gün məndən dağa-daşa salam de!
Bu dünyaya başdan-başa salam de!

"Ulu Göyçə" poemasından götürülüb bu nümunələr. Yalnız həqiqi insan və halal övlad öz elini, obasını bu səviyyədə sevə və tərənnüm eləyə bilər.

Göyçə ilə çiyin-çiyinə dayanan Qaraqoyunlu eli var idi. Bir-birinə hayan olardılar, bir ocaqdan köz götürüb, min yerdə ocaq qalardılar, gözləri tox, qəlbləri açıq, süfrələri bol idi. 1988-ci ildə, bir günün içində həmin el də öz ulu torpağını məcburən tərk etməli oldu.

Qaraqoyunlunu da qarış-qarış gəzmişdi Eldar İsmayıl. Göyçəni sevdiyi qədər sevirdi Qaraqoyunlunu. Qaraqoyunlu da onu sevirdi. Çünki o bu sevgiyə, bu istəyə layiqdir:

Polad qəm içində boynu bükülü
Salah, Qaraqaya durub mürgülü,
Çaykənd, Yanıqpəyə uçuq, sökülü.
İçimə od saldı Qaraqoyunlu.

Mən vətən yolunda harayam, ünəm,
Dağların çiyninə qonan bir çənəm.
Elə ki, söylədim Eldaram, mənəm,
Mənə layla çaldı Qaraqoyunlu.

deməklə Eldar İsmayıl Göyçə ilə yanaşı, həm də Qaraqoyunlunun evladı olduğunu incə, poetik dillə özü təsdiqləyir.

Göründüyü kimi, Eldar İsmayıl Ağbulağın, Göyçənin, Qaraqoyunlu elinin evladıdır.

Sovetlər Birliyi dövründə nəinki gedib ziyarət etmək, hətta Türkiyəyə tərəf baxmaq, heç olmasa radio dalğalarında türkcə nəyəsə qulaq asmaq belə qadağan edilmişdi. Bunu yaxşı xatırlayan və Naxçıvandan Türkiyə sərhəddini keçərək, İqdirə gələn şair, üzünü Vediyə tərəf tutaraq, ürək ağrısı ilə:

Vedidən baxırdım İqdirə bir vaxt,
Əlçatmaz, ünyetməz bir məkan kimi.
İqdirdən baxıram Vediyə bu gün,
Didərgin taleli bir insan kimi.

deyərək, sevinclə kədər arasında qaldığını bildirir, İqdirə gəldiyinə sevinir, Vediyə tərəf baxıb kədərlənir.

Bütün varlığında, qəlbinin başında Qarabağ dərdi gəzdirən Eldar İsmayıl

Gülüşündə xarı bülbül yaşayır,
Sən dinəndə "Süsən sünbül" yaşayır,
Böyük Rəşid, böyük Bülbül yaşayır,
Sən ah çəkdin, Şuşa düşdü yadıma

deməklə və yaxud,

Qayasına mən başımı qoyaram,
Torpağını al qanımla boyaram,
Dünya boyu sızıldayar bu yaram,
Xocalının dərdi haray, ay haray.

harayları ilə həm Göyçəli, həm Qaraqoyunlu, bütövlükdə qərbi Azərbaycanlı, həm də Şuşalı, Xoçalı və xalis Qarabağlıdı.

Eldar İsmayıl yaxın dostu aşıq Pəhləvan ilə Tehranda olarkən İran xəfiyyəsinin əməkdaşları onlara mehmanxanada, öz otaqlarında saz çalmağa, oxumağa icazə vermirlər. Onlar etirazlarını bildirirlər. Bundan xəbər tutan və həmin mehmanxanada müsafir olan bir nəfər, milliyətcə İran türklərin-

dən olan bir İran vətəndaşı onların yanına gəlib, öz dilimizdə - Azərbaycan türkcəsi ilə danışaraq, Təbrizdən gəldiyini, onlarla şərik olduğunu bildirir. Bu hadisədən təsirlənən şair:

Zilində həsrət görüşər,
Bəmində durna ötüşər.
Səsi Təbrizə yetişər,
Tehranda çalma dedilər.

və yaxud

Öz dilində dillən qardaş,
Dilinin qurbanı olum.
Təbriz adlı eldən danış,
Elinin qurbanı olum.

deməklə, İran dövləti üçün səciyyəvi olan hadisəyə öz münasibətini açıqlayaraq, sazın, sözün, ana dilinin millətin birliyinə, özünüdərkinə böyük təsir qüvvəsini sadə, aydın və poetik dillə oxucuya çatdıra bilib.

"Mən burda qəribəm, yurd orda qərib" kitabını oxuyanda aydın olur ki, Eldar İsmayıl həm Ağbulağın, həm Göyçənin, həm də Qaraqoyunlunun, Qarabağın, Zəngibasarın, Bakının, Milin, Muğanın, Şəkinin, Şirvanın, Təbrizin, Zəncanın, ümumiyyətlə, qüzeyli-güneyli, qərbli-şərqli bütün Azərbaycanın oğludur və o, bununla fəxr edir, özünü xoşbəxt sayır.

Eldar İsmayılın bir çoxlarından fərqli cəhəti var. Buna görə o xoşbəxt insandır. Çünki, Eldar İsmayıl özünün kim olduğunu yaxşı bilir. O, gözəl bilir ki, ulu Metenin, Oğuz xanın, dünyanı kiçik bir oyuncaq kimi əlində istədiyi qədər oynada bilən Atillanın, fatehlə fatehi Əmir Teymurun, Sultan Bayazidin, şah İsmayıl Xətainin nəvəsidir. O, bunu bilir və fəxr edir. Eldar İsmayıl xoşbəxt adamdır. Çünki onun Qaracaoğlan, Yunis İmrə, aşıq Veysəl və aşıq Ələsgər kimi aşıq-şairəəabaları olub. O, bunu bilir və haqlı olaraq fəxr edir.

Əlimdə qopuz,
Dilimdə Qorqud nəğməsi...
Qanımda Füzuli heyrəti,
Sabir işığı, Vaqif nəfəsi...

Beşiyimin qulağında
Ələsgər səsi...

Qopuz sazım,
Qorqud ulu əcdadım,
Füzuli soyum-soyadım.
Mən öz türklüyümlə
Ululardan uluyam...
Vaqif babamdı,
Atam Ələsgər,
Mən öz atamın obluyam.

Bəli, Qorqud nəğməli, Füzuli heyrətli, Sabir işıqlı Eldar İsmayıl bir çoxlarından fərqli olaraq öz babalarının nəvəsi, öz atasının oğludur.

Hər bir xalq və millət xalq və millət kimi formalaşmaq və əbədi ad qazanmaq üçün min illər formalaşma, millətləşmə, xalqlaşma dövrü keçmiş, millət,xalq adını qazanmışdır. Hər bir xalq, millət dünyada o ad ilə tanınmış, digərlərdən o ad ilə fərqlənmişdir.

Olduqca böyük zaman ərzində qazanıldığına və özünə möhkəm yer elədiyinə və dönməz xarakter aldığına görə, heç bir xalq, heç bir millət istəsə, də öz adını öz üzərindən götürə, başqalaşdıra bilməz.

Xalq, millət, dil, ərazi, adət-ənənə, milli mentalitet bir-biri ilə elə bağlıdır ki, onları bir-birindən ayırmaq mümkün deyil. Çünki, bunlardan birinin zəifləməsi o birilərinin də zəifləməsinə, birinini məhv edilməsi o birilərinin də məhvinə səbəb olur.

Təəssüf ki, ta qədimdən Türk olan və Türk adlanan biz 1937-ci ildən sonra birdən-birə dönüb Azərbaycanlı, 1992-ci ildə yenidən öz kökümüzə qayıdaraq Türk, bir az sonra isə bir daha Azərbaycanlı olduq. Buna uyğun olaraq dilimiz də istənilən vaxt istənilən adla adlandırıldı.

Belə çıxır ki, istənilən vaxt adi bir fərmanla biz istənilən millətə çevrilə, dilimizi istənilən dillə əvəz eləyə bilərik. Belə bir hadisə isə bəşər tarixində hələlik görünməmişdir.

Milli Məclisdə müzakirə zamanı millət vəkillərindən biri pasportda “Azərbaycan türkü” və yaxud “türk” yazılmasına ciddi etirazını bildirdi. Onun dedifinə görə bu azsaylı xalqlara hörmətsizlik, millətlər arasında ayrıseçkilik demək olardı.

Çox mənasız, yersiz və əsassız məntiqə əsaslanan bu qadının pasportundakı milli mənsubiyyət qrafasında çox ehtimal ki azərbaycanlı deyil, ləzgi yazılmışdır. Nə üçün Azərbaycanda milliyətcə rus, ləzgi, gürcü olan azərbaycanlı deyil rus, ləzgi, gürcü yazıla bilər, azərbaycan türkü isə mütləq azərbaycanlı yazılmalıdır? Həqiqəti başa salıb, onu düz yola qaytaran olmadı, biz düz yoldan qayıtdıq.

Bu qeyri-adi manqurd münasibətə şair

Atam türk, anam türk,
Soyadım, elim-obam türk.
Nənəm, babam türk, xalam, bibim türk,
Bütün əslim, nəslim türk canlı,
Mən isə Azərbaycanlı?!

deyə sual verir, heyrətlənir və təəssüf dolu etirazını bildirir.

Özünün də qəbul etdiyi və hər yerdə dediyi kimi istəkli şairimiz Eldar İsmayıl türkün nəvəsidir, türk oğludur, dünyaya türk olaraq göz açmışdır və bu aləmə türk gözü ilə baxır.

Təəssüflər olsun ki, bir çox bəlalara ducar olmağımıza səbəb milli birliyimizin pozulması, milli mentalitetimizin qorunmaması olmuşdur. Milli birliyə nail olmaq üçün isə milli mənsubiyyətə hörmət etmək, ona qəlbən bağlanmaq lazımdır. Bəs buna necə əməl edilir? Hörmətli şairimiz bu olduqca vacib və həyati əhəmiyyətli suala belə cavab verir:

Qeyrətə möhtacdır alınmaz qalam,
Beləcə başlayıb bu yurdda bəlam,
Erməni də olar, yezid də, balam,
Türk olmaq çətindi bu məmləkətdə.

Yadlar tufan kimi əsib gedərlər,
Doğmalar salamı kəsib gedərlər.

Türk desən biryolluq küsüb gedərlər,
Türk olmaq çətindi bu məmləkətdə.

Bəs nə üçün türkə türk olmaq çətin olur bəzən? Bu ictimai bəla, bu milli bədbəxtlik mənbəyi necə və hansı yollarla gəlib bəlaya salıb bu milləti, bu xalqı?

Müdir yaltaq olanda
Vay sərvətin dününə.
Molla yaltaq olanda,
Vay çənnətin gününə.
Alim yaltaq olanda,
Vay hörmətin gününə.
Şair yaltaq olanda
Vay millətin gününə.

Cavab birmənalı, aydın və düzgündür. Yaltaqların, sifətsiz çoxüzlülərin, məddahların, rüşvətdən başqa heç nəyi görə bilməyən mənəvi korların manqurd fəaliyyətlərinin nəticəsidir bunlar.

Bütün bu deyilənləri yaxşı dərk eləyən və səbəbkarları gözəl tanıyan şair dövrümüzün rəngarəng səciyyəvi xüsusiyyətini, dərd-sərlərini görür, bəzən gün kimi apaydın həqiqətlərə göstərilən laqeyd münasibətlərə acıyır, ağı qara, şirini acı, doğrünü yalan kimi qəbul edənlərin cəmiyyətə vurduğu mənəvi ziyanı duyur, ucuz, bayağı hisslərin və nəfsin qulu olanları, yersiz yerə ikiqat, dördbükük olaraq, bütün vücudu ilə əl çalanları, qulaq şellədib, diş ağardanları, saqqızdan tutmuş namusa, qeyrətə, hətta ölümə qədər hər şeyi satmağa hazır olanları acı nifrət hissi ilə damğalayır və bu ictimai bəlanı oxucunun nəzərinə çatdırır.

Yaxşıya əl çaldıq,
Pisə əl çaldıq.
Hər gələn, avaza
Səsə əl çaldıq.

Nə vaxt "qa" dedilər,
Biz də "qa" dedik.

Nə vaxt “qu” dedilər,
Biz də “qu” dedik.
döndük belə-belə tutuquşuna,
Başımız dəymədi əhlət daşına.

və yaxud

Torpaq da satırıq, kənd də satırıq,
Görün nə günlərə qalmışıq hələ
Qəbir də satırıq, gor da satırıq,
Ölüm də satırıq, satırıq, bəli!
Eşit Əzrayıl kişi,
Pulun varsa buyur.
Buyur keç irəli!...

Zamanın çoxşaxəli burulğanlarında yaxasını kənara çəkməyib,

Düşmən ayağında torpağım tapdaq,
Yurdum-yuvam tapdaq, ocağım tapdaq,
Günüm-güzəranım, növrağım tapdaq,
Məni kim qınasa haqlıdı vallah.

deyərək, vətəni üçün eləmək istədiyini eləyə bilmədiyinə görə özünü də günahkar sayır bu günahsız, vətənpərvər şair.

Ona gün kimi aydındır ki, türk özünə qaydanda böyük, qüvvətli, yenilməz olur. O, bilir ki, türkün dostu türk ola bilər və turk dünyasının nicatı, zəfəri türk oğlunun əli ilə olacaq.

Gün gələcək, vaxt yetəcək,
Ər oğullar atlanacaq.
Türk oblunun gücü ilə,
Düşmən iki qatlanacaq.
Gün gələcək köhlənimin
Od qopacaq dırnağından,
Yenə tüstü qalxacaqdır
Oğuzların ocağından.
Qaranlığın ölum hökmü,
Bir sehirli çıraqdadır,
Ey turk oğlu, sayıq dayan,
Zəfərimiz qabaqdadır!

Bəli, hörmətli şair tərk etməyə məcbur olduğu oğuz yurdunda türk oğlunun əllərilə zəfərlər çalınacağına, ocaqların qalanacağına, hər bacadan tüstü yüksələcəyinə haqlı olaraq inanır və bizi də inandırır.

Eldar İsmayılın yaradıcılığında vətənə məhəbbət uca göylərin məhvəri olan eşq kimi müqəddəsdir, vətənə məhəbbətsiz dünyanın dəyəri yoxdur. Bir gün məkanca Göyçəyə yaxın bölgələrdən birində olarkən Eldar İsmayıl böyük bir durna qatarının onun başı üzərindən keçərək Göyçə tərəfə getdiyini görür.

Durna qatarına həsədlə, Göyçəyə həsrətlə baxan şair doluxsunaraq:

Mən də qərib, sən də qərib,
Bu dərdimi qan, ay durna!
Göyçəmizdən keçər olsan,
Şahdağına qon, ay durna!
Qəbristanı gəz ahəstə,
Ruhlar qərib, ruhlar xəstə.
Qon anamın qəbri üstə,
Ağla, sızla, yan ay durna!

deyərək, oxucuları oyadır, reallığa qaytarır, düşündürür və kövrəldir.

"Mən burda qəribəm, yurd orda qərib" kitabında çoxsaylı şerlərdən götürülmüş, aşağıdakı ixtiyari nümunələrdə nə qədər incə duyğular, zərif hisslər, ahıllar üçün keçmişin xoş xatirələri, gənclər üçün isə gəncliyin xoş arzuları nəticəsində yaranan ürək döyüntülər olduğunu hərmətli oxucular özləri öz üzərlərində yaxşı hiss eləyə bilərlər.

Otağıma təşrif buyur,
Nur ələ qurbanın olum.
Sultanım ol, nazlı gəlin,
Hökm elə, qurbanın olum.

Gör başıma nələr gəlir,
Qəmimi qəmkeşlər bölür,

Bir şair dərdindən ölür,
Ver yola, qurbanın olum.

və yaxud

Bir gülüm var, səndən ötrü saxlaram
Qönçələnib açılmamış gəlimmi?
Bu şerimi yarpaq üstə yazmışam,
Dodaqlara sancılmamış gəlimmi?

De hardasan, ay quş kimi uçanım?
Eldarından uzaq düşüb, qaçanım?
Qocalırsan, qocalıram, ay canım,
Görüşünə qocalmamış gəlimmi?
Gözəl deyilib eləmi?

Bu yazıda oxucuların sərəncamına bəxş etdiyi tarixi romanlardan bəhs etmədən, satira, yumor, qəzəl yaradıcılığna toxunmadan, onlarla kitabın müəllifi olan sevimli şairimiz, nasirimiz, rublisistimiz Eldar İsmayılın ancaq bir kitabı haqda ötəri bir söhbət açdıq və bəzi fərdi münasibətlərimizi açıqlamaqla kifayətləndik.

Mənə belə gəlir ki, Eldar İsmayıl şəxsiyətinin və yaradıcılığının geniş tədqiqinə və təhlilinə ehtiyac duyulur. Yəqin ki, bu boşluq yaxın gələcəkdə doldurulacaqdır.

Hörmətli şairimiz Eldar İsmayıl həyatının və yaradıcılığının müdrik və məhsuldar dövrünü yaşayır. Bunu və Allahın verdiyi şairlik vergisini nəzərə alaraq, oxucuların ondan yeni-yeni əsərlər, o cümlədən teatrlarımızın səhnəsinə çıxacaq dram əsərləri gözləməyə ərki və haqqı var. Mən də bu istəklə əziz dostum və qardaşım Eldar İsmayıla böyük uğurlar arzulayıram.

## Aşıq, dərdin alım bir Dilqəmi çal

Bir neçə il əvvəl, gözəl günlərin birində, şəxsiyyətinə, etibarına, etiqadına, insani keyfiyyətinə hörmət etdiyim istəkli dostum, Tibb Universitetinin dosenti, fizika-riyaziyyat elmləri namizədi Elxan müəllim Muasyev ilk baxışdan heç nə ilə diqqəti özünə cəlb eləməyən, orta boylu, ağ saçlı, nurani üzlü bir nəfəri mənimlə tanış etdi:

Faiq müəllim, tanış ol Rüstəmlə, dağlar oğludu, Əskiparadandı. Əskipara dağlarından baxsanız Qaraqoyunlu və Göyçə dağlarını görə bilərsiniz. Şair qəlblidi, gözəl şeirləri var.

Sakitcə dayanmışdı Rüstəm. Əl verdik, görüşdük, heç adını da demədi, çünki, ehtiyac yox idi, bu adı artıq Elxan müəllim çəkmişdi.

Düzünü deyim ki, Elxan müəllimin onu şair kimi təqdim etməsi məni ilk andan o qədər də cəlb etmədi. Əvvəla ona görə ki, bildiyimiz kimi, hal-hazırkı dövrdə bacardı-bacarmadı xalqımızın bir hissəsi şeir yazmaqla, digər qismi xanəndəliklə və yaxud rəqs etməklə məşğuldur.

Deyilənlərdən, daha çox olan hissəsi isə savadından,, səviyyəsindən, dünya görüşündən, əlifbanı bilib-bilməməsindən asılı olmayaraq, "böyük" siyasət aləmindədir. Hələ çoxsaylı özəl ali məktəblərin məzunları və dinləyiciləri olan, öz adını, soyadını yaza bilməyən indiki və gələcək qırmızı diplomlu həkimləri, hüquqşünasları, iqtisadçıları demirəm.

Buna görə də Elxan müəllimin Rüstəmi şair kimi təqdim etməsi, onun şeir yazdığını qabartması, ilk anlardan məni o qədər də cəlb etmədi. Bir də ona görə cəlb etmədi ki, Rüstəm Qazax bölgəsinin oğlu idi, bu azmış kimi, dağlar qoynunda məskən salmış, cüyürlü-ceyranlı meşələrlə, durna gözlü bulaqlarla, qıy vuran qartallı qayalarla əhatə olunmuş, hal-hazırda isə düşmən əlində əsir-yesir olan Əskiparada dünyaya göz açmışdı.

Ona görə də Rüstəmin şeir yaza bilməsi təbii idi.

Sonralar tez-tez görüşdük, daha yaxından tanış olduq Rüstəmlə. Hər dəfə görüşdükdə, qarşımda qəlbi sözlə, köksü alovla -közlə dolu, sakit halda dərinliyi görünməyən dəryala-

ra bənzəyən, təlatümə, təbə gələndə isə qasırğalara dönən, ildırım tək çaxan, dağ seli tək axan, Kərəm olub yanan, Dilqəm olub qəmlənən, Koroğlu olub düşmən üstə şığıyan, olduqca istedadlı şair və əsil insan gördüm Rüstəmi.

Heç olmasa az bir qismi çoxlarına qismət olmayan bu qədər keyfiyyətlər cılız bir bədəndə necə kök salmışdı, necə yerləşmişdi və necə yuva qurmuşdu? Əlbətdə ki, bu tanrının ona verdiyi vergi idi.

Bir az keçdikdən sonra Rüstəm Namazoğlunun "Əksim param Əskiparam" adlı ilk və yeganə kitabı nəşr olunub, oxucuların sərəncamına verildi. Həmin kitabın birinin üstünə xoş sözlər yazaraq, mənə bağışladı şair. Kitab rəfimdəki ən qiymətli kitablardan biridir bu kitab.

Rüstəmi bilavasitə və yaxud şeirləri vasitəsilə tanıyan dostları yeri gəldikcə ondan söz salır, şeirlərini dilə gətirirlər.

Bir dəfə sazlı-sözlü bir məclisdə uşaqlıq dövrümüzü yada saldıq, ibtidai məktəb müəllimlərimizi andıq və onların böyük zəhmət və əzmlə bizə əlifba öyrətdikləri şirin xatirələrlə dolu keçmiş dövrü xatırladıq. "A" hərfini yadda saxlamaq üçün "ana","b" hərfini unutmamaq üçün "baba", "v" hərfi üçün isə vətən sözünü yazdığımızı göz önünə gətirdik. O dövrlə indiki dövrü müqaisə etdik.

Ana, vətən yaza-yaza, anamızı və vətənimizi sevə-sevə anamızdan və vətənimizdən ayrı düşdüyümüzün səbəbini araşdırmaq istədik. Ürəyimizdən qeyri-adi bir ağrı keçdi,, hamımız bir-birimizin üzünə baxıb, kövrəldik.

Elə həmin anda Rüstəmin bir şeiri yada düşdü.

"V" yazdıq vətəni satdıq, taladıq,
Analar ağlatdıq "A" yaza-yaza,
Dərin bilənləri dərin basdırdıq,
Can qurban eylədik ağlı dayaza.

Hər kolun dibində bir tələ qurduq,
Yarımız qoyunuq, yarımız qurduq,
Yollar bizi yordu, biz yolu yorduq,
Bəs hara gedirdik yol aza-aza.

Rüstəm, gah kədərli, gah da şən olduq,
Xeyirə xoruz olduq, şərə dən olduq,
Axırda hamımız goreşən olduq,
Sən mənə, mən sənə gor qaza-qaza.

Axtardığımız sualın cavabını tapdıq. Belə məlum oldu ki, ağlı dayazlara can qurban eləyib, məsul vəzifələrə gətirdik,, özümüzə yol göstərən, ağıl verən seçdik, ona görə də hansı yolla hara getdiyimizi bilmədik, xoruz olub xeyiri dənlədik,, özümüz isə şərə dən olduq, dənləndik. Nəticədə şər qalib gəldi, çoxaldı, öz işini gördü, vətən əldən getdi.

Bir dəfə yaxın dostlarla toy məclisində idik. Bir qədər yeyib-içdikdən sonra bir professor çalğıçılara bir dənə on-minlik ataraq:

- Yanıq Kərəmi çalın, oynayacağam, dedi.

Çaldılar. Meydan rəqs eləyənlərlə doldu. Professor isə xüsusi həvəslə oynayırdı. Bu yerdə dərd əhli olan bəzi həmkarlar heç nə demədən bir-birlərinin üzünə baxaraq, narazılıqlarını biruzə verməyə məcbur oldular.

Axı, Ziyadxan oğlunun nakam eşqinə ağlamaqmı lazımdı, oynamaqmı? Eşq əlindən yanıb-yanıb kül olan Kərəm yanğısına yanmaqmı lazımdı, oynamaqmı? Qara qəlbli qara Keşişin hiyləsinə nifrətmi lazımdı, oynamaqmı? Bu məqamda yerdə oturub dizləri qarına yığaraq, başı ikiəlli ovuc içinə alıb, bütün duyğuları tarıma çəkərək, duymaq, düşünmək, kövrəlməkmi lazımdı, yoxsa qol qaldırıb oynamaqmı?

Bu məqamda məclisdəkilərdən biri sürətli addımlarla masabəyiyə yaxınlaşıb, mikrofonu götürərək, böyük ustalıqla gözəl bir şeir oxudu. Bir-neçə bəndini nəzərinizə çatdırdığım həmin şeir də Rüstəm Namazoğlu qələminin məhsulu idi.

Millətin millətə divanıdı bu,
Yanıq kərəmiyə oynama gülüm.
Bəndənin Allaha üsyanıdı bu,
Yanıq Kərəmiyə oynama gülüm.

Çox qara Məliklər yallandı getdi,
Çox nazlı Əslilər sallandı getdi,
Onunçün başımız külləndi getdi,
Yanıq Kərəmiyə oynama gülüm.
Bizə yananların ruhları baxır,
Yanıq Kərəmiyə oynama gülüm.

Yuxarıda verilən sualların cavabını Rüstəmin yazdığı şeirdə tapdıq.

Dahi babamız Füzulinin 500 illik yubileyi yaxınlaşırdı. Bəzi yerlərdə elanlar vurulmuş, afişalar asılmışdı. Ancaq nədənsə mavi ekranlarda, radio dalğalarında qəzet və jurnal səhifələrində, kütləvi yığıncaqlarda elə bir canfəşanlıq, layiqli təbliğat hiss olunmurdu. Bunun səbəbini dəqiq deyə bilmərəm. Bir onu bilirəm ki, bizim bu dahi babamız salam vermişdi, rüşvət olmadığı üçün almamışdılar. O da məlumdur ki, ilahi eşq yolunda elə cəfa çəkib, o qədər dağlanmışdı və yerinə pambıq basılmışdı ki, bu müqəddəs vücud tamamilə ağ pambıqla örtülərək ölsə kəfənə, qalsa libasa çevrilmişdi.

Mənim bildiyimə görə hicrana üsyan eləyən Füzuli qanlı göz yaşlarını leysan kimi axıtmış, dərd-ələm harayı ilə xalqı oyatmışdı, öz qara bəxti isə oyanmamışdı ki, oyanmamışdı.

Yaltaqlıqdan, məddahlıqdan, rüşvətdən, vəzifəyə hərislikdən uzaq olmuşdu, indiki dövrün bəlası olan korrupsiya haqda hətta anlayışı belə olmamışdı ulu babamızın.

Bəli, çox sönük gedirdi yubileyə hazırlıq. Bunu nəzərə alan nəvə Rüstəm baba Füzuliyə müraciət etməli olmuşdu. Qaçqın, köçkün ömrü yaşayan nəvə günümüzün həyat həqiqətlərini, danılmaz gerçəkliklərini incə yumor dili və ağır ürək ağrısı ilə dahi yubilyara çatdırmaq, onu bəzi əhvalatlarla məlumatlandırmaq istəmiş, bununla bağlı öz fikirlərini də söyləmişdi.

Baba, get gəz özün üçün kef elə,
Qara bəxtim oyananda gələrsən.
BMT-dən, ATƏT-dən ayıbdı,
Zülm ərşə dayananda gələrsən.

Ermənilər gözümüzə mil çəkib,
Belə dərdi dəvə çəkib, fil çəkib,
Millət nə vaxt əl çalmaqdan, əl çəkib,
Bala-bala haqq qananda gələrsən.

Mən Rüstəməm dövlət varım var baba,
Düzdə zəmim dağda qarım var baba,
Gözün aydın, qul bazarım var baba,
Dollar topla pullananda gələrsən.

Ulularının uyuduğu torpağa, dünyaya göz açdığı Əskiparasına həsrət qalan Rüstəm Namazoğlunu zaman Yanıq Kərəmiyə, Dilqəmiyə kökləmişdi. Məna dolu dərin düşüncə, keşməkeşli çalarlarla dolu hikmət onun ömrünə, iç dünyasına hopmuşdu. Sazlı-sözlü məclislərdə mütləq Dilqəmini istəyirdi. Dilqəmi çalındıqda bəzən məclisdəkilərdən biri sazın sızıltıları altında Rüstəmin "Dilqəmi çal" şerindən bir-neçə bənd deyər, məclisdəkiləri əməlli-başlı kövrəldərdi.

Payıma el dərdi, el qəmi düşüb,
Tufana yelkənsiz bir gəmi düşüb,
Mənim də bəxtimə Dilqəmi düşüb,
Yenə yurd yerində dolanır xəyal,
Aşıq, dərdin alım bir Dilqəmi sal.

Hörmətli oxucular, bilmirəm 12 bənddən ibarət bu şeirin hansı bəndini yaxşı nümunə kimi seçib, sizə təqdim edim. Məsələn,

Ovundurmur büllur saraylar məni,
Gözləyir hər həftə, hər aylar məni,
Anamın məzarı haraylar məni,
Qoy simlər hönkürsün, həşər olsun lal,
Aşıq, dərdin alım bir Dilqəmi çal.

bəndinimi və yaxud,

Ömürün yolları yağılı imiş,
Həyat nə şirinli, ağılı imiş,
Dünya Məlikməmməd nağılı imiş,
Kimə qalacaqdı bu cahi-cəlal?
Aşıq, dərdin alım bir dilqəmi çal.

bəndini və bundan sonra gələnlərin hamısını?

Sazın-sözün sərrafı olan poetik duyğular, incə hisslər ustası Rüstəm Namazoğlu aşıq Zülfiyənin böyük məharətlə ifa etdiyi "Göy-Gölə gəl" mahnısını dinləyib, məftun olur və bu dəvətə əməl edərək, dərhal, yubanmadan görüş yerinə-Göy-Gölə gəlir. Zülfiyə xanımı görüş yerində görməyən şair pərişan olur və onun ünvanına:

Eşitdim səsini Zülfiyə xanım.
Oxşatdım bağçada bülbülə gəldim.
Canıma od saldı Səməndər kimi,
Gərdim qanadımı ağ yelə gəldim,
Zülfiyə gəl dedi, Göy-Gölə gəldim

deməklə bu görüş naminə bütün cəfalara məmnuniyyətlə sinə gərəcəyini bildirir.

Göy-Göl şairi leysanlar ələməklə, göy gurultuları ilə,, ildırım çaxısı ilə, dumanla, çənlə qarşılayır.

Bir qədər təşviş keçirən, təbiətin bu şıltaqlığından bir az da qorxan şair ətrafındakıların-güllərin, çiçəklərin, xallı marallarıń, alagöz ceyranların, gözəl-göyçək cüyürlərin də ondan yaxşı vəziyyətdə olmadıqlarını görür. Bir-bir onlara yaxınlaşıb, əhvallarını soruşmaq, könüllərini almaq, dözüm və səbr arzulamaq, həm də Zülfiyənin yerini öyrənmək istəyir.

Əhvalın soruşdum, ax! dedi nərgiz,
Dedim hüsnün göstər, bax dedi nərgiz,
Səni soraqladım, yox dedi nərgiz,
Dedim qısqanırmı gül-gülə gəldim,
Zülfiyə gəl dedi, Göy-Gölə gəldim.

Görüş yerini özü seçmişdi. Bəs niyə gəlməyib? Bəlkə gəlib? Bəlkə onun yerini nərgiz bilir, amma şairi aşığa qısqandığına görə demir. Bəs bənövşə?

Qəlbimi kamantək çaldı bənövşə,
Dinmədi, elə bil laldı bənövşə,
Boylana-boylana qaldı bənövşə,
Yüklədim dərdimi bir filə gəldim.
Zülfiyə gəl dedi, Göy-Gölə gəldim.

Kəpəzin böyüklüyündən, əzəmətindən və gözəlliyindən zövq alan, bağrı qara xallı lalənin pərişan duruşundan təsirlənən şair sözə və işə keçir.

De dağ tapılarmı Kəpəz dağıtək?
Dolandım belinə göy qurşağıtək,
Lalənin boynuna boyunbağıtək,
Düzdüm göz yaşından silsilə gəldim,
Zülfiyə gəl dedi, Göy-Gölə gəldim.

Bəli, Kəpəzin belinə göy qurşağıtək dolanan şair lalənin könlünü almaq üçün onun boynuna dünyanın ən istedadlı zərgərlərinin böyük həvəslə yaratdıqları silsilə adlı boyunbağı taxır. Bu da kömək etmir. Zülfiyəni gördüm deyən olmur.

Axtardığını tapmayan, arzusuna çatmayan, niskili ilə təkbə-tək qalan, xəyallar aləminə dalan dərdli-ələmli, qadalı-qəmli şair mamırlamış böyük bir daşa söykənib, dərd dəryasına qərq olur.

Bir daşa söykənib, xəyala daldım.
Keçən günlərimi yadıma saldım,
Kövrələ-kövrələ Dilqəmi çaldım.
Neyləyim, gah bəmə, gah zilə gəldim,
Zülfiyə gəl dedi, Göy-Gölə gəldim.

Onsuz da dərddən, qəmdən, ahdan-ələmdən və Dilqəmiyə, Kərəmiyə köklənməkdən başqa heç nəyi olmayan Rüstəm gördüyü, tanış olduğu dərdlilərin dərdlərini azaltmaqdansa, əksinə, dərd yükləri üzərinə bir az da dərd əlavə eləyərək, pərişan bir vəziyyətdə geri qayıdır.

Gördüm nə Kərəm var nə lələ dağda,
Verdim bir maralla əl-ələ dağda
Dərd yükü yığmışdı bir şələ dağda,
Mən də yığdım üstən bir şələ gəldim,
Zülfiyə gəl dedi, Göy-Gölə gəldim.

Sonralar şairin aşıq Zülfiyə ilə görüşüb-görüşmədiyi, bu xoşbəxtliyin ona nəsib olub-olmaması haqda məlumatım

yoxdur. Bu yaxınlarda aşıqla görüşüb, bunu aydınlaşdırmaq və oxucuların nəzərinə çatdırmaq istəyim vardır.

Adətən, dostlar, tanışlar, qohum əqrəbalar görüşdükdə: nə var, nə yox, işin necədir, bu dünyadan ağlın nə kəsir?-deyə soruşur, hal-əhvallaşırlar.

Müxtəlif vaxtlarda müxtəlif adamlar tərəfindən verilən eyni suala Rüstəmin verdiyi müxtəlif cavablardan bir hissəsini nəzərinizə çatdırırıq.

Soruşursan qaçqın halın necədi?
ATƏT məclisindən gələndən soruş.
Başımın altına yəhər qoymuşam,
Üstümə çəkdiyim palandan soruş.
Gündə yüz yol üzümüzə oxunan,
Quyruqlu, quyruqsuz yalandan soruş.

Biri MİP olubdu, biri YAP olub,
Deyilənlər hərbə-zorba gop olub.
Ağalar hücumçu, qullar top olub
Döşəyirlər, bəndi-bərəsi yoxdu.
Bircə daş üstündə min baş gedibdi,
İndi bir ölkənin parası yoxdu.

Qardaşı xeyli vaxtdı dünyasını dəyişib,əbədiyyata qovuşmuşdu Rüstəmin. Kəndə, anasının əbədi yuxuya daldığı Əskiparaya gəlmək istəyirdi şair. Ona görə də əvvəlcə qardaşına xəbər göndərib, hazırlıq görməyi xahiş edirdi.

Nə istəyirdi Rüstəm?

Noylu bulağın üstünü, anasının öz əli ilə hazırladığı fətir, pendir, şor, bulama, qaymaq və göl yağlı xəngəl istəyirdi Rüstəm. Xəzəz, gorgodan, xımı, qulançar, köbələk, qazanqulpu, doydabanı, danaqar, quzuqulağı istəyirdi.

Gəlib bir qədər oynatdıqdan, öpüb oxşadıqdan sonra buraxmaq şərtilə, balaca bir cüyür balası da tutmağı arzulayırdı Rüstəm.

İçərisinə bir az buz qatılmış bir ovuc qar da istəyirdi.

Qardaş məni gözlə Əskiparada,
Əllidə gəlmədim, yüzdə gələcəm.

Uşaqlıqdan sevməmişəm payızı,
Baharda gələcəm, yazda gələcəm.

Bütün bu deyilənlərdən savayı dərd bilən, söz anlayan dostları yığmağı, geciksə telli sazı sinəsi üstə alıb kövrələ-kövrələ Dilqəmi çalmağı məsləhət görürdü Rüstəm.

Görünür ki, arzusuna çatacağına inamı yox idi şairin. Ona görə də:

Rüstəməm arzuma çatmaq üçün mən,
Süsənə, sünbülə batmaq üçün mən,
Anamın yanında yatmaq üçün mən,
Bürünüb beş arşın bezdə gələcəm.

deməyə məcbur olur Rüstəm.

Arzusunu yerinə yetirə bilməyən şair anasına üz tutur, ürəyindəkiləri ona açır, ondan kömək istəyir.

Gələmmirəm düşmən kəsib yolumu,
Ah-naləmi o dağlara yay ana.
Qalın yayma küt getməsin dərdimi,
Yuxa kimi nəzik-nəzik yay ana.

Bu mən Rüstəm, bu da dövlət, bu da mal,
Yolda qaldım, qoca köhlən, sınıq nal,
Dözəmmirəm ürəyimdən nişan al,
Bu kamandır, bu ox, bu da yay ana.

"Qalın yayma küt getməsin dərdimi" misrasının mənasını qolunu çırmayıb xəmir yoğuran, müəyyən müddət gözləyərək yetişdirdikdən sonra kündələyib, çörək bişirən ananın müqəddəs qucağında böyüyənlər, dizinin üstə oturub həmin çörəkdən yeyə-yeyə xoşbəxt günlərini yaşayanlar, ətəyindən yapışıb yerimək öyrənənlər, ata ocağının bərəkəti ilə boya-başa çatıb kamilləşənlər bilər.

Son zamanlar vaxtsız-vədəsiz xəstələnmişdi Rüstəm. Hələ cavan olmasına baxmayaraq, gözləri işığını amansızcasına itirirdi. Bir yandan isə dünya işığına həsrət qalmaq ehtimalı bir-birinə qarışmışdı. Dərdə dərman yaradandan gələ

bilərdi. O isə ancaq bildiyini eləyirdi. Etdiyi isə göz qabağında idi.

Buna görə də naçar şair əvvəlcə fələyə üz tutub, etirazını bildirir.

Fələk, məni soğan kimi.
Soymaq nə, ağlamaq nədir?
Dırnağı ətdən ayırıb,
Üfürüb, bağlamaq nədir?

Ömrü özümdən aldın,
Taqəti dizimdən aldın,
Qisası gözümdən aldın.
Belə kin saxlamaq nədir?

Bir ev tikdim qala kimi,
Sökdün mıxa, nala kimi,
Sonra doğma bala kimi,
Öpüb qucaqlamaq nədir?

Haqlı gileydi. İgid basdığını, mərd yendiyini kəsməz deyib atalar. Yaratmısan yaşat, yaşatmırsan əzab-əziyyətsiz bu dünyadan köçür. Niyə dırnağı ətdən ayırırsan, sonra isə ağrısına dözmək üçün üfürürsən, nə üçün gözümün qabağında evimi özülünə qədər dağıdır, özümü isə qucaqlayıb öpürsən? Sənin güclü, qüdrətli olduğunu kim bilmir ki? Gücünə arxayın olub yıxdığın bəs deyilmi ki, üstəlik tapdalayırsan da.

Rüstəmin yaradıcılığında bir çox şairlərə xas olmayan sahəyə-bayatılara xüsusi yer verilmişdir.

İnsafın hanı loğman,
Gəl tökmə qanı loğman,
Vətən dərdi olanın,
Yoxdu dərmanı loğma.

Əzizim Gəncəyə bax,
Şəkiyə Gəncəyə bax,
Yarəb, quzunun şirə
Vurduğu pəncərəyə bax.

Belə bayatı nümunələri zamanın rəngarəng ağrısını qəlbində gəzdirən Rüstəm kimi şairlərin qələminin məhsulu ola bilər.

Əzizim Qarabağda,
Dolan gəz Qarabağda,
Qəbrim Xırdalandadı,
Ürəyim Qarabağda

demişdi bayatılarının birində Rüstəm. Elə də oldu. Amansız xəstəlik öz işini gördü. 2001-ci ildə dünyasını dəyişən Rüstəm Xırdalanda torpağa tapşırıldı. Sinə daşının üstündə özünün yazdığı şeirdən bir bənd həkk olundu.

Əgər beş-on kəlmə sözün qalmasa.
Ocağın qalmasa, közün qalmasa,
Bu qoca dünyada izin qalmasa,
Yüz il də yaşasan, yaş bada gedib.

Allah sənə rəhmət eləsin Rüstəm. Hərdənbir dostların yığışanda ruhunu şad etmək üçün Dilqəmi çaldırırlar. Özün getdin sözün qaldı, ocağın-közün qaldı, həyatda izin qaldı, ömrün bada getmədi. Torpağın nurla dolsun.

## NİYƏ AĞARMIRSAN

Bir məclisdə yaşının altmışı haqlamasına baxmayaraq, saçının qap-qara olmasına və ağarmamasına görə fərəhləndiyi aydın görünənbir kişinin hərəkətləri ətrafındakıların diqqətini cəlb etdi.

Yanımda oturan həmkarım ona münasibətimi öyrənmək istədi.

Saç insanla bərabər doğulur dedim. Müəyyən yaşa çatdıqda ağarmalıdır. Ağarmırsa, ya saç sahibinə etibarsız olur, ya da sahibinin onu ağartmaq qabiliyyəti, yəni əsl insani keyfiyyətləri çatışmır. Bu səbəbin ikisi də yolverilməzdir.

Həmsöhbətim dərhal soruşdu ki, bəs sizin saçınız ağarmasaydı özünüzü necə hiss edərdiniz?

Mənim saçımın ağarmaması mümkün deyildi, o ağarmaya bilməzdi dedim. Biz biri-birimizi yaxşı başa düşürük. Əgər ağarmasaydı ondan inciyər və ciddi iradımı bildirərək, deyərdim:

Əgər ağardırsa qəm, qüssə, kədər,
Bəs sən ağarmırsa niyə saçlarım?
Məndən çox kiçiklər çoxdan ağardıb,
Nəyə arxayınsan, nəyə saçlarım?
Niyə ağarmırsan, niyə saçlarım?

Qoşa yaranmışıq, qoşalaşmışıq.
Dar gündə, gen gündə, cüt dayanmışıq.
Bərabər alışıb, birgə yanmışıq,
Namus deyə, qeyrət deyə saçlarım?
Niyə ağarmırsan, niyə saçlarım?

Səxavət, sədaqət, hikmət bilməyən,
Bircə dəfə dost dərdini bölməyən,
Ömrü boyu halal nemət yeməyən,
İstəyir bir xalqı yeyə saçlarım,
Niyə ağarmırsan, niyə saçlarım

Fil çəkməz dərdləri çəkirəm indi,
Hər gün qəm şərbəti içirəm indi,
Xeyiri şərdən sərrast seçirəm indi,
Ahdan alov qalxır göyə saçlarım,
Niyə ağarmırsan, niyə saçlarım

Faiq müəllim sinəndədi el dərdi,
Dərdə dərman bizim dustaq eldədi,
Görürsənmi bircə namərd min mərdi,
Necə qovur döyə-döyə saçlarım?
Niyə ağarmırsan, niyə saçlarım?

## NECƏ OLMALIYAM?

Köhnə qonşularımdan biri ilə rastlaşdım. Orta məktəbin səkkizinci sinfini bir təhər bitirdikdən sonra alverlə məşğul olur. Enli kürək, hündür boy, dildən pərgar adamdı.

Nə var, nə yox, işin necədir, necə dolanırsınız, Faiq müəllim? dedi.

Razılığımı bildirdim. Mən də bütün ziyalılar kimi dolanıram, buna da şükür dedim. Qonşum böyük razılıq hissi ilə özü haqda məlumat verdi.

Aeroportdakı yarmarkada yerim var. Yoldaşım da qoçaq qadındır. Türkiyədən, Dubaydan mal gətirib satırıq. İndi qızım da kömək eləyir. Şükür Allaha, hər şeyim var, heç nədən narazılığım yoxdur dedi və Siz yaxşı adamsınız, amma, nədənsə bir cür görünürsünüz, gərək başqa cür olasınız deyə sözünü yekunlaşdırdı.

Şairlikdən çox-çox uzaq olmağıma baxmayaraq, qonşuma belə bir şerlə cavab vermək fikrinə düşdüm.

Dedin nə var, nə yox, işin necədir?
İş var mənа yoxsa, necolmalıyam?
Sağımda, solumda, dörd bir yanımda,
Qəm sevincdən çoxsa necolmalıyam?

Əzəldən belədi dünyada qayda,
Nadan nəsihətdən götürməz fayda,
Elin yarsı burda, yarsı o tayda,
Dövran dönük çıxsa necolmalıyam?

Ulaq belindəsə qızıldan yəhər,
Çula layiq görülübsə boz kəhər,
Söyüdün adına yazılsa bəhər,
Düz ac, əyri toxsa necolmalıyam?

Yaxşı bax bizlərə çəkilən dağa,
Təbriz, Dərbənd çoxdan düşüb uzağa,
Aran Qarabağda, dağ Qarabağa,
Xalq həsrətlə baxsa necolmalıyam?

Neyləyək belədi zamanın üzü.
İşin düz gətirməz danışsan düzü,
Əyri yol yaşadır milyonu, yüzü,
Bir düzə yer yoxsa necolmalıyam?

Yalana, yaltağa qul olub zaman,
Alimə dərs deyir dilbilməz nadan,
Düşmür quyusuna quyunu qazan,
Əgər nahaq haxsa necolmalıyam?

Fikirləş ay qonşu fikirləş sən də,
Mən necə sevinim belə aləmdə,
Dövranın amansız məngənəsində,
Namərd mərdi sıxsa necolmalıyam?

## ŞAİR DOSTUMA CAVAB

Həvəskar şairlərdən olan bir dostum zəng edərək, təzə yazdığı şerini oxuyacağını bildirdi və bu şer haqda fikrimi bildirməyimi xahiş etdi. Öz xəttini yaxşı oxuya bilmədiyinə görə bir neçə dəfə üzr istəyən şairin şerinin demək olar ki, hər bəndində iradımı bildirdim. Bunu o qədər də xoşlamayan şair tənqid etməyin asan, şer yazmağın isə çox çətin olduğunu, hər adamın, o cümlədən mənim də şairlik qabiliyyətimin olmadığını bildirdi. Dostumun bu fikri ilə razılaşdım və əlavə etdim ki, hər şeir yazan şair deyil, şeir yazmaqla şair olmurlar. Şairlər anadan şair doğulurlar. Şairlik, yaradanın bəzi istəkli bəndələrinə bəxş etdiyi vergidir.

Xudahafizləşəndən sonra aşağıdakı zarafatyana şeri cızma-qara elədim və zəng edərək dostuma oxudum. Şerdə adı çəkilən çoxlu şer növlərini bildiyimə görə təəcüblənən və eyhamımı başa düşən şair ancaq gülməklə kifayətləndi.

Şer adlı o müqəddəs duyğunu,
Bacarmayan bacarandan çox yazır.
Oxutdurur, eşitdirir, göstərir,
İstər baxma, istəyirsən bax, yazır.

Avazla oxuyur təzə şerini,
O yarımçıq, o turşməzə şerini,
Allah gətirməsin gözə şerini,
Tələs, darıx, hövsələdən çıx yazır.

Öz-özünə öyünməsi xətrinə,
Şair kimi görünməsi xətrinə,
Qafiyənin düz gəlməsi xətrinə,
Fərqə varmır. “hə” yerinə “yox” yazır.

Füzuli yazardı ayda bir qəzəl,
Vaqif təriflərdi ildə bir gözəl,
Qağam xətm eləyir gündə beş əsər,
Bəzi vaxt bundan da bir az sıx yazır.

Rübai, qəsidə, qəzəl və qoşma,
Povest, pyes, roman, qitə, poema,
Bayatı, gəraylı, həcv, bağlama,
Bəzən kefsiz olur, bəzən şux yazır.

Qoşayarpaq. təcnis, dram, hekayə,
Müxəmməs, divani, qoşaqafiyə,
Bir saat keçməmiş, yüksəlir göyə,
Çox vaxt ac qarına, bəzən tox yazır.

Faiq müəllim, yaza bilmirsən özün,
Tapmırsan yerini əyrinin, düzün,
Ali hikmətini şerin, sözün,
Şairin əliylə bil ki, haqq yazır.
Haxdan gələn vergi yox isə əgər,
Yazmaq istəyənlər çox nahaq yazır

***Tofiq Hüseynov***

## Qadir olduğunu göstər, qardaşım

***(Elimizin gözəl oğlu
Faiq Həsənova ithaf edirəm)***

Cavanlıq çağından sən yanan oldun,
Pəjmürdə könüllər sən duyan oldun,
Böyüyü, kiçiyi sən sayan oldun,
Ləl, mərcan içində gövhər qardaşım.
Qadir olduğunu göstər, qardaşım.

Qəlbin bir bulaqdır qaynayır, daşır,
Söz-söhbətin uzaq sədləri aşır,
Min tərif desəm də sənə yaraşır,
Pis gözə olmusan xəncər, qardaşım.
Qadir olduğunu göstər, qardaşım.

Səndən uzaq olsun qəm, kədər, bəla,
Qarşına çıxmasın anlamaz qəda,
Başında dolansın məhəbbət, sevda,
Dilinin altında şəkər, qardaşım,
Qadir olduğunu göstər, qardaşım.

Sən dağlar oğlusan çəkmisən zəhmət,
Xalqına ürəkdə çoxdur məhəbbət,
Gedərik Salaha bir də ya qismət,
Qəlbimiz bu dərdi çəkərək, qardaşım.
Qadir olduğunu göstər, qardaşım.

Mənəvi aləmin dərya, ümmandı,
Yazdığın elinə vallah, dərmandı,
Qədir-qiymətini verən zamandı,
Kitabın evləri bəzər qardaşım.
Qadir olduğunu göstər, qardaşım.

Bilmirəm, dərdimiz taparmı nicat,
Düşdük bəlalara bilir el-elat,
Salaha getməyə yoxdur mümkünat,
Kəndimiz yaddaşdan itər, qardaşım,
Qadir olduğunu göstər, qarqardaşım

Göyərçin Salaha oldu vəfadar,
Dağlarda, daşlarda vardır etibar,
Elimiz binədən olub xoşrəftar,
Səsinə səs versin bəşər, qardaşım,
Qadir olduğunu göstər, qardaşım.

Bizə qəddar oldu bu zalım zaman,
Qabaqda iblis var, arxada şeytan,
Arzumuz gülüstan, bəxtimiz xəzan,
Hər kəs əkdiyini biçər qardaşım,
Qadir olduğunu göstər, qardaşım.

Namus, qeyrətimiz ordan əmanət,
İtirmədik onu, çəksək də zillət,
Əməldə həqiqət, işdə ədalət,
Mən bunu sayıram hünər, qardaşım,
Qadir olduğunu göstər, qardaşım.

Vurğunam sazına mən Pəhlivanın
Sərrafı olmusan təmiz vicdanın
Doğru söz deyərək, qəlbən yananın
Yolunda parlasın qəmər, qardaşım,
Qadir olduğunu göstər, qardaşım.

Bilirik atamız, anamız harda,
Özləri məzarda ruhları darda,
Torpağı satdılar hərrac, bazarda
O yerdən almırıq xəbər, qardaşım,
Qadir olduğunu göstər , qardaşım.

Nə böyük ürək var ay qağa səndə,
Yatır çox dastanlar geniş sinəndə,
İstərəm eşidəm yeri düşəndə,
Yaz, yarat getməsin hədər, qardaşım,
Qadir olduğunu göstər, qardaşım.

Sən kimsən, mən kiməm, hamımız birik,
Heyif ki, bizdən də çıxıbdır çürük,
Belə nankorları bizlər bilirik,
Buz üstə yazıya bənzər, qardaşım,
Qadir olduğunu göstər, qardaşım.

Görməsin qəlbimiz kədər, intizar,
Qəlb sevən işlərə olaq səbəbkar,
Xalqıma qoy versin külli-ixtiyar,
Bizdən uzaq olsun xətər, qardaşım,
Qadir olduğunu göstər, qardaşım.

Gəlin gedək kəndə varsa da qismət,
Müqəddəs ruhları edək ziyarət,

Qəbristan əhli ilə edərək söhbət
Ataq qəlbimizdən kədər, qardaşım,
Qadir olduğunu göstər, qardaşım.

Vəfalı olmusan dosta, yoldaşa,
Əlini uzatdın qohum, qardaşa,
Sən gözəl insansan, yüz illər yaşa,
Böyük bir nəsilə çəpər, qardaşım,
Qadir olduğunu göstər, qardaşım.

Görmüşük nanəcib insan dünyada,
Yetiblər bu yolla şöhrətə, ada.
Eşitmək olarmı çatıblar dada,
Əyəsən yonulmaz peysər, qardaşım,
Qadir olduğunu göstər, qardaşım.

Bilirəm, əlində olsa ixtiyar,
Olarsan çörəyə, duza səbəbkar.
Ağsaqqal olasan, verəsən qərar,
Hamıya salasan nəzər, qardaşım,
Qadir olduğunu göstər, qardaşım.

Hüseyinli Tofiqin sözü dərmandı,
Könlümüz narahat, bu nə dövrandı,
Salahın yanğısı Allah, yamandı,
Getməsək o bizdən küsər, qardaşım,
Qadir olduğunu göstər, qardaşım.

## Faiq müəllimə

Qaraqoyunlunun ay igid oğlu,
Düşürmü yadına zil yoxuş yolu,
Daş atıb saldığım o göyəm kolu,
Danalıqdan belə aşmaq vaxtıdır.

Lilparlar, yarpızlar kükrəyib qalxır,
Lalələr nərgizlər boylanıb baxır,
Sellənib qar suyu çaylara axır,
Ağnabada durna gəlmək vaxtıdır.

Yamaclar bürünür çiçəyə, gülə
Quşlar cəh-cəh vurur baxıb bülbülə,
Gözlərimin yaşı dönübdü selə,
Təkənin qənşərə çıxmaq vaxtıdır.

Böyük tayfadansan, hər vaxt oyaqsan,
Doğma Salahıma sanki dayaqsan,
Atan Paşa kimi nursan, mayaqsan,
Hasança bulaqdan içmək vaxtıdır.

Hanı o cah-cəlal, o cənnətməkan,
Gülləri ətirli, çiçəyi loğman,
Ey böyük ilahi, sən ey yaradan,
Əliynən Faiqin dostluq vaxtıdır.

